*Məhəmmədəli Rzayi*

# QURANIN ELMİ ECAZKARLIĞI



# Mündəricat

## QURANIN ELMİ ECAZKARLIĞI

### KİTAB HAQQINDA

Kitabın adı:Quranın elmi ecazkarlığl

Müəllif :Məhəmmədəli Rzayi

Naşir:Şəhriyar

Çap tarixi:۲۰۰۸

Səhifələrin sayı:۲۷۴

Çap növbəsi:Birinci

Tirajı:۳۰۰۰

səh:۱

### ÖN SÖZ

Quran son səmavi müjdədir. Hansı ki, sonuncu Peyğəmbərə (s), yəni həzrət Məhəmmədə (s) göndərilərək bəşəriyyəti nura, kamilliyə doğru hidayət edir. Quran yalnız bir kitab deyil. O, həm də Peyğəmbərin (s) sədaqətini göstərən bir nişanədir. Elə buna görə də Quranın ecazkarlığı İslamın erkən çağlarından müsəlman və qeyri-müsəlmanların diqqətini cəlb etmişdir. Quranın ecazkarlığı fəsahət və bəlağət, dərin məzmun, qeybdən verilən xəbərlər və s. kimi fərqli yönlərə malikdir. Müsəlmanların yunan elmləri ilə (h. II əsrdən başlayan) tanışlığı və hicri IV əsrdə (Əbu Əli Sinanın əsərlərində özünü göstərən) Quranın empirik (təcrübi) elmlərlə uzlaşdırılması "elmi təfsir" adlanan yeni bir təfsir üsulu meydana gətirdi. Son iki əsrdə qərbdə təcrübi elmlərin geniş inkişafı ilə əlaqədar olaraq təfsirin yeni yaranmış bu üsulu da öz inkişaf mərhələlərində sürətlə irəliləməyə başladı. Elmi təfsirlə yanaşı "Quranın elmi ecazkarlığı" adlanan digər tərəfi də üzə çıxdı. Belə ki, bir çox Quran şərhçiləri və digər elm adamları (həkimlər, mühəndislər və s.) bu mövzuda tədqiqata başladılar. Lakin təəssüflər olsun ki, bəziləri mötədilliyi qoruya bilməyib Quranın ۳۰۰ ayəsini təcrübi

elmlərə tətbiq etdilər və bir çox məsələlərdə Quran adına elmi ecazkarlıq iddiası ilə çıxış etdilər. Digərləri isə bunu yanlış və Qurana aid olmayan həqiqət kimi qiymətləndirərək onun elmi ecazkarlığını bütünlüklə rədd etdilər. Biz isə mötədilliyə sadiq qalıb elmi ecazkarlığın doğru tərəflərini qəbul edib, yanlış iddiaları isə rədd .etmək fikrindəyik

**TƏDQİQİN PREDMETİ**

Quranın elmi ecazkarlığı onda mövcud olan o sirlərə deyilir ki, onun nazil olduğu dönəmdə bəşərə məlum olmamış, lakin müxtəlif elmlər inkişaf etdikdən sonra bu sirlərin üstü açılmışdır.

Biz bu kitabda Quran ayələrinin təcrübi elmlərə tətbiq olunmasında mövcud olan iradları üzə çıxarmağı, onun yanlış və doğru tərəflərini incələməyi qarşımıza məqsəd qoymuşuq.

**SUALLAR**

۱. Quranın hansı ayəsi təcrübi elmlərin qəti nailiyyətləri ilə üst-üstə düşür?

۲. Bu uyğunluq hansı surətdə elmi ecazkarlığı isbat edir?

۳. Hansı məsələlərdə elmi versiyalar, ehtimallar Quranın ibtidai, ilkin mənasına qeyri-həqiqi şəkildə aid edilmişdir?

۴. Bu tətbiq Quranın şərhi baxımından hansı iradlara malikdir?

۵. Bəzi ayələrlə elmi nailiyyətlər arasında iddia olunan ziddiyyət doğrudurmu?

**HƏDƏFLƏR**

۱. Quranın elmi ecazkarlığının doğru və məqbul tərəflərini bəyan edib, bu müqəddəs kitabın haqq olduğunu isbat etmək.

۲. Quranın elmi ecazkarlığının yanlış və qeyri-məqbul tərəflərini üzə çıxarmaq.

۳. Quranın şərhi zamanı elmin təsiri altına düşməyin qarşısını almaq.

۴. Elm və Quranın bir-birinə zidd olmasını göstərən iddiaların qarşısını almaq.

## TARİXİ KEÇMİŞ

Elmi təfsirin min ilə yaxın tarixi var (yəni Əbu Əli Sinanın əsərlərindən başlamışdır). Lakin Quranın elmi ecazkarlığı iddiası son iki əsrdə meydana çıxmış, bir çox elmi kəşflər Quranla uyğunlaşdırılmış və bu ilahi kitabın doğruluğunu bir daha isbat .etmişdir

Quranın elmi nailiyyətlərlə uyğunlaşdırılması və elmi təfsirlə bağlı yazılara bir çox kitablarda rast gəlirik. Biz bu kitabları sonda, "İstifadə olunmuş ədəbiyyat" bölümündə qeyd edəcəyik. Sözügedən kitabları nəzərdən keçirərkən Quranın elmi ecazkarlığı ilə bağlı olan bütün ayələri toplayıb incələyən tam əhatəli bir əsər tapa bilmədik və buna görə də elmi ictimaiyyət tərəfindən yüksək qiymətləndirilən qarşınızdakı kitabı qələmə .alıb, daha sonra isə bir cilddə xülasə etdik

.Qum, Məhəmməd Əli Rzayi İsfahani, ۱۳۸۳. ۶. ۱۶

## BİRİNCİ FƏSİL:ÜMUMİ BƏHSLƏR

### GİRİŞ

Quranın elmi ecazkarlığını, onun təcrübi elmlərlə uyğunlaşdırılmasını, başqa sözlə desək, elmi təfsir hesab olunmasını nəzərə alıb birinci fəsildə elmi təfsirə, kitab boyunca qarşılaşacağımız termin və məfhumlarla bağlı bir sıra ümumi məsələlərə, .möcüzə və elmi ecazkarlığa aydınlıq gətirməyi məqsədəuyğun hesab edirik

### ELMİ TƏFSİR" TERMİNİ HAQQINDA"

(Quranın təcrübi elmlərlə uyğunlaşdırılması)

Təfsir bir şeyin üzərindən pərdəni, örtüyü götürmək mənasını ifadə edir. Bu söz Quran haqqında işlədildikdə isə onun sözlərindəki anlaşılmazlıqları aydınlaşdırmaq, bu və ya .digər ayənin məna və məqsədlərini aşkara çıxarmaq, izah etmək nəzərdə tutulur

Elmdən məqsəd isə burada təcrübi (empirik) elmlərdir. Hansı ki, təbiətə hakim olan qanunauyğunluqların və nəzəriyyələrin yanlışlığını və ya doğruluğunu təcrübə yolu ilə müəyyən edir. Deməli, elmi təfsirdən məqsəd Quran ayələrinin təcrübi elmlərin .vasitəsi ilə izah olunmasıdır

səh:۴

## ELMİ TƏFSİRİN TARİXİ KEÇMİŞİ

(ELMİ TƏFSİR(١)

Quranın təcrübi elmlərlə uyğunlaşdırılması hicri II əsrdən başladı və çox keçmədən uğurlu təfsir üsulu kimi öz yerini tutdu. Belə ki, bir çox quranşünaslar, Quran şərhçiləri, filosoflar, mütəkəllimlər (sxolastiklər) və hədisşünaslar məlum metoddan istifadə etməyə başladılar.(٢) Son bir əsrdə İslam cəmiyyətlərində bu metoda geniş yer verilmişdir. Belə ki, əksər ziyalılar, təfsirçilər, hətta təcrübi elmlərlə məşğul olan mütəxəssislər Quran ayələrini təcrübi elmlərlə izah etməyə, açıqlamağa və Quranın elmi ecazkarlığını isbat etməyə başladılar. Əlbəttə, yuxarıda qeyd olunan zümrələrin .hər biri məlum elmi fəaliyyətdən özünəməxsus məqsəd güdürdü

Bu elmi metodun müsəlmanlar arasında geniş yayılmasının səbəblərini ixtisarla .aşağıdakı şəkildə sadalamaq olar

Quranın elmə xüsusi diqqət yetirməsi, elmi misallar göstərməsi, Allahın səmada, . ١ Yerdə və insanın özündə mövcud olan aydın nişanələri haqqında düşünməyə sövq etməsi elmlərin inkişafına və Quran ayələri ilə müqayisə olunmasına gətirib .çıxarmışdır

Fəlsəfə və təbiətşünaslıq elmlərinin (II əsrdən başlayaraq) yunan və fars dillərindən .٢ .ərəb dilinə tərcümə olunaraq müsəlmanlar arasında yayılması



---

Qərbdə elmi təfsirin tarixi", "İslamda elmi təfsirin tarixi" və "Elmi təfsirin son iki"[١] -١ əsrdə inkişafının səbəbləri" haqqında ətraflı məlumat əldə etmək üçün bax: "Pəjuheşi .dər ecaze-elmiye-Quran", c. ١, səh. ٢٣-٣٣

Quranın təcrübi elmlərlə uyğunlaşdırılmasının tarixi haqqında ətraflı məlumat[٢] -٢ .üçün bax: "Dəramədi bər təfsiri-elmiye-Quran", "Üsvə" nəşriyyatı, ١٣۶۵ il

.Bütün elmlərin Quranda mövcud olması və ayələrdən çıxarılması təfəkkürü .٣

Quranın elmi ecazkarlığının isbatı üçün təbiətşünaslıq elmlərinə və yeni kəşflərə .٤ .diqqət də elmi təfsirin inkişafına böyük təkan verdi

Avropada sensualist təfəkkürün qələbəsi, onun müsəlmanlara təsiri, təmayülçü .٥ qruplaşmaların meydana gəlməsi də Quran ayələrinin (elmi kəşflərə) tətbiq .olunmasına, yozulmasına gətirib çıxartdı

Müsəlman alimləri qərbin dinə hücumunun, din və elmin ziddiyyəti təfəkkürünün .٦ təbliğinin qarşısını almaq məqsədi ilə Quran və təcrübi elmlərin üst-üstə düşməsi .fikrini öz əsərlərində önə çəkməyə başladılar

Bir çox təfsirçilər, Quranşünaslar, təcrübi elmlər üzrə mütəxəssisləri məlum .٧ .elmlərdən istifadə edərək Quranın ecazkarlığını isbat etməyə çalışdılar

**?BÜTÜN ELMLƏR QURANDA MÖVCUDDURMU**

Bu məsələ ilə bağlı üç əsas baxış mövcuddur. Aşağıda bu üç versiyanı və onların .dəlillərini ixtisarla nəzərdən keçirək

.Birinci versiya:Bütün elmlər Quranda mövcuddur

Bu versiyaya ilk dəfə olaraq Əbu Hamid Qəzalinin (vəfat- ٥٠٥ h.q.) “Ehya əl-ülum” və “Cəvahir əl-Quran” əsərlərində rast gəlirik. O, bütün elmlərin Qurandan çıxarılmasının .(mümkün olduğunu göstərməyə çalışmışdır(١

Bundan sonra Seyid Əbu əl-Fəzl əl-Mursi (٥٧٠-٦٥٥ h.q.) qələmə aldığı təfsir əsərində eyni nəzəriyyəni ifrat



.Ehya əl-ülum”, c. ١, səh. ٢٨٩“[٣] -١

şəkildə qəbul edərək yazır: “Bəşəriyyətə məlum olan və olmayan bütün elmlər Quranda mövcuddur”(١).

İkinci versiya: Quran yalnız hidayət və din kitabıdır. O, təcrübi elmlərlə bağlı məsələlərə aydınlıq gətirmək üçün göndərilməmişdir. Misal üçün, Qəzali və əl-Mursinin irəli sürdüyü fikrə ilk etiraz edən Əbu İshaq Şatibi yazır:

“Quran axirət və onun haqqındakı əlavə məsələlərə aydınlıq gətirmək üçün göndərilmişdir”(٢).

“Məcmə əl-bəyan” və “Kəşşaf” təfsirlərinin müəllifləri yazırlar: “Quranda hər şeyin açıqlanmasından məqsəd din və hidayətlə bağlı hər bir şeyin açıqlanmasıdır”(٣).

Üçüncü versiya: Ayırıcı baxış. Bu baxışa görə, bir tərəfdən bütün elmlər Quranda yoxdur. Quranın başlıca məqsədi bəşəriyyəti Allaha doğru hidayət etməkdir. Digər tərəfdən isə Quran insanları təfəkkürə, elmə dəvət edir və bir çox doğru elmi misallar göstərir. Hansı ki, bu elmi misallar Quranın elmi ecazkarlığını əks etdirir.

YEKUN

Yuxarıda qeyd edilən hər üç versiyanı araşdırdıqda belə bir nəticə əldə edirik ki, Quranın ilkin, ibtidai mənası bütün bəşər elmlərini (bütün formullarla, xırdalıqlarla) əks etdirmir. Bəli, Quranda söz gəlişi bir çox elmi məsələlərə toxunulmuşdur. Lakin bütün elmlər aktual (bil-fel) olaraq öz əksini tapmamışdır. Bu mövzu ilə bağlı ayələr isə (Nəhl, ٨٩; Ənam, ٣٨, ٥٩) bəşəriyyətin din və hidayətlə



---

١- [٤]Bax: “Ət-Təfsir və əl-müfəssirun”, c. ٢, səh. ٤٧٨-٤٨٢.

٢- [٥]“Əl-Müvafiqə”, c. ٢, səh ٧٦-٧٩. “Ət-Təfsir və əl-müfəssirun” əsərindən sitat gətirilmişdir, c. ٢, səh. ٤٨٥.

٣- [٦]“Təbərsi, “Məcmə əl-bəyan”, c. ٤, səh. ٢٨٩; Zəməxşəri, “Kəşşaf”, c. ٢, ٦٢٨.

əlaqəli bütün ehtiyaclarının geniş və ya ötəri şəkildə Quranda mövcud olduğunu önə .çəkir

?Sual: Allah-taala elmi məsələləri Quranda hansı məqsədlə bəyan etmişdir

Quranın ilkin zahiri mənaları bəzən ilahi nişanələrin tanınması və varlığın başlanğıcı .١ .ilə bağlıdır

إِنَّ فِی خَلْقِ السَّمَاوَاتِ وَالأَرْضِ وَاخْتِلاَفِ اللَّیْلِ وَالنَّهَار لآیَاتٍ لِّأُوْلِی الألْبَابِ

Həqiqətən, göylərin və Yerin yaradılmasında, gecə ilə gündüzün bir-birini əvəz“ etməsində ağıl sahibləri üçün (Allahın varlığını, qüdrətini və əzəmətini sübut edən açıq) .(dəlillər vardır” (١)

Bəzən Quranın elmi ayələri həmin elmi məsələnin əzəmətinin göstəricisidir. Yəni o .٢ barədə bu və ya digər elmi məsələnin əhəmiyyətini göstərmək məqsədi ilə söhbət .açır. Misal üçün, Quranda Günəşə, Aya and içilməsi(٢) bu qəbildəndir

Bəzən Quranın elmi ayələri məadı isbat etmək üçün qeyd olunur. Misal üçün, . ٣ :buyurur

خُلِقَ مِن مَّاء دَافِقٍ یَخْرُجُ مِن بَیْنِ الصُّلْبِ وَالتَّرَائِبِ إِنَّهُ عَلَى رَجْعِهِ لَقَادِرٌ فَلْیَنظُرِ الْإِنسَانُ مِمَّ خُلِقَ

Elə isə insan nədən yaradıldığına bir baxsın! O, axıb tökülən bir sudan (nütfədən)“ yaradılmışdır. (Hansı ki,) bel



---

.Ali-İmran”, ١٩٠“[٧] -١
.Şəms, ١-dən sonrakı ayələr[٨] -٢

sümüyü ilə köks arasından çıxar! Həqiqətən, (Allah) insanı (öləndən sonra) yenidən (diriltməyə qadirdir!” (١)

Belə də demək olar ki, Quranın bir başlıca, ümdə məqsədi var. Bu, insanı kamilliyin .۴ zirvəsinə ucaltmaqdır. Bundan başqa digər məqsədləri isə həmin ümdə məqsədə xidmət edir. Bu məqsədlərə misal olaraq məadın, nübuvvətin, Quranın özünün ecazkarlığının isbat edilməsini və s. göstərmək olar. Bütün bunlar hamısı vəhyin bəşəriyyət tərəfindən qəbul olunması üçün bir müqəddimədir. Deməli, elmi məsələlər Quranın məqsədləri sırasındadır. Çünki Quranın ecazkarlığını isbat edir. Lakin bu, Quranın başlıca məqsədi deyil. Quran ayələrinə daha dəqiq yanaşsaq görərik ki, bütün şeylərin Quranda mövcud olduğunu bəyan edən ayələr hamısı hidayət və din haqqındadır. Demək, burada ümdə məqsəd insanların hidayəti və din maarifinin bəyan edilməsidir. Dinlə bağlı məsələlərdən biri də Quranın ecazkarlığının sübuta yetirilməsi, həmin ecazkarlığın bir yönü isə elmi ecazkarlıqdır. Elə buna görə də Quranın elmi məsələləri açıqlaması özü onun məqsədlərindən biridir. Lakin öncə də qeyd etdiyimiz .kimi başlıca hədəf deyil

## QURANIN ELMİ MƏSƏLƏLƏRİNİN MÜSƏLMANLARIN İNKİŞAFINDA ROLU

Quranda həqiqi elmi misalların mövcudluğu bəşəriyyətin marağını artırmış, səmanın, .١ insanın və digər varlıqların yaradılışındakı qəribəliklər haqqında düşünməyə vadar etmiş və diqqəti təbiətin hələ tanınmamış qüvvələrinə yönəltmişdir. Yəni Quranın ən mühüm funksiyalarından biri də insan zehnində sual



---

.Tariq”, ۵-۸“ [۹] -١

yaratmaqdır. Çünki insanda sual yaranmadıqda o, öyrənməyə maraq göstərmir. Sual yaranmadığı təqdirdə o hər şeyi bildiyini düşünür və cəhalət dairəsindən çıxa bilmir. Quran kəhkəşanlar və s. varlıqların öyrənilməyən tərəflərini böyük göstərir və təbiət haqqında düşünməyə dəvət edir. Bu, elmlərin və sənayenin inkişafına təkan verir. Həmin məsələ İslam mədəniyyətinin erkən çağlarında inkişafa, daha dəqiq desək, .(müsəlman cəmiyyətlərində elmi sıçrayışa gətirib çıxartdı(١

İslamın və Quranın elmə diqqəti bir çox elmlərin meydana gəlməsinə səbəb oldu. .٢ Bütün elmlərin xırdalıqlarına qədər Quranda olmamasına baxmayaraq, bir çox elmlər ondan ilham aldı və elmi inkişafı sürətləndirdi. Misal üçün, İslamın səmalara, Günəşin hərəkətinə, ulduzlara və s. planetlərə diqqət yetirməsi astronomiyanın müsəlmanlar arasında sürətlə inkişaf etməsinə səbəb oldu. Əlbəttə, qiblənin təyin olunması və s. bu .kimi məsələlər də bu inkişafa öz təsirini göstərmişdir

Qeyd: Quranın elmi məsələlərini sadə misallar həddinə endirmək insafsızlıqdır. Çünki misal məsələnin sadələşdirilməsi məqsədi daşıyır və bir çox hallarda həqiqətə uyğun olmur. Lakin Quranın elmi misalları kəşf edilməmiş həqiqətlərdən ibarətdir. Hansı ki, əsrlər sonra elm adamlarında təəccüb doğurur və Quranın elmi ecazkarlığını sübuta .yetirir

Quran bir məsələni aydınlaşdırmaq üçün elmi misal göstərmiş və təsadüfən düz“ çıxmışdır” demək sadəlövhlükdür. Bundan başqa, elmi məsələlər Quranın ecazkarlığını .sübuta yetirdiyi üçün misal səviyyəsindən daha yüksəkdə durur



---

.Sərəfrazi, “Elm və dinin əlaqəsi”, səh. ۴٣ [١٠] -١

## QURANIN ELMİ MƏSƏLLƏRLƏ UYĞUNLAŞDIRILMA METODUNUN QİSİMLƏRİ

Elmi təfsir öz daxilində fərqli üsullara yer verən bir təfsir metodudur. Həmin üsulların bəzisi şəxsi rəyə əsaslandığı üçün mötəbər hesab edilmədiyi bir halda bəzi qisimləri mötəbər və doğru üsul hesab edilir. Bu, bir çoxlarının elmi təfsiri bütünlüklə rədd etmələrinə, onu şəxsi rəyə əsaslanan təfsir və ya yozum adlandırmalarına, digərlərinin isə qəbul edərək Quranın ecazkarlığının sübutu kimi dəyərləndirmələrinə səbəb olmuşdur. Biz burada elmi təfsirin üsullarını oxucuların diqqətinə çatdırır və hər .biri haqqında ayrı-ayrılıqda söhbət açırıq ki, yanlışı ilə doğrusu bir-birindən ayrılsın

:Bütün elmlərin Qurandan çıxarılması.١

Keçmiş alimlər (Əbu əl-Fəzl əl-Mursi, Qəzali və başqaları) bütün elmləri Qurandan .çıxarmağa səy göstərmişlər. Lakin bu iddia əsassızdır

:Elmi nəzəriyyələrin əsassız olaraq Qurana aid edilməsi .٢

Elmi təfsirin bu üsulu son bir əsrdə geniş yayılmışdır. Bir çoxları elmi qanunların, nəzəriyyələrin son həqiqət olduğunu güman edərək onlara uyğun Quran ayəsi tapmağa, belə bir ayə tapmadıqda isə ayələrin mənalarını yozaraq ibtidai mənalarının tam əksinə izah etməyə çalışmışlar. Misal üçün, bu ayədə ( هُوَ الَّذِى خَلَقَكُم مِّن نَّفْسٍ وَاحِدَهٍ وَجَعَلَ مِنْهَـا زَوْجَهَـا ) “Sizi tək bir nəfərdən xəlq edən və ondan zövcəsini yaradan Odur”(١) sözügedən “nəfs” və



---

.Ə`raf, ١٨٩ [١١]-١

zövc” sözlərini atom nüvəsinin tərkibinə daxil olan müsbət və mənfi elektrik yüklü“ hissəciklər kimi izah etmişlər. Onların qənaətincə Quranın məlum ayədən məqsədi hamının atom nüvəsinin müsbət və mənfi zərrəcikləri olan proton və elektronlardan yaradılmasıdır. Bu izahda “nəfs” sözünün leksik və terminoloji mənası belə nəzərə .(alınmamışdır(١

Bu növ elmi təfsir son bir əsrdə Misir və İranda geniş yayılmış və bir çox İslam alimində elmi təfsirə qarşı mənfi təəssürat, pessimist fikir oyatmışdır. Buna görə də elmi təfsiri elmi nəzəriyyələrin əsassız olaraq Qurana aid edilməsi kimi dəyərləndirərək onu .(bütövlükdə rədd etmişlər. Əllamə Təbatəbai bu qənaətdə olan alimlərdəndir(٢

## QURANIN DAHA YAXŞI BAŞA DÜŞÜLMƏSİ ÜÇÜN MÜXTƏLİF ELMLƏRDƏN İSTİFADƏ OLUNMASI

Elmi təfsirin bu üsulunda Quran, lazımi şərtlərin mövcudluğu nəzərə alınıb, mötəbər təfsirin qaydalarına riayət olunaraq izah edilir. Burada Quran şərhçisi onu (ağıla əsaslanan) qəti elmi nailiyyətlərə, ayələrin hərfi və terminoloji baxımdan ibtidai mənasına əsaslanaraq elmi şəkildə izah etməyə çalışır və Quranın aydın olmayan tərəflərini üzə çıxarıb həqiqət sorağında olanların ixtiyarına verir. Elmi təfsirin bu üsulu ən yaxşı, ən düzgün təfsir üsuludur. Biz növbəti bəhslərimizdə bu növ təfsir haqqında ətraflı söhbət açacağıq. Lakin burada bir daha



---

.Əl-Quran və elm əl-hədis”, səh. ١٥۶“ [١٢]-١

.Bax: “Təfsir əl-mizan”, c. ١, səh. ۶[١٣]-٢

təkid edirik ki, sözügedən üsul hər növ şəxsi rəyə əsaslanmadan və müxtəlif əsassız yozmalardan uzaq olmalıdır. Bu zaman gəldiyin qənaəti yalnız ehtimal şəklində irəli sürə bilərsən. Çünki təcrübi elmlər, empirik təbiətşünaslıq sırf ehtimallara, natamam induksiyaya əsaslandığından dəqiq, tam düzgün nəzəriyyə irəli sürə bilmir. Misal üçün, .aşağıdakı ayəyə nəzər salaq

Günəş də (qüdrət əlamətlərimizdən biri kimi) özü üçün müəyyən“ وَالشَّمْسُ تَجْرِی لِمُسْتَقَرٍّ لَّهَا .(olunmuş yerdə seyr edər”(١)

İslamın erkən çağlarında bu ayə nazil olduqda insanlar Günəşin yalnız Yerdəki müşahidəçi tərəfindən gözlə görülən hərəkətini hiss edir və ayəni də belə anlayırdılar. Halbuki Günəşin şərqdən qərbə doğru hərəkəti aldadıcıdır. Bu bizim görmə hissimizin yanılmasıdır. Əslində Yer hərəkət edir. Biz isə Günəşin hərəkət etdiyini görürük. Bu, qatara minmiş yolçunun yol kənarındakı evlərin hərəkət etdiyini görməsinə bənzəyir. Lakin elm inkişaf etdikcə, Yer kürəsinin və Günəşin hərəkət etdiyi kəşf olduqda məlum oldu ki, Günəş özü də müəyyən orbit üzrə (çevrə, sfera) hərəkət edir (bu aldadıcı deyil, həqiqi hərəkətdir). Nəinki Günəş, hətta bütöv Günəş sistemi, Ağ yol qalaktikası (Süd yolu qalaktikası) da daim hərəkətdədir. Kəhkəşanlar, ulduzlar son dərəcə heyrət doğuran bir sürətlə biri-birindən uzaqlaşır və gerçəklik genişlənir(٢). Deməli, əgər qəti şəkildə Günəşin hərəkət etdiyi sübuta yetərsə, o zaman Quran ayəsinin ilkin zahiri mənasından



---

١- [١۴] “Yasin”, ٣٨.

٢- [١۵] “Yeni fizika”, səh. ۴۵-۴٨.

.(da məqsədin həmin həqiqi yerdəyişici hərəkət olduğu anlaşılar(١

Bu arada elmi təfsirin məlum növü vasitəsi ilə Quranın elmi ecazkarlığı da sübuta yetir. Misal üçün, təbiətşünaslıqda bitkilərin cütlüyü (erkəkcik və dişiciklərdən ibarət olması) XVII əsrdə kəşf edilmişdir. Lakin Quran təqribən ondan on əsr öncə bütün bitkilərin .(erkəkcik və dişiciklərdən ibarət olduğu haqda söhbət açmışdır(٢

## ?MÖTƏBƏR ELMİ TƏFSİRİN MEYARLARI HANSILARDIR

Ötən bəhslərdən göründüyü kimi biz elmi təfsirin üç üsulundan yalnız birini (Quranın daha yaxşı başa düşülməsi üçün müxtəlif elmlərdən istifadə olunmasını) qəbul etdik və empirik elmlərin müddəalarının sırf ehtimal olduğu haqqında söhbət açdıq. İndi isə təfsirçinin (Quran şərhçisinin) və mötəbər, düzgün təfsirin şərtlərinə nəzərən aşağıdakı meyarları elmi təfsirin dolğun, mötəbər təfsir olması üçün zəruri hesab :edirik

Elmi təfsir elə bir təfsirçi tərəfindən həyata keçirilməlidir ki, o, təfsirçi üçün nəzərdə .١ tutulan lazımi şərtləri özündə toplamış olsun. Təfsirçi ərəb ədəbiyyatı, ayələrin nazil olma səbəbləri, ayələrlə bağlı tarixi faktlar, quranşünaslıq, hədisşünaslıq və üsul elmləri ilə tanış olmalı, fəlsəfi, elmi, ictimai (sosioloji), əxlaqi (etik) baxışlardan xəbərdar olmalı, hər cür öngörənlikdən, tətbiq



---

.Gələcək fəsillərdə bu haqda geniş söhbət açacağıq [١۶]-١

.Yasin", ٣۶" [١۶]-٢

və təhmildən uzaq olmalı, təfsir elminə dərindən yiyələnməli, amma təfsirçiləri təqlid etməməlidir(١).

٢. Təfsir edərkən mötəbər təfsirin meyarlarına riayət olunmalıdır. Həmin meyarlara misal olaraq aşağıdakıları göstərmək olar:

Düzgün təfsir üslubuna uyğun təfsir etmək, doğruluğu sübuta yetmiş hədislə ziddiyyət təşkil etməmək, qeyri-zəruri öngörənliklərə yol verməmək, təfsirin digər ayələrə və ya sağlam əqlinəticələrə qarşı çıxmamaq, münasib və doğru qaynaqlardan bəhrələnmək və s.(٢).

٣. Elmi təfsir qəti elmi müddəalara əsaslanmalıdır (yəni əsaslandığı elmi müddəalar yalnız təcrübə deyil, əqli dəlillərlə də təsdiqlənməlidir). Təcrübi elmlər sonradan sübuta ehtiyacı olan yalnız ehtimal olunan müddəalar, hipotezlər əmələ gətirir. Çünki burada yalnız natamam induksiya əsas götürülərək ümumiləşdirilsə də qarşı tərəfin ehtimalını sıfra endirmir və elə buna görə də burada qəti əqlinəticədən söhbət gedə bilməz. Son elmi nəzəriyyəyə görə ümumiyyətlə elmi qanun yoxdur. Sadəcə faydalı nəzəriyyə və hipotezlər (fərziyyələr) mövcuddur. Buna görə də elmi müddəalarla bağlı bir neçə ehtimal irəli sürülür;

Birinci ehtimal: Tam mənada yəqinə səbəb olan elmi müddəa xarici aləmlə tam şəkildə müvafiqdir. Çünki burada elmi təcrübə əqli dəlillərlə təsdiq olunur (və yaxud hiss etmə baxımından aksiomik şəkil alır).

İkinci ehtimal: Elmi müddəa geniş mənada yəqinə səbəb olur. Lakin qarşı tərəfin ehtimalını sıfra endirmir. Təcrübi elmlərdə öz həllini tapmış əksər elmi müddəalar, teoremlər bu qəbildəndir.



---

١- [١٨] Bax: “Dəramədi bər təfsire-elmiye-Quran”, səh. ١٨٥-٢٠٥.

٢- [١٩] Yenə orada.

Üçüncü ehtimal: Elmi müddəa yalnız bir güman, ehtimal şəklində qoyulur; lakin hələ sübuta yetirilmir.

Deməli, birinci ehtimalda elmi təfsir doğrudur. Çünki Quran bitkin əqlinəticələrə qarşı deyil. İkinci ehtimalda elmi təfsir bir ehtimal, versiya şəklində önə çıxarılsa, doğru və icazəlidir. Misal üçün, təfsirçi deyir: Quranın ilkin zahiri mənası Günəşin öz orbiti üzrə hərəkəti ilə uyğun gəlir. Çox güman ki, ayədə məqsəd həmin hərəkətdir.

Üçüncü ehtimalda da təfsir düzgün deyil. Çünki burada elmi təfsirə qarşı çıxanların tutduqları iradlarla qarşılaşırıq.

## QURANIN TƏCRÜBİ ELMLƏRLƏ UYĞUNLAŞDIRILMASININ MÜSBƏT TƏSİRLƏRİ HANSILARDIR?

Elmi təfsirin tərəfdarları bu növ təfsirin müsbət təsirləri haqqındada ətraflı söhbət açmışlar. Biz bu təsirləri (faydaları) ixtisarla diqqətinizə çatdırırıq:

١. Quranın elmi ecazkarlığının isbatı. Bu isə iki mühüm nəticə verir:

a) Qeyri-müsəlmanların İslama dəvət olunmasında üzərimizə düşən məsuliyyət götürülür və onlarda İslama qarşı rəğbət oyadır. Çünki Quran (digər müqəddəs kitablardan fərqli olaraq) nəinki elmə qarşı deyil, hətta bəşəriyyətə çox mühüm elmi məsələlər bəxş etmişdir.

b) Müsəlmanların Qurana, peyğəmbərliyə və İslamın haqq olduğuna imanını artırır, gücləndirir.

٢. Quran ayələrinin elmi izahı. Çünki elmi təfsir də təfsir metodlarından biridir və bu olmadıqda təfsir natamam qalacaqdır.

٣. Elm və dinin ziddiyyəti məfkurəsinin qarşısı alınması. Çünki Quranın ehtiva etdiyi elmi məsələlər üzə

çıxdıqda bütün insaflı düşüncə sahibləri İslamın elmə yalnız adekvat olduğu deyil, həm .də onu təsdiq etdiyinin şahidi olacaqlar

Bizim Quranı daha dərindən anlamağımız və Quranın məna çalarlarının . ۴ .genişlənməsi

Qeyd: Qeyd olunan müsbət nəticələr əksər hallarda elmi təfsirin üçüncü qisminə .aiddir

## QURANIN TƏCRÜBİ ELMLƏRLƏ UYĞUNLAŞDIRILMASININ MƏNFİ TƏSİRLƏRİ ?HANSILARDIR

Elmi təfsirə qarşı radikal mövqedə olanlar bu metodun mənfi nəticələrini aşağıdakı :şəkildə sıralamışlar

Təfsirin bu metodu şəxsi rəyə əsaslanır. Şəxsi rəyə əsaslanan təfsir isə dində yasaq.۱ .edilmişdir

.Elmi təfsir icazəli olmayan yozumlarla nəticələnir .۲

.Ayələrin həqiqi (müstəqim) mənaları məcazi mənalar kimi göstərilir .۳

.Elmi təfsir Quranın digərlərinə ehtiyaclı olduğunu etirafdır .۴

.Elmi nəzəriyyələrin əsassız olaraq Qurana aid edilməsinə yol açır .۵

İnsanlarda Quranın səhih olduğuna dair şübhə oyadır. Çünki elmi teoremlər . ۶ dəyişkəndir. Müəyyən zaman keçdikdən sonra dəyişir və öncə Quranın ilkin mənası ilə müvafiq olan elmi nəzəriyyə sonradan onunla ziddiyyət təşkil edir. Nəticədə isə .Quranın səhih, doğru olduğu şübhə doğurur

Elmi təfsir Quranın başlıca məqsədinin (insanın tərbiyə olunması, Allaha doğru . ۷ .hidayət) unudulmasına yol açır

səh:۱۷

Ola bilər ki, müsəlman millətlər məlum elmi izahlara arxalanıb yeni elmlərin ardınca .۸ getməsinlər. Nəticədə isə digərlərinə möhtac olsunlar.

.Elmi təfsir Quranın bədii ecazkarlığına zərər vurur .۹

Elmi təfsir materializmə xidmət edir və bu tipli cərəyanların isbatı üçün istifadə .۱۰ olunur.

.Yanlış versiyalar, elmi ziddiyyətlər Qurana yol tapır .۱۱

.Quran elmlərə tabe olur. Bir halda ki, elmlər yanlışlıqlarla əhatə olunmuşdur .۱۲

.Elmi təfsir Quranın məqsədlərinin yanlış anlaşılmasına səbəb olur .۱۳

.Təfsirçini Quranın sırf ərəb dilində düşünülməsindən uzaq salır .۱۴

Qeyd: Elmi təfsirə qarşı sərt mövqedə olanların dəlillərinə nəzər saldıqda bütün bunların yalnız elmi təfsirin birinci və ikinci qisminə aid olduğu anlaşılır. Üçüncü qisim isə sözügedən nəticələrdən kənardır.

## ?MÖCÜZƏ NƏDİR

Qurani-kərim “Ayə”(۱), “Bəyyinə”(۲), “Bürhan”(۳), “Sultan”(۴) ifadələrini peyğəmbərlərin (ə) möcüzələri, misli görünməmiş xariqüladə işləri haqqında işlətmişdir. Quranda möcüzə sözündən istifadə olunmasa da bu söz peyğəmbərlərin (ə) xariqüladə işləri haqqında ən geniş yayılmış ifadədir.



---

.Əraf, ۷۳ [۲۰] -۱
.İbrahim, ۹ [۲۱] -۲
.Nisa, ۱۷۴ [۲۲] -۳
.İbrahim, ۱۱ [۲۳] -۴

Möcüzəyə tərif verərkən deyilir ki, möcüzə bir termin kimi peyğəmbərliyin isbatı üçün həyata keçirilən xariqüladə hadisədir. Bu təriflə yanaşı iki şərti yaddan çıxarmaq lazım deyil. Möcüzə iddiaya uyğun olmalı və digərləri eyni möcüzəni göstərməkdə aciz olmalıdırlar. Bütün bunlara baxmayaraq, möcüzə əqlin çıxardığı nəticələrlə, səbəbiyyət (qanunu ilə heç bir ziddiyyət təşkil etmir“(١)

Quran İslam peyğəmbərinin (s) əbədi möcüzəsi, onun haqq yolunun canlı dəlilidir. Quran zəmanəmizə gəlib çıxan yeganə möcüzədir. O, İslamın sədaqətinin .həmişəyaşar şahidi, insanların hidayətçisidir

## ?QURAN HANSI BAXIMDAN MÖCÜZƏDİR

### ?QURANIN BƏNZƏRSİZLİYİNİN SİRRİ NƏDƏDİR

Bu haqda əsrlər boyu müxtəlif versiyalar irəli sürülmüşdür. Həmin versiyaları on iki :ehtimal şəklində ixtisarla diqqətinizə çatdırırıq

;(Fəsahət və bəlağət (bədii sintaksis, üslubiyyat (١

;Quranın özünəməxsus ahəngdarlığı (٢

;Quranın özünəməxsus cazibədarlığı (٣

;Dərin ilahi maarifin heç bir təhsil almamış fərd tərəfindən önə çıxarılması (۴

;Quranın möhkəm, qəti qanunları (۵

;(Quranın tutarlı arqumentləri (güclü məntiqi (۶

;Keçmiş və gələcək haqqında qeybdən verilən xəbərlər (٧

;(Quranda yaradılışın sirləri (elmi ecazkarlıq (٨

;Təzadsızlıq (٩



---

.Tarix və ülum əl-Quran", səh. ٨٨; Əllamə Təbatəbai, "əl-Mizan", c[٢۴] -١

;İctimai inqilab yaratması (۱۰

;(Sərfə(۱ (۱۱

Bütün bunlar hamısı ("sərfə"ni çıxmaq şərti ilə) Quranın ecazkarlıq nümunələridir. (۱۲
Bütün bunlar hamısı Quranın ecazkarlığının yönləridir. Bunlardan yalnız "sərfə" .möcüzə deyil və yanlış fikirdir

Bizim qəbul etdiyimiz on ikinci baxış keçmişdə və hazırkı dövrdə bir çox alimlər tərəfindən qəbul edilmiş və özünəməxsus şəkildə izah olunmuşdur. Burada bir neçə :alimin fikirlərinə nəzər salaq

Əllamə Təbatəbai və Ayətullah Mərifətin sözlərinə görə Quranın bütün yönləri . ۱ möcüzədir. Lakin bu dinləyicilərə görə fərqlənir. Misal üçün, Quran ədiblər üçün bədii möcüzə, siyasətçilər üçün siyasi möcüzədir. Bu nəzəriyyəyə görə Quranın ecazkarlığı .(bütün dövrlərdə bütün insanları əhatə edir(۲

:Ala ər-Rəhman" təfsir əsərinin müəllifi Şeyx Məhəmməd Cavad Bəlaği yazır" .۲

Ərəblər və digər xalqlar üçün Quranın ecazkarlığının başqa tərəfləri də (qeybdən" .(verilən xəbərlər və s.) mövcuddur(۳

Ayətullah Xoyi də bütün bu tərəfləri Quranın ecazkarlığı kimi dəyərləndirir. Lakin .۳ .(onları ərəbə, əcəmə, ixtisas sahiblərinə məxsus etmir(۴



---

Bəzilərinə görə Quran həm də o baxımdan möcüzədir ki, Allah onun mislini[۲۵] -۱ yazmağa icazə vermir. Yəni öz müxaliflərindən bu imkanı almışdır. Əlbəttə, bu baxış .yanlışdır

.Əl-Mizan", c. ۱, səh. ۵۷-۶۷; "Ət-Təmhid", c. ۴, səh. ۲۳, ۱۳۴"[۲۶] -۲

.Ət-Təmhid", c. ۴, səh. ۱۸۰"[۲۷] -۳

.Əl-Bəyan", səh. ۴۳-۹۱"[۲۸] -۴

Nə üçün on dörd əsr keçməsinə baxmayaraq heç kim Quranın iddiasına cavab olaraq bir surə belə gətirə bilməyib? Bu acizliyin, bacarıqsızlığın sirri nədədir? İnsanlar ərəb dilini bilmirlərmi, yoxsa onu öyrənməkdə acizdirlərmi? Bəşərin elmi kifayət deyilmi? Bu qalmaqallı sual bir çox mütəfəkkirlərin "sərfə" nəzəriyyəsini qəbul etmələrinə gətirib çıxarmışdır. Sözügedən suala aşağıdakı şəkildə cavab vermək olar. Quran müxtəlif yönlərdən möcüzə olan bir kitabdır. O, məhdud sözlərdən, zəngin ifadələrdən ibarətdir. Quran ayələri sadə ərəb dilində, lakin son dərəcə bədii üslubda verilmişdir. Quran da digər bütün kitablar kimi üç ünsürdən – söz, məna və onların arasındakı ahəngdarlıqdan təşkil olunmuşdur. Deməli, ona bənzər bir kitab yazmaq istəyən kimsə .ən azı üç şeyə yiyələnmişdir

Bütün sözləri, ifadələri, isim və felləri bilməlidir ki, ən yaxşısını və münasibini . ١ .cümlələrdə işlədə bilsin

Onun zəkası bütün sözləri, ifadələri, isim və felləri başa düşməlidir ki, söz deyərkən .٢ (və ya yazarkən) öz məqsədini ifadə etmək üçün ən uyğun, ən münasib sözlərdən .yararlansın

Sözlərin düzülüşünü, özünəməxsus ahəngdarlığını bilməlidir ki, lazım gəldikdə . ٣ .cümlələrini ən yaxşı şəkildə qura bilsin

Məlum söz, məna və düzülüşü üst-üstə gəldikdə sonsuz bir toplu ilə qarşılaşırıq. Buna görə də bütün bunları əhatə etmək, zehnin bütün bunlardan yeri gəldikdə istifadə etməsi bir insanın qüdrəti xaricindədir. Bundan başqa Quranın dərin məzmunu, elmi sirləri və digər cəhətləri bəşər üçün başqa əlçatmaz elmlər də tələb edir. Deməli, hər şeyi əhatə edən yalnız uca yaradandır. Onun elmi

sonsuzdur. O, yuxarıda qeyd olunanları bir anda, bir yerdə nəzərdə tuta və elə bir kitab təqdim edə bilər ki, orada ən fəsih ifadələrdən, ən düzgün anlayışlardan və ən yaxşı düzülüşdən istifadə olunmuşdur. (أَلَمْ تَعْلَمْ أَنَّ اللّهَ عَلَىَ كُلِّ شَيْءٍ قَدِيرٌ) "Allahın hər şeyə qadir olmasını bilmirsənmi?!" (١) Bəli, fikrimizcə insanın Qurana bənzər bir kitab gətirməkdəki acizliyinin, bu ilahi kitabın ecazkarlığının sirri bəşər əqlinin və elminin məhdudluğu, Allahın əql və elminin sonsuzluğunda gizlənmişdir. (وَمَا أُوتِيتُم مِّن الْعِلْمِ إِلاَّ قَلِيلاً) "Sizə yalnız cüz'i (az) bir bilik verilmişdir!" (٢)

Buna görə də bəşərin elmi artdıqca, zəkası, təfəkkür qabiliyyəti dərinləşdikcə, Quranın söz, məna və ahəngdarlığının sirləri qarşısındakı təəccüb və heyranlığı daha da artır.

(قُل لَّئِنِ اجْتَمَعَتِ الإِنسُ عَلَى أَن يَأْتُواْ بِمِثْلِ هَذَا الْقُرْآنِ لاَ يَأْتُونَ بِمِثْلِهِ وَلَوْ كَانَ بَعْضُهُمْ لِبَعْضٍ ظَهِيرًا)

(Ya Peyğəmbər!) De: Əgər insanlar və cinlər bir yerə yığışıb bu Qur'ana bənzər bir şey gətirmək üçün bir-birinə kömək etsələr, yenə də ona bənzərini gətirə bilməzlər (٣).

### QURANIN ELMİ ECAZKARLIĞINDAN MƏQSƏD NƏDİR?

Quranın elmi ecazkarlığından məqsəd Quranın aşağıdakı xüsusiyyətlərə malik olan ayələridir.



---

١- [٢٩] Bəqərə, ١٠٦.

٢- [٣٠] İsra, ٨٥.

٣- [٣١] İsra, ٨٨.

Elmi sirlərin üstünü açan ayələr. Yəni ayədə elə bir elmi məsələ haqqında söhbət .١ gedir ki, ayə nazil onuncaya qədər heç kimin o haqda məlumatı yox idi. Bundan başqa həmin elmi məsələnin kəşfi o dövrün insanları üçün ixtiyarlarında olan imkanlara .nəzərən mümkün deyildi

Təbiət hadisələri və gələcəkdə baş verəcək tarixi olaylar haqqında (qeybdən) verilən .٣ xəbərlər. Hansı ki, Quran nazil olduğu dönəmdə heç kimin bu haqda məlumatı yox idi. Məlum (qeybdən verilən) xəbərlər adi yolla bilinməsi mümkün olmayan xəbərlər olmalıdır. Deməli, əgər Quranda öncəki səmavi kitablarda öz əksini tapmış, o dövrün yunan və iran elmi mərkəzlərində, elmi əsərlərdə sözü keçən və ya insanın instinktiv .olaraq anladığı bir şey haqqında xəbər verilərsə, bu möcüzə hesab edilmir

### ?BƏŞƏR ELMİ VƏ ZƏKASI BÜTÜN HÖKMLƏRİN FƏLSƏFƏSİNİ DƏRK EDİRMİ

Şiə sxolastikasında qəbul edilmiş prinsiplərə görə İslam hökmlərinin arxasında müəyyən məsləhətlər durur. Yəni Allah-taala spirtli içkilərdən törəyəcək fəsadları .(nəzərə alıb onu haram, oruc tutmağın faydalarını nəzərə alıb onu vacib etmişdir(١

:Şəriətdə bir neçə növ hökm mövcuddur

Birinci: Səbəbləri, fəlsəfəsi bəlli olan hökmlər. Belə hökmlərin hikmətini bəzən Allah özü açıqlamış (spirtli içkilərin haram edilmə səbəbləri kimi), bəzən ağıl qəti



---

.Əllamə Hilli, “Şərhi-Təcrid”, səh. ٣٠٢; Müzəffər, “Üsuli-fiqh”, c. ١, səh. ٢١۶[٣٢] -١

.(olaraq onun səbəbini dərk etmişdir (ədalətin, nizam-intizamın müsbət olması kimi

İkinci: Səbəbləri, fəlsəfəsi bəlli olmayan hökmlər. Bu növ hökmlərin nə üçün əmr və ya yasaq olunduğunu tam bilməsək də məsumlar (ə) tərəfindən bizə gəlib çatan rəvayətlərdə bu səbəblərə işarələr vurulmuş (qan yeməyin haramlığının səbəbi kimi) .(və ya yeni təcrübi elmlər onun sirlərini kəşf etmişlər (leş yeməyin haram olması kimi

Üçüncü: Bu qismə aid olan hökmlərin səbəbi, hikməti bəlli deyil. Ayə və rəvayətlərdə onların səbəblərinə işarələr yoxdur. Təcrübi elmlər onların sirlərini kəşf edə bilməmişdir. Başqa sözlə desək, onların kəşfi bəşər zəkasının qüdrəti xaricindədir. Bu növ hökmlər vəhy yolu ilə gəldiyindən müəyyən məsləhətə dayandığını bilir və qəbul edirik. Bunlar "təəbbüdi hökmlər" adlanır (gündəlik namaz rəkətlərinin sayını buna misal göstərmək olar). Əsrlər öncə "təəbbüdi hökmlər" çox olmuşdur (donuz ətinin, spirtli içkilərin haram olması və s.). Lakin zaman keçdikcə, bəşər elmləri inkişaf etdikcə .bu cür hökmlərin sayı azalır

Qeyd: Birinci və ikinci qismə aid olan hökmlər elmin də qəbul etdiyi hökmlərdir. Üçüncü qismə aid olanlar isə bəşərin bugünkü elminin fövqündədir. Lakin İslamda elmə zidd hökm yoxdur. Yəni bəşərin hazırkı zəkası, elmi sözügedən hökmlərin hikmətini dərk etmək iqtidarında deyil. Buna görə də biz iddia edir və bu kitabda sübuta yetirəcəyik ki, Quran ayələri, İslam hökmləri təcrübi elmlərin nailiyyətləri ilə tam uyğundur. Heç bir ayə və ya hökm zəka və elmin təsdiq etdiyi kəşflərlə ziddiyyət təşkil etmir

## İKİNCİ FƏSİL:QURAN VƏ KOSMOLOJİ ELMLƏR

### GİRİŞ

Səma və ona xüsusi gözəllik verən ulduzlar hələ erkən dövrlərdən bəşər övladını düşündürmüş, alimlərin diqqətini cəlb etmişdir. Belə ki, elmdə səmanı, ulduzları və s. göy cisimlərini araşdırmaqla məşğul olan xüsusi bölmə yaranmış və astronomiya, .yaxud (daha geniş mənada) kosmologiya adlandırılmışdır

Qurani-kərim də yaradılışın bu böyük nümunələrinə xüsusi diqqət yetirmiş və bir çox ayələrdə bu haqda söhbət açmışdır. Bəzən Yer və səmanın yaradılışı haqqında düşünməyi tövsiyə edir, bəzən də bu haqda elmi məsələlərə toxunur. Hansı ki, .kosmologiya alimləri həmin elmi məsələləri yalnız əsrlər sonra kəşf edə bilmişlər

Burada kosmoloji və astrofizik nəzəriyyələrlə uyğunlaşdırılan ayələri diqqətinizə .çatdırıb tədqiq edəcəyik

### ?DÜNYA NECƏ YARANMIŞDIR

Dünyanın (Kainatın) başlanğıcı bəşəri daim düşündürən məsələlərdəndir. Bir çox ayələrdə bu məsələyə işarələr vurulmuşdur. Kosmoloqlar da bu haqda müxtəlif fikirlər irəli sürmüşlər. Bəziləri isə məlum elmi nəzəriyyələri Quranla uyğunlaşdıraraq onun elmi ecazkarlığını sübut etməyə səy göstərmişlər. Təfsirçilər bu məsələ ilə bağlı .aşağıdakı ayələrə istinad etmişlər

ثُمَّ اسْتَوَى إِلَى السَّمَاءِ وَهِيَ دُخَانٌ ) (

“(١) ”Sonra Allah tüstü halında olan göyə üz tutdu (göyü yaratmaq qərarına gəldi).

أَوَلَمْ يَرَ الَّذِينَ كَفَرُوا أَنَّ السَّمَاوَاتِ وَالْأَرْضَ كَانَتَا رَتْقًا فَفَتَقْنَاهُمَا وَجَعَلْنَا مِنَ الْمَاءِ كُلَّ شَيْءٍ حَيٍّ أَفَلَا يُؤْمِنُونَ ) (

“Məgər kafir olanlar göylə Yer bitişik ikən Bizim onları ayırdığımızı, hər bir canlını sudan yaratdığımızı bilmirlərmi?! Yenə də iman gətirməzlər?”(٢).

**DÜNYANIN BAŞLANĞICI İLƏ BAĞLI ELMİ NƏZƏRİYYƏLƏR**

١. Böyük partlayış nəzəriyyəsi.

Bu nəzəriyyə ١٩٠٠-cu ildə irəli sürülmüş, indi də astronomlar tərəfindən ən dəqiq nəzəriyyə kimi qiymətləndirilməkdədir. Bu nəzəriyyədən məqsəd odur ki, təqribən ٢٠ mln. il öncə dünyada mövcud olan materiya və enerji son dərəcə sıxlıqda və olduqca kiçik bir nöqtədə yer almışdı. Maddə və enerjidən ibarət bu kiçik və sonsuz nöqtə partladı və partlayışdan dərhal sonra (bir neçə saniyə sonra) işıq sürətinə yaxın bir sürətlə yayılmağa başladı. Bir müddət sonra (ehtimal ki, bir neçə saniyədən bir neçə ilə qədər) maddə və enerji parçalanaraq ayrıldı və bugünkü Kainatın müxtəlif hissələri həmin ilkin partlayışdan törədi.

Bu nəzəriyyənin tərəfdarları iddia edirlər ki, qalaktika, ulduz və planetlər hələ də məlum partlayışdan yaranan



---

١- [٣٣]١١ ,Fussilət.

٢- [٣٤] ٣٠ ,Ənbiya.

sürətin təsiri nəticəsində olduqca yüksək sürətlə bir-birindən uzaqlaşırlar. Bu, Edvin .Habblın müşahidələri ilə təsdiq edilmişdir

Müasir kosmoloq Stefn Uilyam ilkin partlayışı, onun yanar qazların yaranmasına qədər .olan hissəsini izah edərək bu nəzəriyyənin rus alimi C. Qamova aid olduğunu iddia edir

.(Doktor Erick isə Kainatın yaranmasının səkkiz mərhələdə baş verdiyini iddia edir(١

.Sabit vəziyyət nəzəriyyəsi .٢

Bu nəzəriyyə ١٩۴٠-cı ildə ingilis kosmoloqu Hoyle tərəfindən irəli sürüldü. Bu nəzəriyyəyə görə Kainat sabitdir və zaman keçdikcə belə dəyişmir. Bu nəzəriyyə “böyük partlayış” kimi xüsusi bir hal ilə əlaqələndirilmir. Bu nəzəriyyəyə görə, Kainatın genişlənməsi nəzəriyyəsi qəbul edilir. Lakin bu da əlavə olunur ki, getdikcə bir-birindən uzaqlaşmaqda olan qalaktikalar arasında yeni bir maddə meydana gələcək. Yeni meydana gəlmiş bu maddə tədricən hidrogen atomları törədəcək, onlar da öz .növbələrində yeni ulduzlar formalaşdıracaqlar

.Plazma dünyası .٣

Astoronomların çox az bir hissəsi dünyanın yaradılışını Isveç alimi Hannes Alfvenin təqdim etdiyi model əsasında qəbul edirlər. Bu nəzəriyyəyə görə Kainatın müşahidə etdiyimiz hissəsinin ٩٩ ٪-i, xüsusilə ulduzlar plazmadan yaranmışdır. Plazma elektrik yükləri parçalanan (bir-birindən ayrılan) ionlaşmış qazdır. Plazma bəzən materiyanın dördüncü halı adlandırılır. Bu nəzəriyyənin tərəfdarlarına görə Kainat çox böyük elektrik cərəyanları



---

.Yeni fizika”, səh. ۵١, ۵٢“ [٣۵] -١

və sıx maqnit sahələrindən ibarətdir. Bu nəzəriyyəyə görə dünya əzəlidir. Deməli, Kainat üçün müəyyən başlanğıc və son nəzərdə tutmaq olmaz. Qalaktikalara gəlincə .onlar təqribən ۱۰۰ mln. il öncə formalaşmışlar

.Kiçik partlayışlar dünyası .۴

Bir qrup astronom isə astronomik müşahidələrə müvafiq olan digər bir nəzəriyyəni irəli sürmüşlər. Bu nəzəriyyəyə görə dünya başlanğıcsız və sonsuzdur. Maddə daim kiçik partlayışlar nəticəsində yaranır. Bu yeni nəzəriyyəyə görə Kainat tədricən .(genişlənir və qalaktikalar formalaşır(۱

**ELMİ SİRLƏR**

hiyə] "هى دخـــان" :Bəzi təfsirçilər Fussilət surəsinin ۱۱-ci ayəsi haqqında yazırlar . ۱ duxanun] ifadəsi göstərir ki, göyün yaradılışı öncə geniş qaz kütlələrindən başlamışdır. Bu ilk yaradılış haqqındakı son elmi tədqiqatlarla üst-üstə düşür. İndi də çoxlu sayda (ulduz sıx qaz və tüstü formasındadır.(۲

fətq] ifadələri (göylər və Yerin öncə bir-biri ilə bitişik bir ] "فتق" rətq] və] "رتق" Təfsirçilər .۲ :vəziyyətdə olub sonradan hissələrə ayrılması) haqqında üç ehtimalla çıxış etmişlər

a) Göy və Yerin öncə bir-biri ilə bitişik olması yaradılışın başlanğıcına işarədir. Alimlərin fikrincə Kainat öncə çox böyük vahid yanar (qızğın) buxar şəklində olmuş, daxili partlayış və hərəkət nəticəsində tədricən parçalanaraq ulduzları, planetləri, Yer ,kürəsini



---

.Bax: "Kosmos və qalaktikanın yolu", səh. ۳۴-۵۰[۳۶] -۱

.Təfsiri-nümunə", c. ۲, səh. ۲۲۸"[۳۷] -۲

ümumilikdə Günəş sistemini əmələ gətirmişdir. Kainat hələ də genişlənməkdədir. Əhli-beytdən (ə) gələn bəzi rəvayətlərdə də bu ehtimala işarələr var(١).

b) Bitişiklik və ya bütövləşmədən məqsəd Kainatın maddələrinin öncə yeknəsəq, sonsuz kiçiklikdə vahid bir maddə şəklində olmasıdır. Lakin zaman keçdikcə maddələr bir-birindən ayrılaraq yeni tərkiblər əmələ gətirdilər. Beləcə göydə və Yerdə heyvanlar, bitkilər və digər varlıqlar meydana gəldi.(٢)

c) Göyün bitişik olmasından məqsəd əvvələr yağışın yağmamasıdır. Yerin bitişikliyindən isə məqsəd əvvəllər heç bir bitkinin bitməməsidir. Lakin Allah bu ikisini bir-birindən ayırdı. Göydən yağış yağdırdı, Yerdə müxtəlif növ bitkilər bitirdi.

Əhli-beytdən (ə) gələn xeyli sayda rəvayət də son ehtimala işarələr vurur(٣). Əlbəttə, məlum ayə yuxarıda qeyd olunan hər üç ehtimalı əks etdirə bilər.

٣. Ayətullah Mərifət Ənbiya surəsinin ٣٠-cu ayəsi haqqında geniş söhbət açır və öncə qeyd etdiyimiz üçüncü ehtimalı (yağışın yağmaması versiyasını) rədd edir. Onun fikrincə bu ehtimal ayənin mənasına qarşıdır və bu məsələ ilə bağlı əlimizdə olan rəvayətlər zəifdir.

İkinci ehtimalı (müxtəlif varlıqların sonsuz kiçiklikdə vahid bir maddədən yaranması) Fəxr Razi tarixi ardıcıllıqla Qütadə, Səid ibn Cübeyr, Əkrəmə, İbn Abbasdan nəql edir və bunu keçmişdə və müasir dövrdə ən çox qəbul edilən nəzəriyyə hesab edir. O, Əbu Müslüm İsfahanidən "فتــق" [fətq] sözünün digər mənasının da olduğunu nəql edir. Burada "فتق" [fətq] sözü icad etmək,

səh:٢٩

---

١- [٣٨] Yenə orada, c. ١٣, səh. ٣٩٤, ٣٩٥.

٢- [٣٩] "Əl-Mizan", c. ١٤, səh. ٢٧٨, ٢٧٩.

٣- [٤٠] "Təfsiri-Safi", c. ٣, səh. ٣٤٧.

izhar etmək mənalarını ifadə edir. Həzrət Əlinin (ə) “Nəhcül-bəlağə” kitabında qeyd .olunan söyləmi də həmin mənanı ifadə edir

.Allah )ucsuz-bucaqsız( səmaları yardı ...فتق الأجواء

.(Sonra isə səmaların arasını açdı(١ ...ثم فتق بين السموات العلى

Onun fikrincə, bu məna Fussilət surəsinin ١١-١٢-ci ayələri ilə uyğundur. Yəni ayədə sözü keçən tüstüdən məqsəd göylərin və Yerin yaradılışındakı ilkin materiyadır. Həmin i`tiya] feli genetik (təkvini) əmr mənasını ifadə edir. Ayədən]ائتيا surədə oxuduğumuz aydın olur ki, göylər yaranmazdan öncə (onların ilkin maddəsi) mövcud idi. Allah onları müəyyən formalara saldı. Təntavinin fikrincə bu ayələrin məzmunu Quranın elmi .(möcüzələrindəndir(٢

O, P. Laplas və başqalarının Kainatın yaranması ilə bağlı elmi araşdırmalarını qeyd edərək belə bir nəticə əldə edir ki, Quranın məqsədi elmi məsələləri bəşərə çatdırmaq deyil. Allah-taala göylərin yaradılışı ilə bağlı bəzi məsələlərə toxunsa da və bu elmi .(nəzəriyyələr üst-üstə düşsə də mənası bizə tam bəlli deyil(٣

Alimlərdən biri dünyanın yaradılışı adı altında Fussilət surəsinin ١١-ci ayəsini geniş .۴ izah edərək ilkin partlayışdan söhbət açır. Sonra isə Edward Luther-in aşağıdakı :sözlərini qeyd edir

Elm dünyanın yaradıldığını isbat etməklə yanaşı onun (müəyyən) bir anda böyük bir“ partlayış nəticəsində qaz kütləsindən yarandığını da üzə çıxarır. Məlum an təqribən .”beş milyon il öncə olmuşdur və (Kainat) hələ də genişlənməkdədir



---

.Nəhcül-bəlağə”, xütbə/١“[۴١] -١

.Əl-Cəvahir”, c. ١٠, səh. ١٩٩“[۴٢] -٢

.Ət-Təmhid fi ülum əl-Quran”, c. ۶, səh. ١٢٩-١٣٩“ [۴٣] -٣

Digər müasir bir alim isə Fussilət surəsinin ۱۱ və Ənbiya surəsinin ۳۰-cu ayələri .۵ haqqında söhbət açaraq məlum ayələrin elmi kəşflərlə üst-üstə düşdüyünü və bunun .Quranın elmi möcüzəsi olduğunu vurğulayır

O yazır: “Astronomiya elmi sübuta yetirmişdir ki, planetlər yaradılışdan öncə bütövləşmiş, bir-birinə bitişik qaz şəklində olmuşlar. Sonralar, zaman keçdikcə sıxlıq nəticəsində (fırlanan) qaz dumanlıqları cisimlərə (göy cisimlərinə) çevrilmişdir. Bu hipotez (fərziyyə) təqribən iki əsr öncə məşhur fransız astronomu və riyazijyatçısı P. Laplas tərəfindən açıqlanmışdır. Bu gün artıq yeni astronomiya öz nailiyyətləri ilə P. .(Laplasın fikrinin doğruluğunu sübuta yetirmişdir(۱

Doktor Maurice Bucailleməlum ayələri izah edərkən Kainatın yaradılışı ilə bağlı yazır: .۶ “Quran hissəciklərdən ibarət qaz kütləsinin (qaz-toz buludu) mövcudluğunu təsdiq edir və ibtidai maddənin bütövləşmiş, bir-birinə bitişik ünsürlərinin ayrılmasından söhbət .”açır

Sual: Fussilət surəsinin ۱۱-۱۲-ci ayələrində Yerin yaradılışının iki mövsümdə :gerçəkləşdiyi vurğulanaraq buyurulur

Ya Peyğəmbər!) De: Doğrudanmı siz Yeri iki gündə yaradanı inkar edir və Ona şəriklər ) qoşursunuz? O ki, aləmlərin Rəbbidir! O, yer üzündə möhkəm durmuş dağlar yaratdı, onu bərəkətli etdi və (Allahdan ruzi) istəyənlər üçün bərabər olaraq orada yer əhlinin ruzisini dörd gündə (mövsümdə) müəyyən etdi. Sonra Allah tüstü (düman) halında olan göyə üz tutdu (göyü yaratmaq qərarına gəldi). Ona (göyə) və Yerə belə buyurdu: İstər-istəməz



---

.Quranın heyranedici məsələləri”, səh. ۱۷-۱۹“[۴۴]-۱

vücuda gəlin! Onlar da: İstəyərək (Allahın əmrinə itaət edərək) vücuda gəldik! - deyə .(cavab verdilər(١

Qurani-kərim yuxarıdakı ayədə göylərdən və tüstüdən (duman, buxar, qaz-toz dumanlıqları) söhbət açır. Əgər Quranın məqsədi bütün Kainatın (fırlanan) qaz-toz dumanlığından yaradılmasıdırsa, nə üçün Yerin yaradılışını göylərdən qabaq qeyd summə] (sonra) bağlayıcısı ilə onların arasındakı tərtibə də işarə] ثـم etmiş, hətta vurmuşdur? Bir halda ki, Yer özü göylərin bir hissəsidir və təbii ki, göylərdən sonra (və .ya) onlarla yanaşı yaranmalıdır

Cavab: Doktor Maurice Bucaille suala nəzərən digər elmi bir məqamı önə çəkmişdir. Onun fikrincə Quranda Naziat surəsində (٢٧-٣١) göylərin və Yerin yaranması məsələsi digər modeldə verilmişdir(٢). Bu ayələrdə göylərin yaradılışı Yerin yaradılışından öncə .bə`də zalikə] qeydi böyük önəm daşıyır] بعد ذالك qeyd edilmişdir. Bu mənada

O, yazır: “Elm, bir ulduzun (Günəş kimi) yaradılışının digər planet və ya planetlərdən birinin yaradılışı ilə qarışıqlı olduğunu sübuta yetirir. Sizcə bu, məlum Quran ayəsində (ən yaxşı şəkildə verilməmişdirmi?”(٣

Əbd ər-Rəzzaq Nofel də sözügedən ayələri (Ənbiya, ٣٠ və Fussilət, ١١) izah edərkən .٨ ilk yaradılış məsələsini önə çəkərək bildirir ki, göylər və Yer öncə vahid bir varlıq olmuş, sonradan ayrılmışlar. O, elmi nəzəriyyələri tətbiq



---

.Fussilət, ١١-١٢[٤٥] -١

.Naziat, ٢٧-٣١[٤٦] -٢

.Tövrat, İncil, Quran və elm”, səh. ١٨٨-٢٠١“[٤٧] -٣

edərək bunu Quranın elmi xəbərlərindən hesab edir. Hansı ki, bu, əsrlər sonra elmə .(məlum olmuşdur(١

Əhməd Məhəmməd Süleyman da Ənbiya surəsinin ٣٠-cu ayəsini izah edərkən onu .٩ Günəş sistemi haqqında yeni elmi nəzəriyyələrlə uyğunlaşdıraraq Peyğəmbərin (s) .(qeyb elminin (okkultizminin) nişanəsi, Quranın elmi sirləri kimi qəbul etmişdir(٢

"سماء" Seyid Hibə əd-Din Şəhristaninin fikrincə Fussilət surəsinin ١١-ci ayəsindəki .١٠ duxan] (tüstü) sözlərindən məqsəd atmosfer — Yer kürəsini] "دخان" səma] (səma) və] (eləcə də bəzi başqa planetləri, habelə günəşi və ulduzları) bürüyən qazaoxşar təbəqədir (qaz örtüyüdür). O, bunu Yer kürəsinin ətrafını bürümüş kürəvi "buxar səma] sözünün adi danışıqda və leksik] "سما" təbəqəsi" sözləri ilə ifadə edir. O, öncə səma] sözü ərəb] "سما" ,baxımdan hansı mənaları ifadə etdiyini açıqlayaraq bildirir ki dilində hərfi məna etibarilə (yuxarıda olan) Yerdən yuxarıda olan hər bir şeyə aid edilir. Təbii ki, müqəddəs mətnlər də sözlərin işlədilməsi baxımından adi danışıq dilinə tabe səma] sözü dini mətnlərdə aşağıdakı üç mənadan birində] "سما" :olmuşlar. O, yazır :işlədilmişdir

;Hava (١

Yeri bürüyən (əhatə edən) kürəvi təbəqə, qaz örtüyü (dini mətnlərdə əksər hallarda (٢ ;(həmin mənanı ifadə edir

.Planetlər (٣

səma] sözü yüksəkdə yerləşən istənilən şey haqqında işlənə bilir, nə] "سما" ,Bir halda ki !?üçün Yer kürəsini əhatə edən kürəvi buxar təbəqəsi haqqında işlədilə bilməsin



---

.Bax: Əbd ər-Rəzzaq Nofel, "Əl-Quran və əl-elmi əl-hədis", səh. ١٦٢, ١٦٣[٤٨] -١

.Əhməd Məhəmməd Süleyman, "əl-Quran və əl-elm", səh. ٥٣-٥٤"[٤٩] -٢

Şəhristani sözünün bu yerində ayədə məqsədin Yeri əhatə edən “kürəvi buxar örtüyü” olduğuna dair (ayə və hədislərdən ibarət) on sübut gətirir. Onun dəlillərinin ikinci qrupu Fussilət surəsinin məlum ۱۱-ci ayəsi və göylərin tüstüdən yaradıldığına işarə vuran duxan] tüstü sözünü] ”دخــان“ rəvayətlərdir. Sözlərinin sonunda Fussilət ayəsindəki :sözügedən “kürəvi buxar örtüyü” kimi izah edərək belə bir nəticə alır

Yuxarıda qeyd olunanlardan göründüyü kimi tüstüdən məqsəd həmin buxardır. Lakin“ tüstü və buxarın qaynağı eyni olduğundan və ya ilk baxışda bir-birinə bənzədiklərindən buxar tüstü deyə yad edilmişdir. Deməli, Yeri əhatə edən yeddi .(səma hamısı buxardan yaranmışdır”(۱

Bəzi müasir nəzəriyyəçilər Ənbiya surəsinin ۳۰-cu ayəsini izah edərkən bu ayənin .۱۱ göylərin öncə vahid olub sonradan ayrıldığını qeyd etdiyini və Quranın yeni elmin də .(təsdiq etdiyi möcüzəsi olduğunu vurğulamışlar(۲

Fussilət surəsinin ۹-۱۱-ci ayələrini Kainatın tüstüdən yarandığına işarə vurduğunu .(hesab edirlər(۳

Məhəmməd Kamil əs-Səməd Fussilət surəsinin ۱۱-۱۲-ci ayəsini Quranın elmi . ۱۲ ecazkarlığına bir sübut kimi qiymətləndirir və ayənin göylərin tüstüdən yarandığına .(işarə vurduğunu bildirir(۴

Səlim əl-Cabi “Böyük partlayış” nəzəriyyəsindən söhbət açaraq Ənbiya surəsinin .۱۳ ۳۰-cu ayəsini leksik və



---

.Seyid Hibə əd-Din Şəhristani, “İslam və astronomiya”, səh. ۱۳۱-۱۴۵“[۵۰] -۱
.”Məhəmməd Sami, “əl-Ecaz əl-elmi fil-Quran[۵۱] -۲
.Yenə orada, səh. ۳۴ [۵۲] -۳
.Məhəmməd Kamil Əbd əs-Səməd, “Əl-Ecaz əl-elmi fil-İslam”, səh. ۴۷[۵۳] -۴

terminoloji baxımdan açıqlayıb belə bir nəticə alır ki, “Böyük partlayış” nəzəriyyəsi .(məlum ayə ilə üst-üstə düşür(١

YEKUN

.Burada bir neçə məqamı nəzərdən qaçırmaq olmaz

.Mərhum Seyid Hibə əd-Din Şəhristaninin fikirləri bir neçə baxımdan iradlıdır .١

Quranın ilkin zahiri mənası (yaradılışın tüstüdən başlaması) Kainatın yaranması .٢ haqqındakı “Böyük partlayış” nəzəriyyəsi ilə uyğun gəlir və müştərək cəhətləri çoxdur. Başqa sözlə desək, Quranın ilkin zahiri mənası Kainatın başlanğıcda qızğın qazlardan təşkil olunduğunu qəbul edir. Amma Quran ayələri məlum elmi nəzəriyyənin digər .tərəflərinə (ilkin partlayış kimi) heç bir aydın işarə vurmur

Yaradılışın başlanğıcı haqqında elmi nəzəriyyələr çoxsaylı olduğu, onların qəti sübuta .٣ .yetmədiyi üçün hal hazırda heç bir nəzəriyyəni qəti şəkildə Qurana aid etmək olmaz

Əgər bir gün “Böyük partlayış” nəzəriyyəsi qəti şəkildə sübuta yetərsə, bu, Quranın .۴ elmi ecazkarlığını da sübut edər. Çünki bir növ Quranın elmi sirlərə işarəsi kimi qiymətləndirilir. Lakin bu gün üçün sadəcə Quran və elm arasında maraqlı .(ahəngdarlıqdır(٢



---

Səlim əl-Cabi, “Ən-Nəzəriyyə əl-Quraniyyə əl-kəvniyyə həvlə xəlq əl-aləm, səh. [۵۴] -١ .١٠۶-١١١

səma] sözünün üç mənasını qeyd etmişdir.] ”سما“ Birincisi, mərhum Şəhristani [ ۵۵] -٢ Halbuki bu söz Quranda daha çox mənada işlənmişdir. İkincisi, o, Fussilət surəsində səma] sözünü atmosfer kimi izah etmişdir. Halbuki Fussilət surəsinin] ”سما“ qeyd olunan ”سما“ ,٩-١٢-ci ayələrində konteksdən, surəyə hakim olan ümumi vəziyyətdən anlaşılır ki səma] sözündən məqsəd göylər və digər planetlərdir. Çünki öncə Yerin yaradılışından ] (De: Doğrudanmı siz Yeri iki gündə yaradanı inkar edir və Ona şəriklər qoşursunuz?), sonra isə göyün tüstü halında yaradılmasından danışır (Sonra Allah tüstü (duman)

halında olan göyə üz tutdu). Növbəti ayədə isə yeddi göyün yaranmasını izah edir. Onlardan biri dünyanın səmasıdır. Hansı ki, ulduzlarla bəzənmişdir (Allah onları (səmaları) yeddi (qat) göy olaraq iki gündə əmələ gətirdi. O, hər bir göyün işini özünə vəhy edib bildirdi. Biz aşağı göyü (dünya səmasını) qəndillərlə (ulduzlarla) bəzədik və səma] sözündən məqsəd (ayələrin ilkin zahiri mənasına görə)] "سما" ,hifz etdik). Deməli duxan] sözünü] "دخان" ,atmosfer deyil. Üçüncüsü, o, dilimizə tüstü kimi tərcümə olunan Yerin ətrafını bürüyən, əhatə edən buxar örtüyü kimi izah etmişdir. Halbuki məlum duxan] sözünün ibtidai mənasından əl çəkməyimizə səbəb ola biləcək və] "دخان" ayədə onu məcazi olaraq buxar kimi izah edə biləcəyimizə heç bir əsas yoxdur. Burada sırf duxan] (tüstü) sözü bəzi] "دخـــان" ,adi həyatdakı oxşarlıq kifayət etmir. Əlbəttə rəvayətlərdə buxar mənasında işlənmişdir (Mərhum Şəhristani də bir neçə rəvayət qeyd etmişdir). Lakin birincisi, bu rəvayətlər sənəd baxımından araşdırılmalıdır (bu növ rəvayətlər "Təfsiri-Qumi" kimi kitabdan nəql olunduğuna görə, daha da şübhə doğurur). İkincisi, ehtimal ki, burada suyun buxarından və ya tüstüdən məqsəd əşyanı təşkil edən ilkin zərrəciklərdir (hidrogen, oksigen və s.). İnsanların asanlıqla başa .düşməsi üçün su buxarı kimi izah edilmişdir

## ?QURAN YARADILIŞIN MƏRHƏLƏLƏRİ HAQQINDA NƏ DEYİR

Qurani-kərim də Tövratda olduğu kimi dünyanın yaradılışının mərhələli şəkildə olduğu haqda bir neçə ayədə söhbət açır. Burada Quran və elm baxımından yaradılışın .mərhələlərini araşdıracağıq. Quranın bu mövzu ilə bağlı ayələri bir neçə yerə bölünür

.(Birinci: "Həqiqətən, Rəbbiniz göyləri və Yeri altı gündə xəlq edən ... Allahdır" (١



---

.Ə`raf, ۵۴; Yusuf, ٣; Hud, ٧; Hədid, ۴[۵۶] -١

(İkinci: “Göyləri, Yeri və onların arasındakıları altı gündə xəlq edən ... Allahdır” (١

göylər, Yer və onların arasında olanlar) ifadəsi ) ”السَّمَاوَاتِ وَالْأَرْضَ وَمَا بَيْنَهُمَا“ ,Qeyd: Fikrimizcə .bütünlüklə obyektiv gerçəkliyi nəzərdə tutur

Üçüncü: (Ya Peyğəmbər!) De: Doğrudanmı siz Yeri iki gündə yaradanı inkar edir və Ona şəriklər qoşursunuz? O ki, aləmlərin Rəbbidir! O, yer üzündə möhkəm durmuş dağlar yaratdı, onu bərəkətli etdi və (Allahdan ruzi) istəyənlər üçün bərabər olaraq orada yer əhlinin ruzisini dörd gündə (mövsümdə) müəyyən etdi. Sonra Allah tüstü (düman) halında olan göyə üz tutdu (göyü yaratmaq qərarına gəldi). Ona (göyə) və Yerə belə buyurdu: İstər-istəməz vücuda gəlin! Onlar da: İstəyərək (Allahın əmrinə itaət edərək) vücuda gəldik! - deyə cavab verdilər. Allah onları (səmaları) yeddi (qat) göy olaraq iki gündə əmələ gətirdi. O, hər bir göyün işini özünə vəhy edib bildirdi. Biz aşağı göyü (dünya səmasını) qəndillərlə (ulduzlarla) bəzədik və (onu) hifz etdik. Bu, yenilməz (qüvvət sahibi olan, (hər şeyi) bilən Allahın təqdiridir (əzəli hökmü, qanunudur)! (٢

Ey kafirlər!) Sizi yaratmaq çətindir, yoxsa göyü ki (Allah) onu yaratdı; Qübbəsini )“ ucaltdı, düzəldib nizama saldı; Gecəsini qaranlıq, gündüzünü işıqlı etdi?! Bundan sonra da Yeri döşəyib (yayıb) düzəltdi (üstündə gəzmək və yaşamaq üçün onu yararlı hala saldı). Ondan suyunu və



---

.Səcdə, ۴; Furqan, ۵۹; Qaf, ٣٨[۵٧] -١

.Fussilət, ٩-١٢[۵٨] -٢

otlağını çıxartdı. (Orada) dağları yerləşdirdi. (Bütün bunlar) sizin və heyvanlarınızın .(istifadəsi üçündür”(١

Birinci qrup ayələrdə eyni məzmun təkrar olunmuşdur. Yəni Alahın göyləri və Yeri altı bəynəhuma] sözü] ”بَيْنَهُمَا“ yaratdığı qeyd olunmuşdur. İkinci qrup ayələrdə (يوم) gündə də əlavə edilmişdir. Yəni Allahın göyləri, Yeri və onların arasındakıları altı gündə xəlq etdi. Üçüncü qrup ayələrdə (Fussilət, ٩-١٢) ümumilikdə səkkiz gündən söhbət .açılmışdır. Burada bir neçə sual meydana çıxır

yəvm] gün sözündən məqsəd nədir? Günəş, Yer, gecə və ] ”يوم“ Sual: Ayədə sözü keçən gündüz yaranmadan dünyanın altı gündə (gün çıxandan batana qədər olan fasilə) ?yaranması haqqında danışmaq olarmı

yəvm] sözünün ilkin mənası mütləq mənada məhdud zamandır. İstər bu] ”يوم“ :Cavab zaman az olsun, istər çox, istər konkret (maddi) olsun, istər abstrakt (mücərrəd), istər :gündüz olsun, istərsə də gecə və gündüz. Quranda isə bir neçə mənada işlənmişdir

(Gün çıxandan batana qədər olan zaman kəsiyi;(٢ (١

(Müəyyən bir zaman kəsiyi (mövsüm);(٣ (٢

.(Maddi anlayış xaricində olan zaman (axirət günü, Qiyamət günü və s.)(۴ (٣

yəvm] sözündən məqsəd bizim başa düşdüyümüz adi gündürsə, o] ”يوم“ Sual: Əgər zaman bu ayələrin elmi nailiyyətlərlə yaranan təzaddı necə həll olunur? (Yeni elmi .(kəşflərə görə dünya milyard illər ərzində meydana gəlmişdir



---

.Naziat, ٢٧-٣٣[۵٩] -١
.Bəqərə, ٢[۶٠] -٢
.İbrahim, ۵; Ali-İmran, ١۴٠[۶١] -٣
.”Bax: “Mufrədati-Rağib[۶٢] -۴

Cavab: Ayələri bütövlükdə nəzərdən keçirdikdə göylərin və Yerin altı gündə yaradıldığı, gündən isə məqsədin mövsüm və ya mərhələ olduğu qənaətinə gəlirik. Belə olan halda yəvm]] "يوم" elmi kəşflərlə ayələr arasındakı ilkin ziddiyyət də qalxmış olur. Çünki ayədə sözündən məqsəd altı mövsüm və ya altı mərhələdirsə, adi gün deyilsə, deməli heç bir ziddiyyət qalmır və dünyanın yaradılması ilə Quran ayələri elmi kəşflərlə bir-birini tamamlayır.

Sual: "سموات وارض" ]səmavat və ərz] anlayışlarından məqsəd nədir?

Cavab: Leksik məna etibarı ilə hər bir şeyin yuxarısına "سما" ]səma], aşağısına isə "ارض" ]ərz] deyilir(۱). Lakin Quranda fərqli mənalarda işlədilmişdir(۲). Burada həmin mənaların bir neçəsini diqqətinizə çatdırırıq:

۱) Səma yuxarı, yer (ərz) aşağı mənasında işlənmişdir;(۳)

۲) Səma atmosfer mənasında işlənmişdir;(۴)

۳) Yer, Yer kürəsi, səma isə digər planetlər, göy cisimləri haqqında işlədilmişdir;(۵)

۴) Səma Allah dərgahı, yer isə varlığın aşağı mərtəbəsi kimi işlənmişdir(۶). Burada mənəvi cəhət əsas götürülmüşdür.

Deməli, səma və yer sözləri Quranda daim konkret mənada işlənməmişdir. Elə buna görə də səma və ya yer sözünü gördüyümüz an maddi anlamda izah etməməliyik. Fussilət surəsində ilkin zahiri məna baxımından konkret



---

۱- [۶۳] Yenə orada.
۲- [۶۴] ۱۶۵ Ətraflı məlumat üçün bax: "Təfsiri-nümunə", c. ۱, səh. ۱۶۵.
۳- [۶۵] İbrahim, ۴.
۴- [۶۵] Qaf, ۹.
۵- [۶۷] "Fussilət", ۱۱.
۶- [۶۸] "Səcdə", ۵.

göy və Yer mənalarını ifadə etsə də, Səcdə surəsində (۵-۴-ci ayələr) mənəvi, mücərrəd .(anlayışda verilməsi daha məqsədəuyğundur(۱

Qeyd: Göylərin sayı və yeddi ədədinin sirri haqqında ayrıca söhbət açacağımızdan .burada o haqda danışmırıq

## QISA TARİX

Obyektiv gerçəkliyin yaranması və keçdiyi mərhələlər bəşəriyyətin ən qədim suallarından olmuşdur. İnsan ulduz dolu səmaya, dağlara, dənizlərə baxdıqca düşünür ki, bunları kim və necə yaratmışdır. Onlar hansı mərhələlərdən keçmişlər. İlahi dinlər, filosoflar, astronomlar və geoloqlar bu haqda bir sıra fikirlər irəli sürmüşlər ki, burada :bir neçəsini diqqətinizə çatdırırıq

;a) Dünyanın yaranışı yunan filosoflarının fikrincə

İlk yunan filosofu hesab edilən Miletli Falesə (miladdan öncə ۶۴۰-cı il) görə obyektiv .۱ aləm sudan yaranmışdır. Bütün mövcudatın ilk əsası sudan ibarətdir. Kainatda baş .(verən bütün dəyişikliklər suya təsir göstərən ünsürlər nəticəsində gerçəkləşir(۲

Falesin şagirdi Miletli Anaksimandr deyirdi: “Varlıq anlaşılmaz və sonsuzdur. Bu . ۲ .”qədər şey görünür və gözdən itir. Bu daimi hərəkət nəticəsində gerçəkləşir



---

.Təfsiri-əl-mizan”, c. ۱۶, səh. ۲۴۷“[۶۹] -۱

Torpaq ovuntusu havanın dəyişilməsi nəticəsində əmələ gəlmişdir. Hava buxar [۷۰] -۲ şəklini almış sudan ibarətdir. Od, sudan bərkimiş (kristallaşmış) cisimlərdən törəyir. Buludlar suyun buxarlanması nəticəsində yaranır digər buludlarla toqquşur. Nəticədə od yaranır. Hansı ki, biz onu elektrik adlandırırıq. Həmin od, alov Kainatın yuxarısına doğru yüksəlir və dəliklər açır. Biz, bu parlaq dəlikləri ulduz adlandırırıq (Məhəmməd Ğəlab, “Yunan fəlsəfəsi”, c. ۱, səh. ۸; Əbd əl-Qəni əl-Xətib, “Quran və müasir elm”, səh. .(۶۸-۷۰

O, dünyanı üç boru şəklində təsəvvür edirdi. Birinci borunun dəliyi var. Biz onu Günəş .şəklində müşahidə edirik

Atomistikanın baniləri Levkipp və Demokrit Abderliyə görə (mütləq) boşluq gözlə .۳ görünməyən atomlarla doludur. Atomlar dəyişməz və əzəlidir. Göy və Yer onlardan .yaranmışdır

Anaksaqor Klazomenliyə görə dünya dörd ünsürdən ibarətdir; od, su, hava, torpaq. .۴ .Bütün bunlar hamısı əzəlidir

Heraklitə (Efesli) görə bizim gördüyümüz ulduzlar hamısı qəlizləşmiş (sıxılmış), . ۵ .daşlaşmış buxardan ibarətdir

.b) Dünyanın yaranışı Tövratda

:Tövratın “Yaradılış” bölməsində yaradılışın mərhələləri haqqında belə deyilir

.(Birinci gün: Allah göyləri və Yeri yaratdı. Gecə və gündüzü yaratdı (nur icad etdi

İkinci gün: Allah sular arasında onları bir-birindən ayırmaq üçün fələk (sfera) yaratdı .və onu səma (göy) adlandırdı

Üçüncü gün: Allah səma altındakı suların bir yerə yığılmasını və quruluqların meydana .gəlməsini istədi və onu Yer adlandırdı. Sonra da Yerdə bitkiləri göyərtdi

Dördüncü gün: Allah iki böyük işıqlı varlıq yaratdı. Onlardan ən böyüyünü gündüzə, (nisbətən) kiçiyini isə gecəyə hakim etdi. Beləcə ulduzları da yaradıb onları səmaya .düzdü

Beşinci gün: Allah suların çoxlu sayda canlılarla dolmasını, quşların yer üzündə, .səmada uçmasını əmr etdi

Altıncı gün: Allah Yer üzündə heyvanları, həşəratı yaratdı. Daha sonra isə Adəmi öz .şəklində yaratdı

Yeddinci gün: Allah bütün işlərini bitirdi və rahatladı. Buna görə də yeddinci günü .“mübarək gün” adlandırdı

Huks «Qamusi-kitabi-müqəddəs» əsərində yaradılışın mərhələləri ilə bağlı “gün” :ifadəsindən istifadə olunması haqqında yazır

Bilməliyik ki, burada “gün” sözündən məqsəd məlum iyirmi dörd saatlıq gün (sutka)“ .”deyil. Burada məqsəd daha geniş və uzun zaman kəsiyidir

Sonra Tövratın yaradılış kitabının (bölməsinin) təcrübi elmlərin kəşfləri ilə ziddiyyəti :haqqında yazır

Əgər kimsə yaradılış kitabına (bölməsinə) etiraz gözü ilə yanaşıb bunların“ astronomiya, geologiya, biologiya və zoologiya ilə uyğun gəlmədiyini iddia edərsə, ona belə cavab verərik ki, birincisi, bunlardan məqsəd elmi məsələləri açıqlamaq deyil. İkincisi, məlum olduğu kimi bütün bunlar elmə zidd deyil. Lakin bu məsələlərin izahı .(buraya sığmaz”(١

## QURAN VƏ ELMƏ GÖRƏ YARADILIŞIN MƏRHƏLƏLƏRİ

Elmi nailiyyətlərə və Quran ayələrinə nəzərən məlum altı mərhələ haqqında müxtəlif .fikirlər irəli sürmək olar

Əllamə Təbatəbai “əl-Mizan” əsərində Fussilət surəsinin ٩-cu ayəsini izah edərkən .١ :yazır

yəvm] (gün) sözündən məqsəd zaman kəsiyidir. Adi danışıqda işlədilən] ”يوم“ Burada“ gün, yəni Yer kürəsinin öz oxu ətrafında bir tam dövrü müddəti, iyirmi dörd saat (sutka) deyil. Bu versiya təbii ki, yanlışdır. Gün sözü özündə çoxlu hadisələri sığdıran .”müəyyən zaman kəsiyinə aid olması (ərəb dilində) çox geniş yayılmış haldır



---

.”Haks, “Qamusi-kitabi-müqəddəs[٧١] -١

:Sonra Ali-İmran surəsinin ۱۴۰-cı, Yunus surəsinin ۱۰۲-ci ayələrinə istinad edərək yazır

Allahın Yeri yaratdığı iki gündən məqsəd Yerin yaradıldığı iki mərhələni əhatə edən " zaman kəsiyidir". Nə üçün bir gün deyil, məhz iki gün deyildiyinə gəlincə, bilməliyik ki, ."bu iki mərhələ bir-birindən tamamilə fərqli mərhələlər olmuşdur

Sonra diqqəti göylərin və Yerin altı gündə (mərhələdə) yaradıldığına çəkib bildirir ki, bu mərhələlərin dördü Fussilət surəsində açıqlanmışdır (iki mərhələ Yerin yaradılışı, iki mərhələ isə göylərin yaradılması haqqında, yəni tüstü halından yeddi səmanın ərbəətu əyyam] (dörd gün) ifadəsini özünəməxsus] "اربعه ايام" ,formalaşmasınadək). O .(şəkildə izah edir ki, növbəti səhifələrdə bu haqda söhbət açacağıq(۱

sittətu əyyam] altı gün haqqında (Əraf, ۵۶) iki ehtimalı] "سته ايام" Ustad Misbah Yəzdi .۲ :qeyd edir

;(a) Həftənin altı günü (adi günlər

Onun fikrincə bu fikir əhli kitab, xüsusilə yəhudilər arasında məşhurdur. Onlara görə Allah yaradılışı bazar günü başladı, cümə günü sona yetirdi. Şənbə günü isə istirahət .(etdi. Bu ehtimal doğru deyil(۲

.b) Yaradılışın altı mərhələsi

yəvm] sözünün Quranda hansı mənalarda işləndiyindən söhbət açaraq bildirir] "يوم" ,O yəvm] sözü gün mənasından fərqli mənalarda da işlənmişdir. Buna dəlil olaraq] "يوم" ,ki Yusuf (۵۴), Nəhl (۸), Həcc (۴۷), Məaric (۴) ayələrini və "Nəhcül-bəlağə"dən bir hədis qeyd edib nəticə alır ki, bütün bunlar altı gündən məqsədin yaradılışın altı



---

.Əl-Mizan", c. ۱۷, səh. ۳۶۳-۳۶۴" [۷۲] -۱

.Maarifi-Quran" səh. ۲۴۱-۲۴۳" [۷۳] -۲

.mövsümü, mərhələsi olması ehtimalının daha məqsədəuyğun olduğunu göstərir

:O, Fussilət surəsinin ۹-۱۲-ci ayələrini izah edərək yazır

Ehtimal vermək olar ki, iki gündən məqsəd göyün yaradılmasındakı iki mərhələdir. İlk“ mərhələ qaz və tüstü mərhələsi, ikinci isə yeddi göy mərhələsi. Yerin yaradılışı da həmin şəkildə olmuşdur. Birinci mərhələ qaz və maye halı, ikinci mərhələ isə .(qəlizləşmiş, bərkimiş mərhələsi(۱

Ustad Məkarim Şirazi Ə`raf (۵۴), Fussilət (۹-۱۲) surələrinə və elmi kəşflərə nəzərən .۳ :yaradılışın ehtimal olunan altı mərhələsini belə izah edir

.Birinci: Kainatın qaza oxşar kütlə şəklində olması mərhələsi

.İkinci: Ondan böyük kütlələrin ayrılıb mərkəzi kütlənin ətrafına fırlandığı mərhələ

.Üçüncü: Günəş sisteminin yarandığı mərhələ

.Dördüncü: Yerin soyuq və yaşam üçün əlverişli vəziyyətə gəlməsi mərhələsi

.Beşinci: Yerdə bitkilərin və ağacların yaranması mərhələsi

.Altıncı: Yer üzündə insan və heyvanların yaranması mərhələsi

:O, Fussilət surəsinin ۹-۱۲-ci ayələrini izah edərkən bir neçə məqamı önə çəkir

yəvm] (gün) sözünün digər mənalarda - mövsüm, mərhələ mənasında] ”يــوم“ (a ;işlənməsi geniş yayılmış haldır

summə] (sonra) ifadəsi ehtimal ki, Yerin yaradılışının göylərin və göy cisimlərinin] ”ثم“ (b .yaradılmasından sonra baş verdiyinə işarədir



---

.Yenə orada [۷۴]-۱

summmə] (sonra) ifadəsi adətən zaman haqqında, bəzən isə bəyan haqqında] "ثم" (sadəcə söhbətdə birinci cümlənin ikinci cümlədən sonra gəldiyini bildirir) işlənir. Əgər birinci mənada işlənərsə, bu, göylərin yaradılışının Yerin yaradılışından sonra baş verməsi deməkdir. Lakin ikinci mənada işlənərsə, göylərin yaradılışının Yerdən qabaq baş verməsinin düşünülməsi məneəsizdir. Yəni sadəcə bunları bəyan edərkən (insanların diqqət mərkəzində olduqları üçün) öncə Yerin yaradılmasından, sonra isə göylərin yaradılışından söhbət açır.

İkinci məna elmi kəşflərlə ahəngdar olması ilə yanaşı, Quranın digər ayələri ilə də uyğundur. Buna dəlil olaraq Naziat surəsinin ۲۷-۳۳-cü ayələrini göstərmək olar. Burada Yerin yaradılması ilə bağlı məsələlərin göylərin yaradılışından sonra baş verdiyi göstərilir(۱).

۴. Doktor Maurice Bucailleyaradılışın altı mərhələsi haqqında yazır:

"Tövratda söhbət adi altı gündən gedir. Yeddinci gün isə (şənbə) Allah istirahət etdi. Bu gündən məqsəd iki günçıxanla iki günbatan arasındakı zaman fasiləsidir. Quranda "يوم" sözü işlənmiş, lakin mövsüm, mərhələ mənasını ifadə etmişdir. Yeddinci gün dedikdə isə məqsəd istirahət deyil. Bu məqam Quranın elmi möcüzələrindəndir."

O, Əraf (۵۴) və Fussilət (۹-۱۲) surələrinin məlum ayələrini izah edərkən müasir elmin yaradılışın mərhələləri haqqındakı ehtimalları ilə bağlı yazır:

"Müasir elmə görə Kainat ağır tərpənişli qaz kütləsindən təşkil olunmuşdur. Onun əsas tərkibi hidrogendən, digər hissəsi isə heliumdan ibarət idi. Sonra bu buluda bənzər qaz kütləsi (dumanlığı) çoxsaylı



---

۱- [۷۵] "Təfsiri-nümunə", c. ۲۰, səh. ۲۲۲-۲۳۱.

parçalara ayrıldı. Həmin qaz kütləsi sonradan qalaktikalar şəklini aldı... (Yaranan) sıxlıqlar, təkanlar, cazibə qüvvəsi reaksiyaların (atomistik istiliyin) yaranmasına səbəb oldu. Sadə atom zərrəciklərindən ağır (elektrik yüklü) atomlar törədi. Hidrogen heliuma, karbon oksigenə çevrildi, nəticədə metal və metalaoxşar elementlər meydana gəldi"(١). Onun gəldiyi qənaətə görə yaradılış ümumilikdə iki mərhələdə baş :vermişdir

;(a) Hərəkətdə olan sıx qaz yığını (kütləsi

.b) Onun böyük hissələrə (Günəş, Yer və digər planetlərə) parçalanması

Müasir tədqiqatçılardan biri(٢) dünyanın yaradılışını bir neçə ad altında incələyir və .۵ :Quran ayələrinə tətbiq edir. Biz onun yazısını ixtisarla diqqətinizə çatdırırıq

;a) Kainatın yaradılışı

O, Hud surəsinin ٧-ci (Göyləri və Yeri altı gündə yaradan Odur) ayəsini qeyd edərək :yazır

Başlanğıcda zülmət qaranlıq bütün aləmi bürümüşdü. Uca Tanrıdan başqa heç nə və " ."heç kim yox idi(٣). Bu zaman Allah iki mərhələdə yeddi göyün yaranmasını əmr etdi

Sonra Kainatın ilkin materiyasının nə olduğunun məlum olmadığını açıqlayır və bildirir ki, bunu Kəhf surəsinin ۵١-ci ayəsi və bəzi elmi teoremlər də təsdiq edir. Qurana və alimlərə görə bəlli olan yaradılışın başlanğıcında hərəkətli tüstü və qaz hissəcikləri mövcud olmuşdur. Lakin bu hissəciklər nadir hallarda bir-birinə toxunacaq dərəcədə .(səpələnmişlər(۴



---

.Yenə orada, səh. ١٩٨ [٧۶] -١

.Biazar Şirazi, "Dünyanın keçmişi və gələcəyi", səh. ١٩, ٣١ [٧٧] -٢

.Fussilət", ١٢" [٧٨] -٣

Fussilət", ١١. O, bu fikirlərini əsaslandırmaq üçün astronom Jeames-in sözlərinə"[٧٩] -۴ istinad edir. Onun fikrincə yaradılışın ilkin maddəsi fəzada (boşluqda) səpələnmiş qaz

kütlələrindən başlamış, sonra bu qaz yığınından yüngül meh yaranmışdır (“Günəşin başlanğıcı və sonu” əsərindən).

:Sonda belə bir nəticə alır

Allah iki mərhələdə bu qazlardan yeddi göyü yaratdı (Fussilət, ١١). (Gözə) görünməz“ sütunlar vasitəsi ilə (hansı ki, müasir elmdə Ümumdünya Cazibə Qanunu adlanır) .(planetləri möhkəmlətdi (Loğman, ١٠

;b) Ulduzların yaradılışı

O, Saffat surəsinin ۶-cı ayəsini(Biz (sizə) ən yaxın olan göy üzünü (dünya səmasını) :ulduzlarla bəzədik) izah edərkən yazır

Beləcə milyonlarla qaz və tüstü (toz) hissəcikləri iri həcmli buludlar şəklində bir-birinin“ ətrafına fırlanmağa başladılar. Bulud yığınları zərrəcikləri mərkəzə doğru cəzb edirdilər. Nəticədə kütləvi bulud yığınları əmələ gəlir və onların hissəcikləri bir-birinə yaxınlaşırdı. Məlum hissəciklərin bir-birinə sürtünməsi, toqquşması nəticəsində istilik (elektrik, enerji) yaranırdı. Bəzən mərkəzdə istilik elə şiddətlənirdi ki, bulud yığınlarını şaxımağa (işıq saçmağa) vadar edir, zülmətə qərq olmuş boşluğu işıqlandırırdı. Sonda milyonlarla bulud yığını ulduzlar şəklini aldı və aşağı səmanı (göyü) işıqlandırdı (Əlbəttə, .(bütün ulduzlar bir anda yaranmamışlar

;c) Günəşin yaradılışı

Bu fırtınalı dərya (tüstü və qaz) arasında, materiyanın hərəkəti nəticəsində spiralvari bir zolaq əmələ gəldi. Bu spiralvari zolaq Ağ yol qalaktikası adlanır (bütün göyü qurşayan açıq gümüşü zolaq) (١). Günəş və Yer onun bir tərəfində (budağında) özünə .(yer almışdır (Nuh, ١۶



---

Qədim yunanlar bunu “qalaksias”, yəni süd dairəsi adlandırmışlar (qala-süd[٨٠] -١ .(sözündəndir

Ağ yol qalaktikasının bu hissəsində fırtına qopur və qazlardan yaranan cərəyan onları hərəkətə gətirirdi. Onlar fırlandıqca geniş spiralvari, qıvrım şəkil aldı və işıqlı parçalar onun ətrafında hərəkətə başladı. Həmin nəhəng qıvrım forma fırlandıqca tədricən qaz topaları (dumanlıqları) mərkəzə doğru cəzb oldu. Orada nəhəng şar (yumaq) işıqlı, .parlaq yığınlar şəklini aldı. Nəhayət, bu parlaq şar (yumaq) Günəşə çevrildi

Yer və Günəş sisteminin yaradılışı Günəşin ətrafını (işıq dairəsi şəklində) bürüyən ( ۲ qaz və toz topaları parçalandı və hər bir parça girdab (burulğan) şəklini aldı. Hər bir burulğanın özünəməxsus yolu (kursu), hərəkət çevrəsi var idi və həmin kurs üzrə Günəşin ətrafına fırlanırdı. Günəşə yaxın burulğanlarda istilik, uzaq burulğanlarda isə soyuq hökm sürürdü. Bəzi qaz zərrəciklərindən buxar törəyir və şeh kimi toz zərrəciklərinin üzərinə qonurdu. Toz zərrəcikləri bir-birinə dəydikdə şeh onları bir-birinə yapışdırırdı. Bəzənsə bərkimiş, qəlizləşmiş (buzlaşmış) su və gil şəklini alırdılar. Cazibə qüvvəsi bu parçaları bir-birinə doğru çəkirdi. Onlar böyüyür və nəhəng, fırlanan şar (yumaq) əmələ gətirirdi. Nəhayət, məlum şar (yumaq) "Yerə" çevrilirdi. Sonra digər planetlər (Merkuri, Venera, Mars, Yupiter, Saturn, Uran Nepton, Pluton) bu .burulğanlardan əmələ gəldi. Hər bir planet Günəş ətrafında dövr etməyə başladı

;ç) Yerin taleyi

Yer formalaşır və quru, çılpaq daşlardan ibarət şar (yumaq) şəklində nəzərə çarpırdı (Bu zaman orada nə yaşam, nə hava, nə də bulud vardır). Əsrlər öncə onda dəfn olunan buxar və digər qazlar gil (çöküntü süxuru) yığınları ilə birgə daşlar altında qalaqlanmış məxsus atomların parçalanması nəticəsində istilik (enerji) yaradır. Yerin təki

isinir, onun dərinliklərində daşlar elə qızır ki, əriməyə başlayır və qaz köpüklənərək .qaynayır, yanardağlardan (vulkan) püskürərək yer üzünə axır

Qazlar da yanar dağlardan xaric olur. Yerin dörd bir yanına yayılır və onun üzərinə hava örtüyü çəkirlər. Buxar soyuyur, buludlar zənginləşir və ilk yağışlar yağmağa başlayır. Milyon illər beləcə yağış yağır və Yerin dərinliklərinə hopur. Quran bu haqda :buyurur

Biz göydən lazımi qədər yağmur endirdik və onu Yerdə (dənizdə, çayda, göllərdə və" .(quyularda) saxladıq"(١)

.(d) Yer üzündə yaşam (bu haqda ayrıca bir fəsildə söhbət açacağıq

Doktor Paknijad "İslam və biologiya" adı altında yaradılışın və Yerdə yaşamın . ۶ başlanmasının elm, Quran və hədislərə nəzərən geniş izahını verir və onu bir film kimi .(olduqca maraqlı şəkildə canlandırır(٢)

"ما" ərş] və] "عرش" ,[əyyam] "ایام" O, öncə Hud surəsinin ۶-cı ayəsini qeyd edərək üç sözü əyyam] mərhələlər, mövsümlər mənasını] "ایام" ,ma] sözlərini izah edir və bildirir ki] .(ifadə edir(٣)

:O, əsərin digər bir hissəsində yazır



---

.Mu`minun, ۱۸[۸۱] -۱

.İlk universitet və son peyğəmbər", c. ۱, səh. ۹۶"[۸۲] -۲

Yenə orada, səh. ۱۰۴. O, belə nəticə alır: Allah hər şeydən öncə ruhu, qüdrəti,[۸۳] -۳ nuru, mələkləri sonra isə (xalis) zülməti yaratdı. Bütün bunlar hədislərdə öz əksini tapmışdır. Demək olar ki, İslama görə öncə metafizik mərhələ (zəka, ruh və s.), sonra qüdrət və enerji, sonra su, daha sonra isə tüstü yaradılmışdır. Mövcud tüstü topaları bir-birinə toqquşaraq istilik yaratdı. Tədricən çox hərarətli oldular. Sonra fırtınalar .(nəticəsində kəhkəşanlar, ulduz sistemləri meydana gəldi (Həmin qaynaq, səh. ۱۱۴

Bioloqlar bir çox məsələlərdə fərqli, ziddiyyətli fikirlər irəli sürmüşlər. Yaradılışın" mərhələli təkamülü və s. bəzi məsələlərdə isə yekdil rəyə gəlmişlər. Bu mərhələlər :aşağıdakı şəkildə sıralanmışdır

Qaz-toz dumanlıqlarından (kütləsindən) sıra ilə kəhkəşanlar, Günəş sistemi və Yer yarandı. Öncə Yer əridilmiş şəkildə idi, sonra soyudu. O zaman yalnız cansız təbiət mövcud idi. Sonra su yarandı. Ardıcıl olaraq ilkin molekullar, bitkilər, heyvanlar, .sürünənlər, məməlilər ərsəyə gəldilər

:Doktor Həmid ən-Nəcdi Fussilət surəsinin ٩-١١-ci ayələri haqqında yazır .٧

Öncə alimlər Yer və göylərin eyni (kimyəvi) tərkibdən təşkil olunduğunu düşünürdülər." Lakin yeni elmi nailiyyətlər göstərir ki, Yer və digər planetlərin kimyəvi tərkibi fərqlidir. Yəni ulduzların ٢٩٪-i hidrogendən təşkil olunmuşdur. Lakin Yer ünsürlərdən, metallardan (təqribən yüz ünsür) təşkil olunmuşdur. Onların qənaətinə görə Yer və göylərin mənşəyi bir olsa da, öncə Yer, sonra isə ulduzlar yaranmışdır. Məlum ayələr .(də öncə Yerin, sonra isə göyün yaradıldığına işarə vurur"(١

Bu haqda digər alimlər də söhbət açmışlar. Bunlardan Hənəfi Əhməd(٢) və Əbd əl- .٨ .Mun`imin(٣) adını çəkmək olar

YEKUN

Dəyərli təfsirçi alimlərin Yer və göylərin yaradılışının mərhələləri haqqında qeydlərində .bir neçə məqama diqqət yetirmək zəruridir



---

.Doktor Həmid ən-Nəcdi, "əl-Ecaz əl-elmi fi-Quran əl-kərim", səh. ٩١-٩٤ [٨٤] -١
.Hənəfi Əhməd, "ət-Təfsir əl-elmi", səh. ١١٠, ١٢٨, ١٣١[٨٥] -٢
.Seyid Əbd əl-Munim, "Təfsir əl-ayat əl-kəvniyyə", səh. ٢٧ [٨۶] -٣

Ayələrdə Yer, göylər və onların arasındakı digər mövcudatın altı mərhələdə .١ yaradıldığı göstərilir. İki mərhələdə göylərin yaradılışı baş vermişdir. İki mərhələdə Yerin yaradılışı baş vermişdir. Növbəti iki mərhələdə isə Yer və göy arasında olanların yaradılışı baş vermişdir. Quran bu haqda ümumi işarələr vurmuş, təfərrüata .(mərhələlərin zaman fasiləsi və s.) varmamışdır

Tədricən baş verən şeylər haqqında mərhələli zaman təyin etmək mümkündür. Bu, .٢ şərti və nisbidir. Buna görə də müəyyən sabit bir mövzu ilə bağlı (misal üçün, bəşər elminin keçdiyi inkişaf yolu, incəsənətin yaranması və formalaşması və s.) fərqli mərhələli zaman haqqında danışmaq olar. Lakin bu fərqli bölgülər məsələyə hər biri bir ayrı baxımdan yanaşır. Bəzən bu bölgülər doğru və zəruridir. Onlar məsələnin qaranlıq tərəflərini aydınlaşdırırlar. Yaradılışın mərhələləri də belədir. Yəni Yer və göylərin yaradılış mərhələləri fərqli yönlərdən fərqli şəkildə bölünə bilər. Elmi nəzəriyyələrdə .(yaradılışın mərhələləri ilə bağlı fikir ayrılığının kökündə də bu dayanır(١)

Deməli, kosmologiya, biologiya və geologiya elmlərində yaradılışın mərhələləri Quran və ya müqəddəs kitabla fərqli şəkildə izah edilə bilər. Bu növ bölgülərin fərqliliyi elm və dinin ziddiyyəti demək deyil. Çünki hər bir bölgü məsələyə ayrı bir yöndən yanaşmışdır. Bu bir çox hallarda doğru və zəruridir. Başqa sözlə desək, dinlə elmin dili bu növ .məsələlərdə fərqlidir

səmavat və ərz] sözləri Quranda müxtəlif] ”سموات وارض“ Öncə də qeyd olunduğu kimi .٣ .mənalarda işlənmişdir

səh:۵۱

---

Bəzən bölgülərdə qazabənzər — maye — bərk, bəzən göy cisimləri (planetlər) [٨٧] -١ .— Yer — insan, bəzən isə canlı-cansız varlıqlar əsas götürülür

Ola bilər ki, yaradılışın mərhələləri ilə bağlı ayələrin hamısı bizim başa düşdüyümüz maddi göy və Yerə aid olmasın. Bir çox ayələrdə (Səcdə, ۴-۵) göy və Yerdən məqsədin mənəvi, metafizik anlayışlar, üstün və alçaq dərəcələr olması ehtimalı böyükdür. Bəzi .təfsirçilər bu ehtimala üstünlük vermişlər

Quranın, mövcud Tövratın, yunan filosoflarının və müasir (təcrübi) elmlərin . ۴ yaradılışın mərhələləri ilə bağlı irəli sürdüyü fikirləri müqayisə etdikdə Quranın önə çəkdiyi məsələlərin müasir elmin kəşfləri ilə uyğun gəldiyinin şahidi oluruq. Halbuki Tövratın və yunan filosoflarının fikirlərində bu adekvatlıq görünmür. Bu, Quranın .əzəmətinin, sədaqətinin göstəricisidir. Hansı ki, hər bir oxucunu heyrətə salır

Lakin bütün bunlar Quranın elmi ecazkarlığını sübuta yetirmir. Çünki yaradılışın ümumilikdə altı mərhələni keçməsi Qurandan öncə Tövratda da öz əksini tapmışdır. Təbii ki, o dönəmdə ərəblər yəhudilərlə birgə yaşayırdılar və onlar (Tövratda verilən bu bilgidən) xəbərdar idilər (Baxmayaraq ki, Quranda yeddinci gün — istirahət günü .(qeyd olunmamışdır

Quranda Yer və göylərin yaradılışı haqqında ümumi və qısa məlumat verilmişdir. .۵ Buna görə də onu bu və ya digər elmi nəzəriyyələrə qəti tətbiq etmək doğru olmazdı. Lakin əgər tüstüdən məqsədin qaz-toz dumanlıqları olmasını bir ehtimal kimi önə .çəksək, bu daha doğru olar

Ayətullah Məkarim Şirazinin qeyd etdiyi mərhələlər yaradılışın mərhələlərindən . ۶ söhbət açan ayələrlə uyğun gəlmir. Çünki onun öz nəzərinə görə birinci və ikinci mərhələ göylərin yaradılışına, üçüncü və dördüncü mərhələ Yerin yaradılışına, beşinci və altıncı mərhələ Fussilət surəsinin ۱۰-cu ayəsində göstərildiyi kimi

dağların, mədənlərin və qida maddələrinin yaradılışına aid olmuşdur. Bu mərhələlərdə heyvanların və insanın yaradılışından söhbət getməmişdir. Halbuki o, altıncı mərhələni heyvanların və insanın yaradılışı ilə bağlayır(١). Bu fikir Tövratda qeyd olunan .mərhələlərə daha uyğun gəlir

Qeyd: Ehtimal ki, Yer və göylərin yaradılışı altı mərhələdə, insanın yaradılışı isə ondan sonra gerçəkləşmişdir. Buna görə də Quranda məlum altı mərhələdə insanın yaradılışından söhbət açılmamışdır. Deməli, Allah Yerin yaradılışı sona yetdikdən sonra insanı torpaqdan yaratmışdır (Səcdə, ٨-٩), sonra isə bunu mələklərə də bildirdi .((Bəqərə, ٣٠

Doktor Biazar Şirazinin qeydləri haqqında deməliyik ki, birincisi, onun sözlərindən .٧ anlaşıldığına görə Günəş ayrıca bir mərhələdə yaradılmışdır. Halbuki Quran göylərin yaradılmasını iki mərhələdə qeyd etmişdir ki, Günəşin yaradılışı da həmin iki mərhələyə daxildir. İkincisi, o, elmi nəzəriyyələri Qurana tətbiq edərkən bunun yalnız bir ehtimal olduğunu bildirməliydi. Çünki elm və Qurana məlum bölgülərin əsası eyni .olmaya bilər və ya gələcəkdə elmi bölgü dəyişə bilər

Doktor Paknijadın fikirlərinə gəlincə bildirməliyik ki, o, yaradılışın metafizik . ٨ mərhələsini izah edərkən hədislərə əsaslanmışdır. Bu bizim mübahisə obyektimizə yaddır. Çünki burada haqqında danışdığımız mövzu Kainatın maddi yaradılışıdır. Bunun .altı günə heç bir aidiyyətı yoxdur

?Sual: Nə üçün mütləq qüdrətə malik Allah Kainatı bir anda yaratmadı



---

.Təfsiri-nümunə", c. ۶, səh. ٢٠٢; c. ٢٠, səh. ٢٢٢: "Pəyami-Quran", c. ٢, səh. ١۶۶-١۶٧" [٨٨] -١

:Cavab: Bu suala müxtəlif cəhətdən cavab vermək olar

a) Əgər Allah Kainatı bir anda yaratsaydı, insan yaradılışda nəzərdə tutulan proqramlılığı, elmi, qüdrəti, ahəngdarlığı dərk etməkdə çətinlik çəkərdi. Məlum mərhələli yaradılış burada nümayiş etdirilən ahəngdarlığı daha yaxşı nəzərə çarpdırır (Buna misal olaraq uşağın ana bətnində doqquz ay ərzində, mərhələli şəkildə dünyaya .(gəlməsini göstərmək olar)(۱

.b) Yaradılışda subyektin bacarığından başqa obyektin çıxarı da nəzərdə tutulmalıdır

Misal üçün, pəhləvanlıqda ad çıxarmış bir şəxs quru taxtanı (sınmamaq şərtilə) əyə bilməz. Burada subyektin (pəhləvanın) imkanları buna cavab verir. Lakin obyektin .(taxta) isə mövcud çıxarı, qabiliyyəti buna imkan vermir

Digər misala nəzər salaq: Çoxmərtəbəli bina tikmək üçün öncə onun özülünü qoymaq, (beton skeletini qurub) sütunlarını ucaltmaq, sonra isə bərkiməsi üçün gözləmək lazımdır. Tam quruyub möhkəmləndikdə isə işi davam etdirmək lazımdır. Burada mühəndis və işçi heyətin az bir zamanda tikmək bacarığı var. Lakin tikinti materialları bu sürətli işi qəbul edəcək dərəcədə yararlı deyillər. Əgər bu növ işlər tələsik görülsə, o .zaman lazımi keyfiyyət əldə oluna bilməz. Varlığın yaranması da bu qəbildəndir

**?QURAN DÜNYANIN GENİŞLƏNMƏSİ HAQQINDA NƏ DEYİR**

Bir çox alim və təfsirçilərin fikrincə Kainat daim genişlənməkdədir. Kəhkəşanlar (aralarındakı məsafəyə mütənasib olaraq) bir-birindən qarşılıqlı



---

.Ətraflı məlumat üçün bax: “Təfsiri-nümunə”, c. ۶, səh. ۲۰۳[۸۹] -۱

uzaqlaşmaqdadırlar. Bu məsələ ilə bağlı bəzi Quran ayələrinə istinad olunmuşdur. :Bunlar aşağıdakılardır

.(Biz göyü qüdrətimizlə yaratdıq və Biz onu genişləndirməkdəyik”(١“

(Biz Allahınıq və Ona tərəf qayıdacağıq!(٢

(Bil ki, bütün işlər axırda Allaha qayıdacaqdır!”(٣“

əyd] sözü qüdrət, bacarıq] ”أيـد“ .Birinci ayə Allahın yaradılışdakı əzəmətini açıqlayır mənalarını ifadə edir. Bu söz Quran ayələrində həmin mənada dəfələrlə işlənmişdir. .(Burada da Tanrının göylərin yaradılışındakı tam qüdrətinə işarə vurur(۴

İkinci ayə səbr edənlər haqqındadır. Onlar müsibətlə üzləşdikdə: Biz Allahınıq və Ona tərəf qayıdacağıq! - deyirlər. Yəni bütün nemətlər Allahdandır. Əlimizdən çıxdıqda narahat olmayaq. Bura əbədi qalacağımız yer deyil. Bu nemətlər keçici və kamillik .(üçün bir vasitədir(۵

Üçüncü ayə doğru yol haqqındadır (Bil ki, bütün işlər axırda Allaha qayıdacaqdır!). Bu ayə göstərir ki, doğru yol yalnız Allaha tərəf gedən yoldur. Əslində bu ayə təqvalılar (pəhrizkarlar) üçün müjdə, zalım və günahkarlar üçün hədədir. Çünki hamısının .(qayıdışı Allaha doğrudur(۶

## KAİNATIN GENİŞLƏNMƏSİ NƏZƏRİYYƏSİNİN QISA TARİXİ

Bir çox alimlər Kainatın genişlənməsi və bunun Quranda bildirildiyi haqda söhbət açmışlar. Burada belə



---

.Zariyat, ۴٧ [٩٠] -١

.Bəqərə, ١۵۶ [٩١] -٢

.Şura, ۵٣[٩٢] -٣

.Təfsiri-nümunə”, c. ٢٢, səh. ٣٧١, ٣٧٢“ [٩٣] -۴

.Yenə orada, c. ١, səh. ۵٢۵ [٩۴] -۵

nəzəriyyələrdən bir neçəsinə nəzər salmağı zəruri hesab edirik. Lakin öncə oxucunun diqqətinə çatdırmaq istəyirik ki, Kainatın genişlənməsi ilə bağlı iki nəzəriyyə :mövcuddur

;a) Kainatın sabit və sıxılan olması

:Böyük kosmoloq professor Uilyam yazır

Nyuton (۱۶۴۳-۱۷۲۷) və başqaları belə qənaətə gəlmişlər ki, sabit Kainat tezliklə cazibə“ qüvvəsinin təsiri nəticəsində sıxlaşmağa (yığılmağa) (mərkəzəqaçma təcili) .(başlayacaq”(۱

.b) Kainatın genişlənməsi

Kainat bütünlükdə yüz milyonlarla qalaktikadan ibarətdir. Bu qalaktikaların hər biri yüz milyonlarla ulduzu əhatə edir. Demək olar ki, onlar hamısı bizdən uzaqlaşmaqdadırlar. Bu, ulduzların görünən işıqlığını, parlaqlığını (ulduz ölçülərini) analiz (təhlil) edərkən .(məlum olmuşdur(۲

Bu həqiqəti ilk dəfə olaraq Hovell rəsədxanasının müdiri Slifer (doğum-۱۸۷۵) kəşf .(etmişdir. O, ۱۹۲۹-cu ildə ulduzların bizdən qaçdığını (uzaqlaşdığını) üzə çıxartmışdır(۳

səh:۵۶

---

.Stefn Uilyam, “Zamanın tarixçəsi”, səh. ۵۷ [۹۶] -۱

Yəni qırmızımtıl spektr (işıq şüaları, rəngli zolaq) mavi spektrdan daha çoxdur. Bu [۹۷] -۲ qırmızımtıllıq onlara qədər olan məsafəyə uyğundur. Başqa sözlə desək, bizdən uzaq .olan qalaktika daha sürətlə uzaqlaşmaqdadır

Elmlər tarixi”, səh. ۷۳۹. Bəzilərinə görə Kainatın genişlənməsi teoremi belçikalı“[۹۸] -۳ riyaziyyatçı George Lumther tərəfindən irəli sürülmüşdür. Bu nəzəriyyə elmi ictimaiyyət tərəfindən qəbul edildikdən sonra Palomar teleskopu müşahidələr üçün işə .(salındı (Məcid Yektai, “Yaradılışın tarixi”, səh. ۶۳

Ondan sonra Habbl ۱۹۲۹-cu ildə ulduzların fasiləsiz olaraq uzaqlaşdığını kəşf etdi(۱). Yəni bizdən bir milyon işıq ili məsafədə olan qalaktika saniyədə ۱۸۶ km, iki milyon işıq ili .(məsafədə olan isə iki qat sürətlə (۳۷۲ km/san) uzaqlaşır(۲

Bu gün artıq "Kainatın genişlənməsi" nəzəriyyəsi alimlər tərəfindən qəbul edilmişdir. Bu nəzəriyyəni Kainatın yaradılışı ilə bağlı fərqli fikirdə olmalarına baxmayaraq hamı .qəbul edir

**ELMİ SİRLƏR**

Alim və tədqiqatçıların Quran ayələri və Kainatın genişlənməsi nəzəriyyəsinin :uyğunluğu haqda qeydlərinə qısaca nəzər salaq

۱ . Ayətullah Məkarim Şirazi Zariyat surəsinin ۴۷-ci ayəsini izah edərkən "وإنا لموسعون" cümləsi ilə bağlı dörd ehtimalı qeyd edir:

;a) Allah tərəfindən (yağış vasitəsi ilə) bəndələrinə geniş (bərəkətli) ruzi verilməsi

;b) Allah tərəfindən bəndələrinə (istənilən vasitə ilə) ruzi verilməsi

c) Allahın ehtiyacsızlığı (Onun xəzinələri o qədər geniş və zəngindir ki, bəndələrinə əta ;(etməklə tükənmir

.ç) Allah göyləri yaratmış və fasiləsiz genişləndirməkdədir

:O, son ehtimala üstünlük verərək yazır

Öncəki cümlədə göylərin yaradılması ilə bağlı qeyd olunanlara, alimlərin "Kainatın genişlənməsi" ilə bağlı



---

۱- [۹۹] "Zamanın tarixçəsi", səh. ۵۸.

۲- [۱۰۰] "Atomdan ulduza qədər", səh. ۱۰۴; "Kosmos əsrinin biliyi", səh. ۱۹۶.

eksperimental qurğular vasitəsilə aparılan) vizual müşahidələrin də təsdiq etdiyi) kəşflərinə nəzərən ayə olduqca incə bir məna kəsb edir. Yəni Allah göyləri yaratmış və fasiləsiz genişləndirməkdədir. Başqa sözlə desək, bir qalaktikada yerləşən ulduzlar .((təsəvvür olunmaz) sürətlə mərkəzdən uzaqlaşırlar"(١

Sonda isə kosmologiya alimlərinin "Kainatın genişlənməsi" ilə bağlı söylədiklərindən .çoxlu sayda dəlillər göstərir

:Müasir yazıçılardan biri bu haqda yazır .٢

Bütün qalaktikalar, böyük və kiçik göy cisimləri (planetlər, peyklər) yüksək sürətlə bir-" birlərindən uzaqlaşırlar. Onların sürəti insanda təəccüb doğurur. Onlar saniyədə ٦٠٠٠٠ km-ə qədər naməlum istiqamətə doğru hərəkətdədirlər. Ehtimal ki, bu, Biz Allahınıq və Ona tərəf qayıdacağıq! ayəsinin və ya "Bil ki, bütün işlər axırda Allaha qayıdacaqdır!" ."deyə buyuran başqa bir ayənin bariz nümunəsidir

:O, Zariyat surəsinin ٤٧-ci ayəsini izah edərkən yazır

Bəli, Quran hələ adi binoklların, böyük teleskopların (optik cihazların) mövcud" .(olmadığı bir dönəmdə Kainatın genişlənməsini açıqlamışdır"(٢

Doktor Maurice BucailleZariyat surəsinin ٤٧-ci ayəsini və "Kainatın genişlənməsi" .٣ :nəzəriyyəsini qeyd edərək belə nəticə alır

.(Bu ayə) Kainatın genişlənməsini tam aydınlığı ilə açıqlayır"(٣)"



---

.Təfsiri-nümunə", c. ٢٢, səh. ٩٧٣" [١٠١] -١

Əbd əl-Fəttah Təbar, "Qurana bir baxış", səh. ١٨٨; Sədr əd-Din Bəlaği, "Quran [١٠٢] -٢ .qissələri", səh. ٣٠٧

.Doktor Maurice Bucaille, "Tövrat, İncil və Quranın müqayisəsi", səh. ٢٢٥-٢٢٦ [١٠٣] -٣

O, Quranın digər tərcümələrinə, xüsusilə şərqşünas Regis Blachere-in tərcüməsinə əvsə`] felindən törəmişdir və] "اوسـع" musiun] ifadəsi] "موسـعون" :irad tutaraq yazır genişləndirmək mənasını ifadə edir. Blachere isə yanlış olaraq "biz olduqca .(səxavətliyik" kimi tərcümə etmişdir"(١

Ayətullah Mərifət Zariyat surəsinin ۴٧-ci ayəsini izah edərkən "Kainatın . ۴ genişlənməsi" nəzəriyyəsini önə çəkir və çoxsaylı dəlillər göstərərək qəbul edir. .(Ruzinin artırılması ehtimalını isə ayənin məcazi mənası hesab edir"(٢

YEKUN

.Burada bir neçə məqama diqqət yetirməyi zəruri hesab edirik

İkinci (Bəqərə, ١۵۶) və üçüncü (Şura, ۵٣) ayələr ilkin zahiri mənaları etibarı ilə . ١ ."Kainatın genişlənməsi" nəzəriyyəsinə uyğun deyil. Yazıçının verdiyi ehtimal əsassızdır

Birinci ayəyə (Zariyat, ۴٧) gəlincə, ən uyğun versiya dördüncü versiya, yəni göylərin .٢ fasiləsiz genişlənməsidir. Bu elmi məsələnin İslamın erkən çağlarında alimlərə və adi insanlara məlum olmadığını, hətta on yeddinci əsrdə Nyuton kimi böyük bir alimin bunun əksini düşünməsini nəzərə alsaq, Quranın məlum elmi sirri açılmaqla öz .əzəmətini və Peyğəmbərin (s) sədaqətini sübut etdiyini söyləyə bilərik

Kainatın genişlənməsi" nəzəriyyəsinin Zariyat surəsinin ۴٧-ci ayəsi ilə qovuşması" .٣ ?Quranın elmi ecazkarlığına sübutdurmu

səh:۵٩

---

.Yenə orada [١٠۴]-١

.Ət-Təmhid fi ulum əl-Quran", c. ۶, səh. ١١١-١١۴"[١٠۵]-٢

Əgər məlum nəzəriyyə qəti şəkildə isbat olunarsa, o zaman Quranın elmi ecazkarlığını da sübuta yetirmiş olar. Lakin nəzərə alsaq ki, elmi nəzəriyyələr sabit deyil və yanlışlıq ehtimalı var, o zaman "Kainatın genişlənməsi" nəzəriyyəsini Qurana aid edib elmi ecazkarlıq kimi qələmə vermək olmaz. Belə olan halda ayənin məlum nəzəriyyə ilə .uyğunluğunu bir ehtimal kimi önə çəkmək mümkündür

## CAZİBƏ QÜVVƏSİ QURANIN ELMİ MÖCÜZƏSİ KİMİ

Cazibə qüvvəsi və ya Ümumdünya Cazibə Qanununa görə bütün böyük və kiçik cisimlər bir-birinə qarşılıqlı təsir göstərərək cəzb edir. Bəzi elm adamlarının, .təfsirçilərin fikrincə, Quranda bir neçə ayədə cazibə qüvvəsinə işarə vurulmuşdur

اللّهُ الَّذِی رَفَعَ السَّمَاوَاتِ بِغَیْرِ عَمَدٍ تَرَوْنَهَا

.(Göyləri gördüyünüz dirək olmadan yüksəldən ... məhz Allahdır"(١"

.(Allah, göyləri görə bilmədiyiniz bir dirək olmadan xəlq etmişdir"(٢"

(Məgər Biz Yeri cəzb edən etmədikmi?"(٣"

Həqiqətən, Allah göyləri və Yeri zaval tapmasınlar (öz mehvərindən çıxmasınlar)" deyə, tutub saxlayır. Əgər öz mehvərindən çıxsalar, Ondan başqa onları heç kəs tutub (saxlaya bilməz. Doğrudan da, (Allah) həlimdir, bağışlayandır!"(۴

səh:۶۰

---

.Rə`d, ٢ [١٠۶] -١

.Loğman, ١٠[١٠٧] -٢

Mursəlat, ٢۵. Bəzi tərcüməçilər bu ayəni"Məgər Biz Yeri məskən (toplanılan [١٠٨] -٣ .(məkan) etmədikmi?"kimi tərcümə etmişlər (Fuladvənd

.Fatir, ۴١. Həcc surəsinin ۶۵-ci ayəsi də həmin məzmundadır [١٠٩] -۴

Yuxarıda qeyd olunan ayələr Allahın nişanə və nemətlərini sayır ki, insanlar Allaha, Qiyamət gününə iman gətirsinlər (Rəd, ٢) və Allahdan qeyrisinin bu növ nemətlər yarada bilməyəcəyini görsünlər (Loğman, ١٠). Ayələr insanlara çatdırıldıqdan sonra .(təkzib edənlərin sonu heç də yaxşı olmayacaq (Mursəlat, ٢٥

təravnəha] cümləsi isə iki cür] "ترونها" .əməd] sözü sütun mənasını ifadə edir] "عمد " .٢ əməd]] "عمد" təravnəha] qrammatik baxımdan] "ترونها" izah edilir. Birinci izaha görə sözünün "sifət"idir. Yəni "göyləri görünməyən sütunlarla ucaltdıq". Bu izaha əsasən, bi-] "بغير عمد" göylər gözlə görünməyən sütunlar üzərində dayanmışdır. İkinci izaha görə təravnəha] cümləsi ilə əlaqəlidir. Yəni] "ترونها" ğeyri əmədin] ifadəsi bilavasitə təravnəha] cümləsini] "ترونها" gördüyünüz kimi göylər sütunsuzdur. Əlbəttə, bəziləri .(mötərizə cümləsi hesab etmiş və ikinci nəzəriyyəyə üstünlük vermişlər(١

## QISA TARİX

Bəzilərinin fikrincə (Quran ayələri və Əhli-beytdən (ə) gələn hədislərdən sonra) ilk dəfə olaraq cazibə qüvvəsini Əbu Reyhan Biruni (h.q. ۴۴٠) önə çəkmişdir(٢). Lakin bu gün Ümumdünya Cazibə Qanunu Nyutonun adı ilə



---

.Misbah Yəzdi, "Quran maarifi", səh. ٢۴٩ [١١٠] -١
.Quranın heyrətləndirici məsələləri", səh. ۴١"[١١١] -٢

bağlıdır(۱). Almanın ağacdan yerə düşməsi və Nyutonun fikrinin cazibə qüvvəsinə (yönəlməsi məşhur hadisədir(۲

:Nyuton ümumi qanunlara əsaslanaraq göy cisimlərinin hərəkətini belə izah edir

a) Ümumdünya Cazibə Qanununa görə bütün cisimlər bir-birini qarşılıqlı cəzb edir. Bu cəzbetmə iki şeylə bağlıdır; kütlə və məsafə (cisimlər öz kütlələri ilə düz, aralarındakı məsafənin kvadratı ilə tərs mütənasibdirlər). Cismin kütləsi nə qədər böyük olsa, onun cazibəsi də bir o qədər çox olur(۳). Lakin cisimlərin məsafəsi çoxaldıqca cazibənin təsiri azalır (məsafənin kvadratına nisbətən cazibə qüvvəsi də azalır). Misal



---

İsaak Nyuton (۱۶۴۳-۱۷۲۷) məşhur ingilis riyaziyyatçısı və astronomu. O, [ ۱۱۲] -۱ Ümumdünya Cazibə Qanununu formulə etmiş, sonsuz kiçik ədədlərin təhlilinin əsasını qoymuş və işığın dispersiyasını, difraksiyasını, interferensiyasını kəşf etmişdir. Ən .məşhur əsəri “Natural fəlsəfənin riyazi əsasları” adını daşıyır

Bu hadisə “Uzaq dünyalar” (səh. ۴۲, ۲۰۱), “Ulduzlar dünyası” (səh. ۱۵۰) və[ ۱۱۳] -۲ “Sivilizasiya qəhrəmanları” (səh. ۱۸۲) kitablarında qeyd edilmişdir. Guya həmin ağac ۱۸۱۴-cü ildə qurusa da onun bir calağını Kembric kollecinin Nyuton bağında əkdilər. Lakin “Elmlər tarixi” kitabı (səh. ۲۶۲) bu hadisənin doğruluğunu şübhə altına alır.Bəzilərinin fikrincə Ümumdünya Cazibə Qanununun kəşfi ilk olaraq Nyutonla bağlı deyil. Çünki cazibə qüvvəsi ondan öncə Kopernik və Keplerin də diqqətini çəkmişdir. Lakin Nyuton onu formulə etmişdir (Elmlər tarixi”, səh. ۲۶۴; “Kosmos əsrinin biliyi”, səh. .(۴۴

Misal üçün, Günəşin kütləsi Yerin kütləsinin ۳۳۰ min bərabəridir. Buna görə də [۱۱۴] -۳ Günəşin cəzbetmə qüvvəsi Yerdən ۳۳۰ min dəfə çoxdur və Yer onun cazibəsinin təsiri altındadır. Yerin kütləsi isə Ayın kütləsindən ۸۱ dəfə çox olduğundan Ay Yerin .cazibəsinin təsiri altına düşüb ətrafında dövr edir

.üçün, əgər məsafə iki bərabərdirsə, cazibə qüvvəsi dörd bərabər az olur

b) Mərkəzdənqaçma qanununa görə bu və ya digər cisim bir mərkəz ətrafında hərəkət edirsə, təbii olaraq həmin cisimdə mərkəzdənqaçma qüvvəsi yaranır. Misal üçün, ipə bağlanmış cisim üfüqi müstəvidə fırlandıqda (ip cismə mərkəzə qaçma qüvvəsi ilə) .cisim isə ipə mərkəzdənqaçma ilə təsir edir

Yerin, planetlərin, peyklərin və göy cisimlərinin öz orbitində və bir-birinin ətrafında hərəkəti iki qanunun - Cazibə və Mərkəzdənqaçma qüvvələrinin tərkibi nəticəsində gerçəkləşir. Bu iki qüvvə göy cisimlərini öz orbitində saxlayır, toqquşmalarının, .sürtünmələrinin qarşısını alır

**ELMİ SİRLƏR**

Sözügedən Quran ayələrinin müasir astronomiyanın kəşfləri ilə qovuşması haqqında :bir çox elm adamları, təfsirçilər bəhs etmişlər

;(بِغَيْرِ عَمَدٍ تَرَوْنَهَا) a) Birinci və ikinci ayələrin elmi sirləri

Ayətullah Məkarim Şirazi hər iki ayəni izah edərkən onun elmi tərəflərini də izah edir .١ və bunu Quranın elmi möcüzələrindən hesab edir. O, ayənin məlum iki izahını qeyd .etmiş, birinci izaha üstünlük vermişdir

tərəvnəha] cümləsinin qeydi olduğunu söyləmək] "تروتها" (əməd] sözünün] "عمد") Onun" göylərin görünməz sütunlarının olmaması deməkdir. Halbuki ayə sütunların olduğunu, ."lakin gözlə görünmədiyini bildirir. Bu, cazibə qüvvəsini bəyan edən ən incə təbirdir

.O, sözlərini İmam Rzadan (ə) nəql olunan bir rəvayətlə əsaslandırır

Hüseyn ibn Xalid deyir: İmam Rzadan (ə) soruşdum: Allahın Quranda buyurduğu bu ?ayənin (Yolları olan göyə and olsun!) mənası nədir

."Həzrət (ə) buyurdu: "Bu göyün Yerə doğru yolları var

Göyün Yerlə əlaqə yolları ola bilərmi? Bir halda ki, digər ayədə göylərin sütunsuz — .olduğu bildirilir

?Qəribədir Allah “müşahidə olunmayan sütunlar” buyurmurmu —

!Bəli —

.(Deməli, sütunlar var; lakin siz görmürsünüz(۱ —

Əlbəttə, bu ayə və hədislər o zamanın astronomik təfəkkürü ilə — Ptolomey təlimi ilə .(ziddiyyət təşkil edirdi(۲

Ayətullah Hüseyn Nuri Rəd surəsinin ۲-ci ayəsini həmin şəkildə izah etmiş və İmam .۲ :Rzadan (ə) nəql olunan məlum hədisi sübut olaraq göstərmişdir. O, yazır

Sütunla ona dayanan cisim arasında uyğunluq olmalıdır. Cismin ağırlığı qədər sütunun“ da dayanıqlılığı olmalıdır. Buna görə də göy cisimlərinin hərəkəti ilə bağlı cazibə və digər qanunlar dəqiq hesablanılmış və göy cisimlərini milyard illər boyu öz orbitində saxlaya bilmişdir. Bütün bunlar göstərir ki, Quranın bəşər səadətinin bələdçisi olan .(ifadələri nə qədər ecazkar və incədir”(۳

Bəzi müasir yazıçılar da məlum iki ayəyə istinad edərək görünməz sütunun cazibə .۳ qüvvəsi olduğu qənaətinə gəlmişlər. Quran Nyutondan əsrlər öncə bu sirrin üstünü .(açmışdır (İmam Rzadan (ə) nəql olunan məlum hədisə də istinad etmişlər)(۴

:Ayətullah Misbah Yəzdi ayənin iki izahını qeyd etdikdən sonra yazır .۴



---

.Təfsiri-bürhan”, c. ۲, səh. ۲۷۸“ [۱۱۵] -۱

.Təfsiri-nümunə”, c. ۱۷, səh. ۲۹, c. ۱۰, səh. ۱۱۰, ۱۱۱; “Pəyami-Quran”, c. ۸, səh. ۱۴۶“ [۱۱۶] -۲

.Kosmos əsrinin biliyi”, səh. ۵۵, ۵۶“ [۱۱۷] -۳

.Quranın heyrətləndirici məsələləri”, səh. ۴۱, ۴۶“ [۱۱۸] -۴

Hər halda hər iki izah doğru ola bilər. İkisindən birinin istisna edilməsinə bir əsas“ yoxdur”(۱).

۵. Digər müasir alim və yazarlar da məlum iki ayəyə istinad edərək cazibə qüvvəsi haqqında ətraflı söhbət açmışlar. Belə alimlərdən Məhəmməd Həsən Hitu(۲), Ayətullah Mərifət(۳) və Lətif Raşidinin(۴) adını çəkmək olar.

b) Üçüncü ayənin elmi sirləri “كفاتا” [kifatən](۵);

۱. Ayətullah Misbah Yəzdi yuxarıdakı ayə haqqında yazır:

“كفاتا” [kifatən] əşyanın toplaşdığı məkan mənasını daşıyır. Onun mənasında almaq (tutmaq), əlavə etmək anlayışları da var. Elə buradan da Yerin digər şeyləri özünə cəzb etməsi anlaşılır. Bu, Yerin cazibə qüvvəsinə də aid ola bilər. Əgər bu cazibə “كفاتا” [[kifatən], olmasaydı, Yer üzərindəki bütün şeylər fəzaya səpələnərdi. Əlbəttə surət mənasında da işlədilir. Lakin bu məna işlək deyil(۶).

۲. Digər elm adamlarından biri “كفات” [kifat] sözündən bir neçə məsələnin başa düşüldüyünü qeyd edir. Yerin öz oxu ətrafında və (Günəş ətrafına) orbital hərəkəti, hərəkətinin sürəti, yeraltı mayelərin və ya əriyən maddələrin mövcudluğu, Yerin səthində və nüvəsində (daxili hissəsində) gedən dəyişikliklər və Yerin cazibə qüvvəsi(۷).



---

۱- [۱۱۹] “Məhəmməd Təqi Misbah Yəzdi, “Quran maarifi”, səh. ۲۴۷-۲۴۸.

۲- [۱۲۰] Bax: “Möcüzə əl-Quraniyyə”, səh ۱۸۰.

۳- [۱۲۱] Bax: “Ət-Təmhid fi-ulum əl-Quran”, c. ۶, səh. ۱۲۲-۱۲۸.

۴- [۱۲۲] “Quranda təbiət elmlərinə bir baxış”, səh. ۵۰.

۵- [۱۲۳] “Mursəlat”, ۲۵.

۶- [۱۲۴] “Quran maarifi”, səh. ۲۵۴.

۷- [۱۲۵] Yədullah Niyazmənd Şirazi, “Quranın bugünkü ecazkarlığı”, səh. ۸۸-۹۹.

٣. Müasir yazıçı və təfsirçilərdən biri də bu ayənin Cazibə qanunu haqqında olduğunu önə çəkmişdir(١).

c) Dördüncü ayənin elmi sirləri (Allah göyləri və Yeri zaval tapmasınlar (öz mehvərindən çıxmasınlar) deyə, tutub saxlayır)(٢).

١. Ayətullah Hüseyn Nuri cazibə qüvvəsi haqqında geniş bəhs etdikdən sonra bu ayəyə istinad edir(٣).

٢. Bəzi müasir yazıçılar bu ayəni izah edərkən yazırlar:

“Bu saxlamaqdan məqsəd “Ümumdünya Cazibə Qanunu” deyil. Bu, Allah tərəfindən göy cisimlərinin arasında yerləşdirilmişdir ki, öz orbitlərindən çıxmasınlar”(٤).

٣. Bəzi təfsirçilər yuxarıdakı ayəni iki cür izah etmişlər:

Birinci izah: Ayə varlıq aləminin müvazinətinin, ahəngdarlığının qorunması haqqında söhbət açır.

İkinci izah: Göy cisimləri milyon illərdir ki, öz orbitlərində hərəkət edirlər. Bu cazibə və mərkəzdənqaçma qüvvələrindən qaynaqlanır(٥).

YEKUN

“Ümumdünya Cazibə Qanunu”nun məlum ayələrlə üst-üstə düşməsi haqqında bir neçə məqamı diqqətdən qaçırmaq lazım deyil.

١. Birinci və ikinci ayənin cazibə qüvvəsi kimi təfsir olunması haqda aşağıdakıları demək olar. Birincisi, “عمد” [əməd] sözü isimin cəm halı olub sütun

səh:٦٦

---

١- [١٢٦] Doktor Sadiqi, “əl-Furqan fi təfsir əl-Quran”, c. ٢٩, səh. ٣٤١.
٢- [١٢٧] “Fatir”, ٤١.
٣- [١٢٨] “Kosmos əsrinin biliyi”, səh. ٥٥.
٤- [١٢٩] “Quranın heyrətləndirici məsələləri”, səh, ٤٣.

deyil, sütunlar mənasını ifadə edir. Bunu cazibə qüvvəsinə aid etmək mümkündür. Lakin ola bilər ki, ayədə yalnız cazibə deyil, bir neçə fərqli qüvvədən söhbət getsin və əməd] sözünü yalnız cazibə] "عمـــد" gələcəkdə elmə məlum olsun. Bu səbəbdən .qüvvəsinə aid etmək yanlışdır

səma] Quranda fərqli mənalarda] "سما" İkincisi, ötən bəhslərdə də qeyd etdiyimiz kimi işlənmişdir (yuxarı, atmosfer, göy cisimləri, ulduzlar, planetlər və s). Ayənin cazibə .qanunu haqqında olması "səma"dan məqsədin göy cisimləri olması ilə bağlıdır

Loğman surəsinin ١٠-cu ayəsindəki ümumi vəziyyətə nəzər saldıqda görürük ki, göydən yağış yağması haqqında danışır və göyləri Yerlə qarşılıqlı şəkildə işlədir. Rəd surəsinin ikinci ayəsində göylərin ardınca Günəşdən, sonra isə (sonrakı ayədə) Yerdən söhbət açır. Bütün bunlar göstərir ki, "səma"dan məqsəd göy cisimləri və ya .atmosferdir

.Dördüncü ayə haqqında da bir neçə məqama nəzər salmaq zəruridir .٢

.Birincisi, burada da "səma"dan məqsədin göy cisimləri olduğunu fərz etməliyik

.İkincisi, Allahın göyü və Yeri cazibə qüvvəsi ilə saxladığını qəbul etməliyik

Əlbəttə, Allah göyləri və Yeri müxtəlif vasitələrlə, fərqli qüvvələrlə saxlamaq iqtidarındadır. Cazibə qüvvəsi isə onlardan yalnız biridir. Deməli, məlum ayəni yalnız .cazibə qüvvəsinə aid etmək doğru deyil

.Üçüncüsü, bu ayənin iki izahı var. Bunlardan yalnız biri cazibə qüvvəsi ilə qovuşur

.(كفاتا) Üçüncü ayə .٣

kifat] sözü leksik baxımdan iki məna - toplaşmaq və sürət mənalarını ifadə edir.] "كفات" Bəziləri onu

insanların Yerdə toplaşması (ölü və ya diri) kimi, bəziləri Yerin hərəkəti, bəziləri isə kifatən] ifadəsinin cazibə qüvvəsi kimi] ”كفاتا“ ,cazibə qüvvəsi kimi izah etmişlər. Deməli izah olunması bir neçə ehtimaldan yalnız biridir. Bunu qəti olaraq ayəyə aid etmək .(olmaz(۱

Qeyd: Birinci və ikinci ayələrin cazibə qüvvəsi haqqında olması məqsədəuyğun olsa da yalnız ona aid deyil. Yəni cazibə qüvvəsi ayənin real nümunələrindən sadəcə biridir. Amma hər halda bu Quranın elmi sirlərindən hesab olunur. Quranın nazil olduğu dönəmdə adi insanlara və alimlərə məlum olmayan bir elmi məsələyə aydınlıq .gətirmək Quranın elmi möcüzələrindən biri ola bilər

## GÜNƏŞİN HƏRƏKƏTİ QURANIN ELMİ MÖCÜZƏLƏRİNDƏN BİRİ KİMİ

Günəş Allahın Quranda and içdiyi ilahi nişanələrdən biridir(۲). Bir çox ayələrdə Günəş və onun hərəkəti haqqında söhbət açılmışdır. Elə buna görə də əksər təfsirçilər, nəzəriyyəçi və astronomlar bu haqda fikir yürütmüşlər. Bu haqda aşağıdakı ayələrə .istinad olunmuşdur

Gecə də onlar üçün (qüdrətimizə) bir dəlildir. Biz gündüzü ondan sıyırıb çıxardan kimi“ onlar zülmət içində olarlar. Günəş də (qüdrət əlamətlərimizdən biri kimi) özü üçün müəyyən olunmuş yerdə seyr edər. Bu, yenilməz



---

Əllamə Təbatəbai və Ayətullah Məkarim Şirazi kimi böyük təfsirçilər bu ehtimal[۱۳۱] -۱ haqqında söhbət açmamış, ayəni insanların Yerdə toplaşması kimi açıqlamışlar. .“Təfsiri əl-mizan”, c. ۲۰, səh. ۱۶۸; “Təfsiri-nümunə”. ۲۵, səh. ۴۴, ۴۱۲

.Şəms, ۱[۱۳۲] -۲

.(qüvvət sahibi olan, (hər şeyi) bilən Allahın təqdiridir (əzəli hökmüdür)"(١

Nə günəş aya çatar, nə də gecə gündüzü ötə bilər. (Günəş, ay və ulduzların) hər biri" .((özünə məxsus) bir göydə (öz hədəqəsində, öz dairəsində) üzər"(٢

Gecəni və gündüzü də, Günəşi və Ayı da yaradan Odur. Onların (həmçinin ulduzların)" hər biri (özünə məxsus) bir göydə üzür (öz hədəqəsində, öz dairəsində hərəkət .(edir)"(٣

Müəyyən vaxta (dünyanın axırına – qiyamətə) qədər (səmada) dolanan Günəşi və Ayı" .(ram edən ... məhz Allahdır"(۴

Daim öz hədəqəsində, özləri üçün müəyyən olunmuş yerdə) seyr edən Günəşi və Ayı,)" .(həmçinin gecəni və gündüzü sizin ixtiyarınıza verən Odur"(۵

## QISA TARİX

Günəş hər gün gördüyümüz bir ulduzdur. Onun (şərqdən qərbə) gündəlik aldadıcı(۶) hərəkəti hər bir insanın diqqətini cəlb edir. İnsanlar əsrlər boyu Günəşin Yer



---

.Yasin, ٣٧, ٣٨[١٣٣] –١

.Yasin, ۴٠[١٣۴] –٢

.Ənbiya, ٣٣[١٣۵] –٣

.Rə`d, ٢; Fatir", ١٣; Zumər, ۵[١٣۶] –۴

.İbrahim, ٣٣[١٣٧] –۵

Günəşin şərqdən qərbə gündəlik hərəkəti aldadıcıdır. Çünki Yerin qərbdən [ ١٣٨] –۶ şərqə hərəkəti yerdəki müşahidəçini yanıldır və o, Günəşin hərəkət etdiyini güman .edir

ətrafında dövr etdiyini düşünmüşlər. Mürəkkəb Ptolomey təlimləri də bu geosentrik sistem üzərində qurulmuşdu. Onun təlimlərinə görə Yer dünyanın mərkəzidir. O, sabitdir və bütün planetlərin mərkəzidir (Bütün göy cisimləri onun ətrafında dövr edir).

Ptolomey təlimləri on yeddi əsr bəşərin düşüncəsini əsarət altına aldı. Ondan sonra Kopernik (١٥٤۴) yeni astronomik fikir (heliosentrik sistem) irəli sürdü. Onun yeni təliminə görə Yer Günəş ətrafında dövr edirdi. Lakin o, Yerin dairəvi şəkildə hərəkət etdiyini bildirirdi. Onun fikirlərini davam etdirən Kepler (١۶٥٠) isə Yerin elliptik (ellipsşəkilli) hərəkətini kəşf etdi. Sonradan bu iki görkəmli astronomun fikirləri Qalileyin müşahidələri ilə təsdiq olundu və Günəş sisteminin yeni heliosentrik mənzərəsi əsaslandırıldı. Bu təlimə görə bütün planetlər, istər daxili planetlər — Merkuri, Venera, Yer və Mars — istərsə də xarici planetlər — Yupiter, Saturn, Uran, Neptun və Pluton — Günəş ətrafında dövr edir. Lakin bu hələ son demək deyildi. Çünki astronomlar (hətta Kopernik, Kepler və Qaliley də) Günəşin sabit olduğunu düşünürdülər. Belə ki, məhkəmədə Qalileyin əleyhinə oxunan iddianamədə onun (Müqəddəs kitaba qarşı çıxaraq) Günəşin sabit olduğuna inanmaqda ittiham olunduğu bildirilirdi(١).

Zaman keçdikcə Günəşin də hərəkət etdiyi üzə çıxdı və bəlli oldu ki, Günəş bir neçə şəkildə hərəkət edir.



---

١- Arthur Koestler, "Lunatiklər" (səh. ٥٩٠), "Quranın heyrətləndirici məsələləri" (səh.[١٣٩] ٢۴), "Təkamülün yolu", (c. ٥, səh. ٩), İslam və astronomiya" (səh. ١٧٩) kitablarında Kopernikin Günəşin dünyanın mərkəzi və sabit olduğu haqqındakı fikri belə izah edilir ki, guya o, Günəşi Yerə nisbətdə (Günəş sistemi daxilində) hərəkətsiz hesab edirdi.

Birinci: Günəş öz ekvatorunda təqr. ۲ km/san sürətlə fırlanır. Günəşin ekvatorunda .fırlanma müddəti ۲۵ sutka, qütblərin yaxınlığında ۳۰ sutkadır

İkinci: Günəş Günəş sistemi ilə birgə göyün Cənub yarımkürəsindən şimal .yarımkürəsinə doğru ۱۹,۵ km/san sürətlə hərəkət edir

.(Üçüncü: Günəş ۲۲۵ km/sansürətlə qalaktika mərkəzi ətrafına dövr edir(۱

Əlbəttə, ixtisas üzrə kitablarda Günəşin digər hərəkətlərindən də (ekliptika üzrə .görünən illik hərəkəti və s.) söhbət açılmışdır

**ELMİ SİRLƏR**

.Günəşin hərəkəti ilə bağlı fikirlərinə görə təfsirçilər iki yerə bölünürlər

Birinci: Keçmiş təfsirçilər

Keçmiş təfsirçilər erkən çağlardan Günəşin hərəkəti ilə bağlı ayələri başa düşməyə çalışmışlar. Bir tərəfdən Ptolomey təlimləri bəşər təfəkkürünə kölgə salmış, digər tərəfdən isə Quran ayələrinin ilkin mənaları (Günəş və Yerin öz orbitləri üzrə hərəkətləri haqqında) Ptolomey təlimləri ilə qovuşmurdu. Buna görə də təfsirçilər məlum ayələrin ilkin zahiri mənasının əksinə olaraq Ptolomey təlimlərinə uyğun şəkildə (Günəşin yerdəki müşahidəçinin hiss etdiyi gündəlik aldadıcı hərəkəti kimi) izah .etməyə başladılar

:Görkəmli şiə təfsirçisi Təbərsi (h.q. ۵۴۸) yazır



---

Şəhristani, "İslam və astoronomiya", səh. ۱۸۰; Hüseyn Nuri, "Kosmos əsrinin[۱۴۰] -۱ biliyi", səh. ۲۶; "Uzaq dünyalar", səh. ۲۹۳; "Elmlər tarixi", səh. ۳۴۷; "Ulduzlar dünyası", .səh. ۱۴۶

Günəşin qərarlaşacağı yer haqqında bir neçə nəzəriyyə var. Bəzilərinə görə Günəş“ dünyanın sonuna qədər hərəkət edəcək. Bu rəyə görə Günəşin qərarlaşacağı məkan .”...yoxdur. Digər bir versiyaya görə Günəş müəyyən bir zamanadək hərəkətdə olacaq

:haqqında yazır ( كُلٌّ فِى فَلَكٍ يَسْبَحُونَ ) Şəhristani Yasin surəsinin ۴۰-cı ayəsi

Bu ayənin zahiri mənası antik astornomiya ilə uyğun deyil. Elə buna görə də keçmiş“ yəsbəhun] sözünü də mütləq] ”يسبحون“ ,təfsirçilər ayəni məcazi mənada izah etmiş .”hərəkət kimi başa düşmüşlər. Yəni hər bir ulduz öz orbiti üzrə hərəkətdədir

:haqqında yazır (وَالشَّمْسُ تَجْرِى لِمُسْتَقَرٍّ لَّهَا) Yasin surəsinin ۳۸-ci ayəsi

Keçmiş alimlər bu ayəyə əsaslanaraq Günəşin gündəlik xəyali (gündoğandan“ mustəqərr]] ”مستقر“ günbatana doğru) hərəkətini onun kütləsi ilə bağlamışlar. Lakin sözünün izahında böyük fikir ayrılığı yaranmışdır... Bəzilərinə görə Günəş Qoç bürcündə qərarlaşana qədər hərəkət edəcək (yanlış versiyadır). Bəziləri isə Günəşin .(öz orbiti üzrə hərəkət etdiyini önə çəkmişlər”(۱

Qəribə burasıdır ki, “Təfsiri-nümunə”nin müəllifi də məlum ۴۰-cı ayəni izah edərkən ayədə məqsədin Günəşin yerdəki müşahidəçi tərəfindən hiss edilən xəyali hərəkəti olduğu ehtimalını da digər ehtimallarla yanaşı qeyd edərək rədd etməmişdir(۲). Bir halda ki, məlum ayələr Allahın nişanələrini sayır və xəyali, aldadıcı hərəkət Tanrının .(nişanələrindən ola bilməz(۳



---

.(İslam və astronomiya”, səh. ۱۸۳, ۱۸۵ (ixtisarla“[۱۴۱] -۱

.Təfsiri-nümunə”, c. ۱۸, səh. ۳۸۴-۳۸۹“[۱۴۲] -۲

Onun bu ehtimalı sükutla qarşılaması təəccüb doğurur. Çünki Quranda Günəşin[۱۴۳] -۳ məlum xəyali hərəkəti haqqında söhbət açıldıqda buyurur: “Günəşin doğduğu zaman onların mağarasının sağ tərəfinə meyl etdiyini, batdığı zaman isə onları tərk edib sol tərəfə yönəldiyini, onların da mağaranın ortasında geniş bir yerdə olduqlarını təra] ifadəsi ilə başlayır, yəni görərdin, güman] ”ترى“ görərdin” (Kəhf, ۱۸). Bu cümlə edərdin. Lakin həqiqi hərəkətdən söhbət açıldıqda buyurur: “Günəş də (qüdrət

əlamətlərimizdən biri kimi) özü üçün müəyyən olunmuş yerdə seyr edər”.Xəyali .hərəkəti göstərəcək bir söz işlətmir

İkinci: Müasir təfsirçilər

Yeni astronomiyada Yerin Günəş ətrafına fırlanması və Günəşin öz orbiti üzrə hərəkəti isbat edildikdən sonra Günəşin hərəkəti ilə bağlı ayələrin yeni mənaları üzə çıxdı. Mütəxəssislər, Quran təfsirçiləri bu haqda fərqli fikirlər irəli sürdülər və ayələrin sirli :məqamları aşkar olundu. Belə məqamlardan bir neçəsinə nəzər salaq

;a)Günəşin Ağ yol qalaktikası daxilindəki hərəkəti

:təcri] (Jasin, ٣٨) sözünü izah etdikdən sonra yazır] "تجری" Ayətullah Məkarim Şirazi

"Yuxarıdakı ayənin son və ən yeni açıqlaması alimlərin son dövrlərdəki kəşfi ilə üst-üstə düşür. Bu, Günəşin Günəş sistemi ilə birgə bizim qalaktikanın ortasında Veqa (göyün şimal yarımkürəsində Lira bürcündə ən parlaq ulduz) adlanan müəyyən çox .(uzaq bir ulduza doğru hərəkətdə olmasıdır(١

Alimlərdən biri Günəşin şimal yarımkürəsinə doğru ١٩,٥ km/sansürətlə hərəkət etdiyini .(qeyd edərək Rəd surəsinin ٢, İbrahim surəsinin ٣٣-cü ayələrinə əsaslanır(٢

:Əllamə Təbatəbai məlum ayəni Günəşin hərəkəti kimi izah edərək yazır



---

"المستقر" Təfsiri-nümunə", c. ١٨, səh. ٣٨٨. Ayəni bu şəkildə izah etmək üçün"[١٤٤] -١ ilə] ön qoşması kimi tərcümə] "الی" li] ön qoşması] "ل" limustəqərrin] ifadəsindəki] edilməlidir. Yəni "Günəş qərarlaşacağı yerə doğru hərəkətdədir". Bəzi ərəb yazıçıları .(da bu fikirdədirlər (Əhməd Məhəmməd Süleyman, "əl-Quran və əl-elm", səh. ٣٥

.Hüseyn Nuri, "Kosmos əsrinin biliyi", səh. ٢٥-٣٦[١٤٥] -٢

Elmi baxımdan müşahidəçinin hislərinin əksi isbat olunmuşdur. Yəni əslində Günəş“ Yerin ətrafına deyil, Yer Günəşin ətrafına fırlanır. Elmi əsaslara görə, Günəş onu əhatə edən digər planetlərlə birgə müəyyən bir ulduza doğru hərəkətdədir”(۱).

Seyid Hibə əd-Din Şəhristani də Günəşin parlaq bir ulduza doğru hərəkətdə olduğunu vurğulayır. Digər bir yerdə isə bu hərəkətin apeksi kimi Herkules (göyün şimal yarımkürəsində bürc) bürcünü göstərir və “تجری” [sözündən məqsədin həmin təcri] hərəkət olduğu fikrini önə çəkir(۲).

Təntavi də “əl-Cövhər” əsərində ayədən məqsədin Günəşin (bütövlükdə Günəş sisteminin) müəyyən bir ulduza doğru hərəkəti olduğunu qeyd edir və mövzu ilə bu və ya digər əlaqəsi olmayan məsələlər (təyyarənin, avtomobilin hərəkəti və s.) haqqında geniş söhbət açır(۳).

Bu haqda Məhəmməd Əhməd Sadat(۴), Cəfər Rzaifər(۵) və Doktor Mənsur Məhəmməd Nəsəb ən-Nəbi(۶) də oxşar fikirlər söyləmişlər.

b) Günəşin qalaktika ilə birgə hərəkəti;

Ayətullah Məkarim Şirazi Yasin surəsinin ۴۰-cı ayəsi ilə bağlı iki ehtimalı qeyd edir:

Birinci ehtimal Günəşin Yerin hərəkəti nəticəsində oradakı (Yerdəki) müşahidəçinin “gördüyü gündəlik xəyali hərəkətidir.



---

۱- [۱۴۶] “Əl-Mizan”, c. ۱۷, səh. ۸۹.

۲- [۱۴۷] “İslam və astronomiya”, səh. ۱۸۱.

۳- [۱۴۸] Təntavi Cövhəri, “əl-Cəvahir fit-təfsir əl-Quran”, c. ۹, səh. ۱۷۲.

۴- [۱۴۹] “Quranın ecazkarlığı və həmişəyaşarlıq”, səh. ۲۸-۳۰.

۵- [۱۵۰] “Quran və son elmi nailiyyətlər”, səh. ۱۳۱.

۶- [۱۵۱] “Əl-Quran əl-kərim və əl-elm əl-hədis”, səh. ۲۶۴.

İkinci ehtimal Günəşin Günəş sistemi ilə, qalaktika ilə birgə hərəkətidir. Bu gün artıq sübuta yetmişdir ki, bizim Günəş sistemi nəhəng qalaktikanın sadəcə bir hissəsidir və .”daim hərəkətdədir

O, sonda bu ayənin Günəşin daxili hərəkətinə bir işarə olduğunu qeyd edir və bildirir ki, bu, antik astronomiyaya — Ptolomey təlimlərinə ziddir. Elə buna görə də Quranın elmi .(möcüzələrindən biri də sübuta yetmiş olur(١

Alimlərdən biri Günəşin qalaktika mərkəzi ətrafına ٢٢٥ km/sansürətlə ٢٠٠ mln. ildə bir tam dövr etdiyini qeyd edərək, bunun isbatı üçün Ənbiya surəsinin ٢ və İbrahim .(surəsinin ٣٣-cü ayələrinə istinad edir(٢

Doktor Maurice Bucaille Ənbiya surəsinin ٣٣, Yasin surəsinin ۴٠-cı ayələrinə əsaslanaraq Quranın Günəşin öz orbiti üzrə hərəkətindən xəbər verdiyi qənaətinə .gəlir. Halbuki bu, Ptolomey təlimlərinə qarşıdır

:O, yazır

Ptolomey təlimlərinin Peyğəmbər (s) dönəmində də hökm sürməsinə baxmayaraq,“ .(Quranda həmin təlimlərə kiçicik bir işarə belə yoxdur”(٣

Seyid Hibə əd-Din Şəhristani Günəşin (bütövlükdə Günəş sisteminin) hərəkəti ilə bağlı yazır: “Günəş digər planetlərlə birgə Ülkərdəki (Buğa bürcündə səpələnmiş qalaktik .”ulduz topası) ən parlaq ulduza — Alsionaya (üçüncü ulduz ölçülüdür) hərəkətdədir

.Bəzi yazıçılar(۴) bu hərəkətin Quran ayəsində açıqlandığını (Yasin, ۴٠) qeyd etmişlər

:Misbah Yəzdi yuxarıdakı ayəni qeyd edərək yazır



---

.Təfsiri-nümunə”, c. ١٨, səh. ٣٨۶-٣٨٩“[١۵٢] -١

.Hüseyn Nuri, “Kosmos əsrinin biliyi”, ٢۶, ٣۵-٣۶[١۵٣] -٢

.Tövrat, İncil və Quranın elmi müqayisəsi”, səh. ٢١۵, ٢١۶“[١۵۴] -٣

.Əbd ər-Rəzzaq Nofel, “əl-Quran və elm əl-hədis”, səh. ١٧٨[١۵۵] -۴

Quran sferanı ("fələk") dəryaya bənzədir və cisimlərin (göy cisimlərinin) orada" üzdüyünü bildirir. Məlumdur ki, məqsəd göy cisimlərinin öz orbitləri üzrə hərəkət etdikləri fəzadır (boşluq). Bu onu göstərir ki, Quran öncədən qədim astronomik fikirləri rədd edirmiş. Deməli, bu ayədən bəlli olur ki, bütün göy cisimləri hərəkət edir. Bu, yeni .(astronomiyanın sübuta yetirdiyi müddəadır(۱

Qeyd: Fikrimizcə məqsəd ikinci məna, yəni Günəşin öz orbiti üzrə hərəkət etməsidir. .Bunu (Hər biri (özünə məxsus) bir göydə üzər) ayəsinin ardı da təsdiq edir

.c)Günəşin öz ekvatorunda fırlanması

:Təfsiri-nümunə"də oxuyuruq"

Bəziləri bu ayəni Günəşin öz ekvatorunda fırlanması kimi izah etmişlər. Çünki alimlərin" tədqiqatları nəticəsində sübuta yetmişdir ki, Günəş öz ekvatorunda fırlanır". O, bunu limustəqərrin ləha]] "لمستقرلها" da qeyd edir ki, ayədən bu mənanı almaq üçün .(fi] ön qoşması kimi tərcümə olunmalıdır(۲] "فی" lə] ön qoşması] "ل" ifadəsindəki ikinci

Qeyd: Bu versiyaya görə ayənin tərcüməsi belə olur. "Günəş qərarlaşdığı yerdə .hərəkət edir", yəni öz ətrafına fırlanır

:Əhməd Məhəmməd Süleyman yazır

li] ön] "ل" li] ön qoşması ۱۳ məna ifadə edir. Əgər məlum ayədə] "ل" Ərəb dilində" ilə] kimi] "الی" ,kimi tərcümə olunarsa, Günəşin öz ətrafına fırlanması "فی" qoşması tərcümə olunarsa, Günəşin öz orbiti üzrə hərəkəti nəzərdə tutular. Bu, Quranın bədii möcüzəsidir. Bir ifadə ilə



---

.Quran maarifi", səh. ۲۵۲"[۱۵۶] -۱

.Təfsiri-nümunə", c. ۱۸, səh. ۳۸۲"[۱۵۷] -۲

.(limustəqərrin ləha] iki elmi möcüzə əks etdirilir"(١] "لمستقرلها"

(Seyid Hibə əd-Din Şəhristani Əllamə Mərəşi Şəhristaninin (Seyid Məhəmməd Hüseyn "في" li] ön qoşmasının isə] "ل" ,limustəqərrin] sözünün qərarlaşacağı məkan, yer] "لمستقر" mənasını daşıdığı ehtimalını verdiyini qeyd edir. Bu ehtimala görə ayədə məqsəd .(Günəşin öz ətrafına dövr etməsidir"(٢

.(Digər alimlər də eyni məzmunlu fikirləri öz əsərlərində qeyd etmişlər(٣

;ç)Günəşin sönükməsi

:Alimlərdən biri R`əd surəsinin ٢-ci ayəsini izah edərkən yazır

Zənnimizcə ayədən məqsəd budur ki, Günəş və Ay müəyyən bir zamanadək hərəkət" edəcək. Sonda elə bir zaman gələcək ki, bu səmavi çıraqlar sönükəcək. O gün artıq .(Qiyamət olacaq(۴

:Seyid Şəhristani də bu ayəni izah edərkən həmin ehtimalı qəbul edərək yazır

limustəqərrin] sözündən] "لمستقر" .Məqsəd Günəşin fəzada öz orbiti üzrə hərəkətidir" ."məqsəd isə qərarlaşacağı yer deyil, qərarlaşacağı zamandır

limustəqərrin] sözü zaman bildirən isim kimi tərcümə] "لمستقر" Qeyd: Burada .olunmuşdur

:Müasir fiziklər yazırlar

səh:٧٧

---

.Quran və elm", səh. ٣۵-٣۶"[١۵٨] -١

.İslam və astronomiya", səh. ١٨۶"[١۵٩] -٢

Hüseyn Nuri, "Kosmos əsrinin biliyi", səh. ٢۶, ٣۵-٣۶; "Quranın ecazkarlığı və[١۶٠] -٣ .həmişəyaşarlıq", səh. ٢٨-٣٠; Mustafa Zəmani, "Quranın elmi öngörüləri", səh. ٣۴

.Hüseyn Nuri, "Kosmos əsrinin biliyi", səh. ٣۵[١۶١] -۴

Günəş ١٠ mlrd. il istilik vermək qabiliyyətinə malikdir. Hal-hazırda onun ömründən ٥“
.(mlrd. il keçmişdir. Deməli, Günəş yolun yarısındadır”(١

.d)Günəşin daxili hərəkəti

təcri] sözü tamam başqa bir məna] ”تجری“ Fikrimizcə, Yasin surəsinin ٣٨-ci ayəsindəki təcri] arasında böyük] ”تجری“ təhruku] və] ”تحرک“ ,da ifadə edə bilər. Başqa sözlə desək təhruku] sözü yalnız hərəkət etmək mənasını ifadə edir. Bu, eynilə] ”تحرک“ .fərq var .avtomobilin hərəkətini xatırladır. O, müəyyən istiqamətə gedir; lakin alt-üst olmur təcri] sözü isə su və s. mayelər haqqında işlənir. Yəni hərəkət zamanı qarışır,] ”تجری“ .alt-üst olur

Bu gün alimlər kəşf etmişlər ki, Günəşin daxilində də tərpəniş, hərəkət mövcuddur. Günəşin nüvəsində daim istilik nüvə reaksiyaları gedir. Enerji işığa, şüalanmaya çevrilir. Həmin reaksiyalar zamanı Günəş daxilində əriyən maddələr yüksək təzyiqlə yuxarıya və ətrafa səpələnir (fışqırır). Bəzən də Günəşdən kilometrlərlə uzağa sıçrayır .((Günəş ləkələri

Quran bu reaksiyaları olduqca incə təbirlərlə ifadə edir. Bu, Quranın elmi möcüzəsi ola .bilər

təcri] sözü] ”تجری“ ,Qeyd: Yuxarıdakı təhlilə irad olaraq yaddan çıxarmaq lazım deyil ki həm Günəş haqqında, həm də Ay haqqında işlənmişdir (“Fatir”, ١٣; “Zumər”, ٥; “Loğman”, ٢٩). Bir halda ki, yuxarıda Günəş haqqında deyilənləri Ayın barəsində demək olmaz. Yəni Ayda məlum reaksiyalar baş vermir. Məlum ayədə sadəcə olaraq

səh:٧٨

---

Dr. Erick, “Yeni fizika”, səh, ٢٠-٢١. O , yazır: “Günəş saniyədə ٥٦٤ mln. t hidrogen[١٦٢] -١ yandırır. Bu miqdardan ٥٦٠ t helium yaranır, ٤ mln. t isə digər maddələr (bunun yalnız ٧٪-i yanacaq kimi istifadə olunur) təşkil edir və enerjiyə çevrilir. Nəticədə işıq, .şüalanma şəklində yayılır

fəza okeana, Günəş və Ayın hərəkəti isə (bir gəmi kimi) üzməyə bənzədilmişdir. Deməli, bu ifadə yalnız Günəş nüvəsində baş verən reaksiyalara aid deyil və elə buna .görə də Quranın elmi ecazkarlığını sübuta yetirmir

YEKUN

Günəşin hərəkətlərinin məlum ayələrə uyğun gəlməsi ilə bağlı bir neçə məsələyə .diqqət yetirmək lazımdır

limustəqərrin] ifadəsi (“Yasin”, ۳۸) ilə bağlı üç] ”لمستقر“ Öncə də qeyd etdiyimiz kimi .۱ ”لمستقر“ .(versiya mövcuddur (məsdər, zaman bildirən isim, məkan bildirən isim li] ön qoşması haqqında da üç ehtimal olduğunu qeyd] ”ل“ limustəqərrin] ifadəsindəki] təcri] haqqında isə dörd ehtimalı] ”تجری“ .(mənaları ”فی“ və ”الی“ ”,etdik (“qədər diqqətinizə çatdırdıq. Bu ehtimalları bir-birinə vurduqda ۳۶ ədədi alınır (۳×۳=۹×۴=۳۶). Deməli, ayənin ۳۶ izahı mövcuddur və bunlar hamısı ayənin məqsədi ola bilər. Digər ehtimala görə isə Günəşin hələ kəşf olunmamış (elmə məlum olmayan) hərəkəti də ola bilər. Buna görə də bu və ya digər ehtimalın ayənin dəqiq izahı olduğu üzərində dayanmaq olmaz. Lakin öncə də qeyd etdiyimiz kimi ayənin (Yasin, ۳۷-۴۰) ilkin zahiri ”یسبحون“ .mənası Günəşin öz orbiti üzrə hərəkətindən söhbət getdiyini göstərir .yəsbəhun] sözü də bu ehtimalı təsdiq edir]

limustəqərrin]] ”لمستقر“ Günəşin naməlum bir istiqamətə doğru hərəkəti də .۲ ifadəsindən anlaşıla bilər. Lakin onun apeksinin (Veqa, Herkules, Alsiona və s.) dəqiq .göstərilməsi, əsassız olaraq Quran ayəsinə aid edilməsi doğru deyil

Quranın Günəşin hərəkəti haqqında aydın danışması (dörd ehtimaldan hansı birinin .۳ nəzərdə tutulmasından asılı

olmayaraq) onun elmi möcüzəsidir. Çünki Quran Günəşin göy sferasında öz orbiti üzrə hərəkət etməsindən elə bir dönəmdə söhbət açmışdır ki, o zaman Ptolomey təlimləri Günəşin xəyali hərəkətini (Yerin fırlanması nəticəsində hiss olunan hərəkəti) həqiqi hərəkəti olaraq qəbul edirdi. Bu, Quranın və onu gətirən insanın əzəmətinin, dühasının .nişanəsidir

Sual: Quranın məlum elmi öngörüləri (Günəşin hərəkəti ilə bağlı) onun elmi möcüzəsini ?sübuta yetirirmi

Cavab: Bu suala cavab verərkən qeyd etmək lazımdır ki, Günəşin hərəkəti haqqında Qurandan öncə Tövratda da xəbər verilmişdir. Buna görə də bu Quranın elmi möcüzəsi ola bilməz. Lakin ayələrin Müqəddəs kitabda xəbər verilməyən, Ptolomey .təlimlərinə zidd olan hissəsi Quranın elmi möcüzəsidir

Ayənin Tövratda xəbər verilən hissəsi bu sözlərlə qeyd olunur: “(Günəş) bir pəhləvan .”kimi meydanda qaçmaqdan sevinc hissi duyur

Bu cümlədən yalnız Günəşin öz orbiti üzrə hərəkət etməsi anlaşılır(۱). Lakin Günəşin .digər hərəkətləri Quranın yeniliklərindəndir və onun elmi möcüzəsini isbat edir

## YER KÜRƏSİ

Yerin kürəvi formada və hərəkətdə olması haqqında müxtəlif ayələrə istinad olunmuşdur. Lakin ayələrin izahından öncə bəzi məsələlərə aydınlıq gətirmək daha .məqsədə uyğundur

səh:۸۰

---

Əlbəttə, orta əsrlərdə xristian din xadimləri bu cümlədən məqsədin Günəşin [۱۶۳] -۱ .gündəlik xəyali hərəkəti olduğunu düşünürdülər

Yer, üzərində yaşadığımız planetdir. Günəş sisteminin Günəşdən məsafəsinə görə üçüncü, ölçüsü və kütləsinə görə beşinci planetidir. Çox qədim zamanlarda mövcud olan ilkin təsəvvürlərə görə bütün ulduz və planetlər Yer ətrafına fırlanırlar. Onlar Yerin sabit olduğunu düşünürdülər. Yerin hərəkəti haqqında düşünmək o qədər qəbahət sayılırdı ki, hətta alimlərə belə icazə verilmirdi. İlk dəfə bu fikirlə çıxış etməyə qədim yunan mütəfəkkiri Samoslu Pifaqor (təqr. e.ə. ۵۸۰-۵۰۰) təşəbbüs göstərdi. Ondan təqribən ۲۰۰ il sonra Samoslu Aristarx Günəşi dünyanın mərkəzi hesab edərək heliosentrik təsəvvürü inkişaf etdirdi. O, öz kəşfini — Yerin Günəş ətrafına illik hərəkətini — açıqladıqda kafirlikdə ittiham edildi (Şərqdə ilk dəfə olaraq Biruni Yerin Günəş ətrafına hərəkətinin mümkünlüyü haqqında fikir söyləmiş və Yer çevrəsinin .(uzunluğunu təyin etmişdir

Sonradan Klavdi Ptolomey (təqr. e.ə. ۱۴۰) geosentrik sistem konsepsiyasını daha tam işlədi. Bu konsepsiya on altı əsr bəşər təfəkkürünə hakim kəsildi. Ona qarşı çıxanlar .fiziki cəzalara məruz qaldılar

Ptolomey təlimlərini ilk dəfə rədd edən və dünyanın heliosentrik sistemi nəzəriyyəsinin əsasını qoyan polşalı astronom Nikolay Kopernik (۱۴۹۸-۱۵۴۳) olmuşdur. O, antik astronomiyanı, xüsusilə “Almagest” əsərini dərindən öyrənmiş, Ptolomey sistemini (dünyanın geosentrik sistemini) antik astronomiyanın görkəmli uğuru kimi qeyd etmiş, lakin onun səhv olduğunu söyləmişdir(۱). Sonradan alman astronomu İohann Kepler (۱۵۷۱-۱۶۳۰) onun



---

Kopernikin tədqiqatları “Göy sferalarının fırlanması haqqında” (۱۵۴۳) əsərində[۱۶۴] -۱ .toplanmışdır

fikirlərini davam etdirərək Yerin elliptik orbitini üzə çıxarmışdır. Sonda (Kopernikin heliosentrik sistemi) italyan fiziki və astronomu Qalileo Qalileyin (۱۶۴۲-۱۵۶۴) kəşfləri nəticəsində öz elmi sübutunu tapdı. O, bunu açıqladıqda kilsə xadimləri, ruhanilər .(tərəfindən birmənalı qarşılanmadı(۱)

Yeni astronomiya təkmilləşdikdən sonra astronomların kəşfləri göstərdi ki, Yer müxtəlif hərəkətlərə malikdir. Bəzi astronomlar bu hərəkətlərin sayının on dörd olduğu .qənaətindədirlər. Burada bu hərəkətlərin bir neçəsinə diqqət yetirək

Birinci: Yerin öz oxu ətrafına fırlanması

Yerin öz oxu ətrafında dövrü ۱ gündür. Gecə və gündüz bu dövr nəticəsində meydana .gəlir. Fırlanmanın müddəti ۲۳ saat ۵۸ dəq. ۳۸ san-dir. Sürəti dəqiqədə ۳۰ km-dir

İkinci: Yer Günəşin cazibəsi nəticəsində onun ətrafına elliptik (qapalı əyri xətt, ellipsşəkilli) orbit boyunca dolanır. Bu dolanma dövrü bir ulduz ilidir. Fırlanma müddəti .۳۶۵ gün ۶ saat ۸ dəq. ۳۸ san.-dir. Orbit boyunca orta sürəti ۲۹, ۷۶۵ km/san-dir

Üçüncü: Yerin qalaktika mərkəzi ətrafına dolanması. Bu ۲۵۰ km/sansürətlə gerçəkləşir .((tam dövrü təqr. ۲۰۰ min ildir

səh:۸۲

---

Kopernekin bu konsepsiyanı haradan əxz etməsi haqqında maraqlı faktlar [ ۱۶۵] -۱ mövcuddur. Belə ki, Elxanilər dönəmində şərqi roma alimləri İslam alimlərinin əsərlərini yunan dilinə tərcümə etdilər. Həmin əsərlərlə tanış olan Kopernik və digər Avropa astronomları dünyanın heliosentrik sistemi haqqında fikir yürütməyə başladılar. Dahi ensiklopedist alim Biruni (h.q. ۴۴۰) açıqca bildirirdi ki, yer sükunətdə deyil. O, günəş ətrafına fırlanır. Müsəlman alimlərinə görə dünyanın geosentrik və ya heliosentrik sisteminin müəyyənləşdirilməsi astronomiyadan çox, metafizika (fəlsəfə) .və sxolastika (kəlam, ilahiyyat) ilə bağlı idi

Dördüncü: Yer Günəş ətrafına dolanarkən onun fırlanma oxu təqr. öz-özünə paralel qalır, lakin günəş şüalarına nəzərən vəziyyəti dəyişir. Günəş və Ayın sarsıdıcı təsirindən Yerin fırlanma oxu fəzada vəziyyətini zəif dəyişərək ekliptika müstəvisinin qütbü ətrafında oturacağının böyük yarımoxu ۲۳,۵oolan konus cızır. Yer oxunun bu .hərəkəti presessiya adlanır

Beşinci: Sarsıdıcı qüvvələrin qiymət və istiqamətləri müntəzəm dəyişdiyindən prosessiyanın üzərinə dövrü ۱۸,۶ il olan kiçik rəqsi hərəkətlər də əlavə olunur. Yer .oxunun bu hərəkəti nutasiya adlanır

Altıncı: Yer özü də fırlanma oxuna nəzərən vəziyyətini cüzi dəyişir. Şimal qütbü Yerin səthində mürəkkəb fiqur cızır və tərəfi ۳۰ m olan kvadratdan çıxmır. Eyni məntəqədə .coğrafi enliyin dəyişməsi də onunla əlaqədardır

Qeyd: Yer də Günəş kimi digər planetlərlə birgə naməlum istiqamətə və ya Veqa (ulduzuna doğru hərəkət edir(۱



---

Yerin öz oxu ətrafında fırlanması ilə bağlı istinad olunan ayələr: Mursəlat, ۲۵;[۱۶۶] -۱ Şəms, ۶; Nəml, ۸۸; Nəbə`, ۸; Nəhl, ۱۵; Ənbiya, ۳۱; Loğman, ۱۰.Yerin orbit üzrə hərəkəti ilə bağlı istinad olunan ayələr: Mulk, ۱۵; Mursəlat, ۸۵; Şəms, ۶; Nəml, ۸۸; Fussilət, ۱۱. Aşağıdakı ayələrə isə yerin digər hərəkətləri ilə bağlı istinad olunmuşdur. Zuxruf, ۱۰; .Taha, ۵۳; Nəbə`, ۶; Bəqərə, ۲۲

## ?QURANDA YERİN HƏRƏKƏTİNƏ İŞARƏLƏR VARMI

Yerin hərəkəti ilə bağlı çoxsaylı ayələrə istinad olunmuşdur. Aşağıda onların hər birini .ayrıca nəzərdən keçiririk

Dağlara baxıb onları donmuş (hərəkətsiz durmuş) zənn edərsən, halbuki onlar“ .١ .(bulud keçdiyi kimi keçib gedərlər” (١

:Təfsiri-nümunə”də oxuyuruq“

Ayədə mövcud kontekstlər göstərir ki, Allahın nişanələri, əzəmətinin göstəriciləri bu“ dünyadadır. Yerin bizim hiss etmədiyimiz hərəkəti də bu qəbildəndir. Şübhəsiz, dağların sıx bağlı olduğu Yersiz hərəkəti mənasızdır. Deməli, ayədən məqsəd Yerin sürətlə hərəkət etməsidir. Astronomik hesablamalara görə Yer öz oxu ətrafına təqr. dəqiqədə ٣٠ km sürətlə fırlanır. Onun orbit boyunca hərəkəti daha sürətlidir. Hər halda sözügedən ayə Quranın elmi möcüzələrindəndir. Çünki Yerin hərəkəti XVII əsrdə Kopernik tərəfindən kəşf olundu. Halbuki Quran ondan təqribən min il öncə bu haqda .(söhbət açmışdır(٢

Mərhum Təbərsi və s. təfsirçilər dağların hərəkətinin Qiyamətə aid olduğu ehtimalını önə çəkmişlər. Bu, İbn Abbasdan nəql olunmuşdur(٣). Lakin Ayətullah Məkarim Şirazi və s. təfsirçilər bu fikri rədd edir və bildirirlər ki, dağların buluda bənzədilməsi və eləcə də ayənin ardı dünyaya hakim olan nizama daha çox uyğundur. Qiyamətdə baş .verəcək hadisələrlə heç bir əlaqəsi yoxdur



---

.Nəml, ٨٨ [١۶٧] -١

.Təfsiri-nümunə”, c. ١۵, səh. ۵۶٨-۵۶٩“ [١۶٨] -٢

.Məcmə əl-bəyan”, c. ٧, səh. ٢٣۶“ [١۶٩] -٣

Digər tərəfdən də “Dağların sükunətdə olduğunu düşünürsən” cümləsi Qiyamət hadisələri ilə uyğun gəlmir(١).

Seyid Şəhristani də məlum ayəyə istinad edərək Yerin hərəkət etdiyini bildirir. O, qeyd edir ki, təqr. ٥٠ il bundan öncə Mərhum Əliqulu İ`tizad əs-Səltənə (Fəthəli şahın oğlu) bu ayənin Yerin hərəkəti ilə bağlı olduğunu bildirmişdir(٢).

Bəzi yazıçılar yazırlar:

“Məlumdur ki, bulud sürəti Yerin sürətinin çoxluğuna işarədir. Adi danışıqda da bunun nümunələri var. Misal üçün, filankəs külək kimi hərəkət edir(٣).

Əllamə Təbatəbai (“Quranın ecazkarlığı” kitabının müqəddiməsində), Hüseyn Nuri(٤) və Məhəmməd Əli Sadat(٥) da yuxarıdakı ayənin (Nəml, ٨٨) Yerin Günəş ətrafına elliptik orbit boyunca dolanmasına aid olduğunu bildirirlər.

YEKUN

Ayənin (Nəml, ٨٨) Yerin elliktip orbit üzrə hərəkət etməsinə işarə olması məqsədəuyğundur. Çünki dağlar buluda bənzədilmişdir. Bulud Yerin ətrafına dolanır, lakin öz ətrafına fırlanmır. Deməli, bu bənzətmə Yerin öz oxu ətrafında fırlanmasına aid ola bilməz. Odur ki, “Təfsiri-nümunə”də məlum ayənin izahı zamanı Yerin öz oxu ətrafında fırlanması ehtimalını qeyd etməsinin ayəyə heç bir aidiyyatı yoxdur.

٢. الَّذِی جَعَلَ لَکُمُ الْأَرْضَ مَهْدًا

səh:٨٥

---

١- [١٧٠] “Təfsiri-nümunə”, c. ١٥, səh. ٥٦٨.

٢- [١٧١] “İslam və astronomiya”, səh. ٥٧-٥٩.

٣- [١٧٢] Abbas Əli Sərəfrazi, “Elm və dinin əlaqəsi”, səh. ٣٣-٣۴.

۴- [١٧٣] “Kosmos əsrinin biliyi”, səh. ٣٥.

٥- [١٧۴] “Quranın ecazkarlığı və həmişəyaşarlıq”, səh. ٢۴.

.(O Allah ki, Yeri sizin üçün beşik etdi” (١“

.mihadən]) qeyd olunur] ”مهاداً“) Eyni məzmun Nəbə surəsinin ٥٣-cü ayəsində də

:Bəqərə surəsində isə oxuyuruq

الَّذِی جَعَلَ لَکُمُ الأَرْضَ فِرَاشاً

.(O Allah ki, Yeri sizin üçün döşək (istirahət yeri) etdi”(٢“

məhdən] sözündə Yerin hərəkətinə işarə] ”مهـــداً“ Bəzi yazıçılar ayədə sözü keçən .olduğunu qeyd etmişlər

Çox maraqlı bənzətmədir. Quran Yeri beşiyə bənzədir. Bildiyiniz kimi beşik hərəkət“ etdiyi bir halda uşağı narahat etmir, əksinə onun istirahəti üçün əlverişli şərait .(yaradır”(٣

.(Əllamə Şəhristani də eyni fikirləri təsdiq edir(٤

Əllamə Təbatəbai “Quranın ecazkarlığı” kitabının müqəddiməsində Taha surəsinin ٥٩, Şeyx Nəzih əl-Qəmiha Taha surəsinin ٥٣ və Zuxruf surəsinin ١٠, Mühəndis Sadat Zuxruf surəsinin ١٠ və Nəbə surəsinin ٦-cı ayələrinin Yerin orbit boyunca (Günəş .ətrafına) hərəkətinə aid olduğunu vurğulamışlar

:Misbah Yəzdi ayənin Yerin hərəkəti ilə bağlı olduğunu rədd edərək yazır

firaş] sözünə oxşar məna daşıyır.] ”فراش“ mihad] sözləri də] ”مهـــاد“ məhd] və] ”مهـد“ Bəzilərinə görə bu Yerin beşik kimi hərəkətdə olduğuna işarə vurur. Lakin bu aydın deyil. Çünki bu zaman bənzətmənin digər tərəfi də (beşiyin dala-qabağa yellənməsi) əsas götürülə bilər. Halbuki Yerin hərəkəti belə deyil. Deməli, ayənin zahiri mənası Yerin



---

١-[١٧٥] ١٠ ,Zuxruf.

٢-[١٧٦]٢٢ ,Bəqərə.

Quranın heyrətləndirici məsələləri”, səh. ۳۵-۳۶; Əllamə Xoi, “Möcüzənin“[۱۷۷] -۳
.sərhədləri”, səh. ۱۱۹

.İslam və astronomiya”, səh. ۵۴-۵۵“[۱۷۸] -۴

istirahət üçün əlverişli olmasıdır (eynilə beşiyin uşağın rahatlığına, istirahətinə xidmət .(etməsi kimi)(١)

mihad] sözləri leksik məna etibarı ilə sükunət və istirahət] ”مهاد“ məhd] və] ”مهد“ :Qeyd .(üçün əlverişli olan Yerə deyilir. Onun nümunələrindən biri uşaq beşiyidir(٢)

Yer də bu qəbildəndir. Yəni Yer saf, yumşaq (və mədənlər, dəryalar olmasına .(baxmayaraq) həyat üçün əlverişlidir(٣)

YEKUN

mihad] sözləri yalnız uşaq beşiyi mənasını daşıyırsa,] ”مهاد“ məhd] və ya] ”مهد“ Əgər yuxarıdakı ayələri Yerin hərəkətinə bir işarə kimi qəbul etmək olar. Bu hərəkətdən məqsəd Yerin Şimal və Cənuba (٢٣o və ٢٣ dəq.) meylidir(٤). Yəni Yer il ərzində (eynilə beşik kimi) Şimal və Cənub istiqamətinə yönəlir. Beləcə Ayətullah Misbah Yəzdinin iradı da aradan qalxmış olur. Çünki Yerin hərəkətlərindən biri beşikşəkillidir. Lakin Yerin elliptik orbit üzrə hərəkət etməsi bu ayələrdən anlaşılmır. Ümumilikdə Yerin hərəkətinin beşiyin hərəkətinə bənzədilməsi özü buna işarə ola bilər. Çünki beşik heç .zaman nə öz ətrafına, nə də orbit boyunca fırlanmır. O, sadəcə bir xətt üzrə yellənir

mihad] sözlərinin leksik mənasına nəzər saldıqda bu sözlərin] ”مهاد“ məhd] və] ”مهد“ istirahət və ya yaşam



---

.Quran maarifi”, səh. ٢٥٣“[١٧٩]-١

Mustəfəvi, “Ət-Təhqiq fi kələmat əl-Quran”, c. ١١, səh. ١٨٩; “Misbah əl-luğə”;[١٨٠] -٢ .”“Məqayis əl-luğə

.Ət-Təhqiq fi kələmat əl-Quran”, səh. ١٩٠“ [١٨١]-٣

.Paknijad, “Bilik dünyası”, c. ٢, səh. ٥٣٩[١٨٢]-٤

üçün əlverişli olan məkan mənasını ifadə etdiyinin şahidi oluruq. Beşik isə bu mənanın real nümunələrindən biridir. Deməli, bu bənzətmənin məqsədini qəti olaraq yuxarıdakı hərəkətlə bağlamaq doğru deyil (Əlbəttə, bu da bir ehtimal kimi rədd oluna bilməz). Digər Quran ayələrinə nəzər salsaq məlum sözlərin (hərəkət edən məkan deyil) istirahət, həyat üçün əlverişli yer kimi işləndiyi də aydın olar. Belə olduqda Ayətullah Misbah Yəzdinin iradı yerli iraddır və yerin (beşikşəkilli) hərəkətini qəti olaraq .yuxarıdakı ayələrə aid etmək olmaz

۳. وَالْأَرْضِ وَمَا طَحَاهَا

"!And olsun Yerə və onu genişləndirənə"

وَالْأَرْضَ بَعْدَ ذَلِكَ دَحَاهَا

.(Bundan sonra da Yeri genişlədib (yayıb) düzəltdi"(۱)"

:Məşhur İslam leksikoqrafı Rağib İsfahani "Müfrədat" əsərində yazır

dəhv] sözü ilə müştərək mənalarda işlədilir. Yəni] "دحو" təhv] sözü] "طحو" Ərəb dilində"
."hər ikisi genişləndirmək, hərəkətə gətirmək mənalarını ifadə edir

.dəhv] sözünü Yerin hərəkətə gətirilməsi kimi izah edir] "دحو" Digər bir yerdə isə

təhv] sözünün leksik mənasına] "طحو" Pərtovi əz Quran" təfsir əsərinin müəllifi" əsaslanaraq ayənin Yerin öz oxu ətrafında, eləcə də elliptik orbit boyunca (Günəş .(ətrafına) hərəkətinə işarə vurduğunu qeyd edir(۲)

:Bəzi ərəb yazıçıları yazırlar



---

.Şəms, ۶; Naziat, ۳۰[۱۸۳]-۱
.Ayətullah Taliqani, "Pərtovi əz-Quran", c. ۲, səh. ۱۱۰[۱۸۴]-۲

dəhv] sözləri sinonimidir. Bu sözlərin mənasında] "دحو" təhv] və] "طحو" Ərəb dilində" genişləndirmə, hərəkət anlayışları var. Əgər yeni elmi kəşflərə nəzər salsaq görərik ki, .(Quran Yerin hərəkətini ən gözəl şəkildə vermişdir(١)

dəhv] sözlərinin mənasına] "دحو" təhv] və] "طحو" Digər ərəb yazıçısı isə diqqəti :yönəldərək yazır

Əllamə Təbatəbai "Quranın ecazkarlığı" kitabının müqəddiməsində Yerin öz oxu :ətrfında fırlanmasının Naziat surəsinin ٣٠-cu ayəsindən anlaşıldığını qeyd edərək yazır

Qaliley Yerin öz oxu ətrafında fırlanması haqqında fikir yürütməzdən min il öncə" Quran açıqca Yerin fırlanmasından danışır (Naziat, ٣٠). Hədislərdə bu haqda o qədər ."dəhv əl-ərz] anlayışı dillər əzbəri olmuşdur] "دحوالارض" ,söhbət açılmışdır ki

dəhv] sözü leksik məna etibarı ilə diyirlətmək, yuvarlatmaq] "دحو"Onun fikrincə mənalarını ifadə edir. Bu söz "Nəhcül-bəlağə"də(٢) keçmiş və indiki zaman feli sifətləri "دحو الارض" kimi işlənmişdir. Bəzi rəvayətlərdə ٢٥ zilqədə



---

.Şeyx Xalid Əbd ər-Rəhman əl-Ək, "əl-Furqan və əl-elm", səh. ۴۶٨-۴۶٩ [١٨۵] -١

.Feyz əl-İslam, "Nəhcül-bəlağə", səh. ١۶٨, ٢۵٨, ۶۴۵ [١٨٧] -٢

.(dəhv əl-ərz] günü kimi göstərilərək müəyyən əməllər tövsiyə edilmişdir(۱]

Seyid Şəhristaninin fikrincə Naziat surəsinin məlum ۳۰-cu ayəsinin Yerin hərəkəti ilə bağlı olduğunu ilk dəfə Əllamə Seyid Məhəmməd Hüseyn Mərəşi Şəhristani (vəfat-۱۳۱۵ h.q.) “Məvaid” adlı elmi məqaləsində qeyd etmişdir. Mərhum Şəhristani bu fikri təsdiq .(edərək isbat etmək üçün yeddi dəlil göstərir(۲

təha] sözünün Yerin genişlənməsi, onun suyun] ”طحـــا“ Təfsiri-nümunə”nin müəllifi“ altından qabararaq üzə çıxması kimi tərcümə edir. Lakin sovuşdurmaq, (özündən) uzaqlaşdırmaq, dəf etmək kimi başa düşülüb Yerin öz oxu ətrafında və ya orbit .(boyunca fırlanmasına aid olduğunu rədd edir(۳

YEKUN

təhv] sözlərinin leksik mənasına nəzərən məlum ayələrin Yerin öz] ”طحو“ dəhv] və] ”دحو“ ”دحو“ ,oxu ətrafında və orbit boyunca hərəkətinə aid olduğunu demək olar. Əlbəttə təhv] sözlərini genişlənmək kimi də başa düşmək olar. Bu iki məna biri-] ”طحو“ dəhv] və] .digərini istisna etmir

۴. أَلَمْ نَجْعَلِ الْأَرْضَ كِفَاتًا

(Məgər Biz Yeri məskən etmədikmi?”(۴“

.kifat] sözü bir neçə şəkildə tərcümə edilmişdir] ”كفات“



---

Əllamə Təbatəbai, “Quranın ecazkarlığı”, səh. ۱۳ [۱۸۸] -۱

Şəhristani, “İslam və astronomiya”, c. ۵۱, ۵۴[۱۸۹] -۲

.Təfsiri-nümunə”, c. ۲۷, səh. ۴۴“ [۱۹۰] -۳

.Mürsəlat, ۲۵[۱۹۱] -۴

Toplamaq, cəmləmək, almaq. Yəni Yer diri və ölüləri (özündə) cəmləmişdir. Yaxud .۱ .(insanları, heyvanları, canlı və cansız təbiəti (özündə) cəmləmişdir(۱

kifat] sözünün ilkin mənası quşun uçmaq üçün qanadlarını] "كفات" Sürətli uçuş . ۲ .(yığmasıdır(۲

kifat] sözünün hər iki mənasını qeyd edərək ayənin] "كفات" Təfsiri-nümunə"nin müəllifi" tərcüməsində iki ehtimalı önə çəkir. Bir ehtimala görə ayədə məqsəd Yerin (diri və ölülərin) qərarlaşdığı məkan olduğu, digər ehtimala görə isə Yerin sürətli hərəkəti, yəni öz oxu ətrafında və ya orbit üzrə hərəkətidir. Hansı ki, bu məsələ Quranın nazil olduğu dönəmdə kəşf olunmamışdı. Lakin ikinci ayəyə nəzərən birinci ehtimal daha .(dəqiqdir(۳

:Bəzi elm adamları ayədə aşağıdakı elmi məqamlara işarələr olduğunu önə çəkmişlər

"كفات" a) Yerin öz oxu ətrafında, yaxud orbit üzrə hərəkəti və bu hərəkətin sürəti. Bunu .kifat] sözünün mənasının uçuşla bağlı olması ilə əlaqələndirirlər]

.b) Yer qabığında və təkindəki dəyişikliklər

.(c) Yerin təkində ərimiş maddələrin mövcudluğu(۴

:kifat] sözünün leksik mənasını qeyd edərək yazır] "كفات" Digər bir ərəb yazarı isə

Bu dəqiq ifadə Yerin orbit boyunca hərəkətinin surətini və eyni zamanda sakinlərini" .(üzərində saxlaya bilməsini göstərir"(۵

səh:۹۱

---

."Rağib İsfahani, "Müfrədat"; İbn Mənzur, "Lisan əl-ərəb [۱۹۲] -۱

.Yenə orada [۱۹۳] -۲

.Təfsiri-nümunə", c. ۲۵, səh. ۴۱۲-۴۱۳" [۱۹۴] -۳

Yədullah Niyazmənd Şirazi, "Quranın ecazkarlığı müasir elm baxımından", səh. [۱۹۵] -۴ .۸۰

.Şeyx Xalid Əbd ər-Rəhman əl-Ək, "əl-Furqan", səh. ۴۶۶-۴۶۷[۱۹۶] -۵

Bəzi müasir yazıçılara görə bu ayə Yerin surətli hərəkəti və cazibə qüvvəsi .(haqqındadır(١

Ayətullah Misbah Yəzdi məlum ayənin Yerin hərəkəti haqqında olduğunu rədd edərək :yazır

kifat] əşyanın toplandığı, cəmləşdiyi yerə deyilir. Onun ilkin] "كفات" Ərəb dilində" kifat] sözünün digər mənası da] "كفات" .mənasında almaq, əlavə etmək anlayışları yatır :var. Ərəb dilində deyilir

Quş sürətlə uçdu). Bəziləri bu mənaya nəzərən ayənin Yerin ) كفت الطائراى اسرع فى الطيران orbit üzrə hərəkəti ilə bağlı olduğu fikrini irəli sürmüşlər. Fikrimizcə bu zəif ehtimaldır. kifat] sözü məsdərdir. Belə olduqda ayə "Yer sürətlidir" deyil, "Yer ] "كفات" Çünki kifat] sözü] "كفات" sürətdir" kimi başa düşülür. Ayəni o şəkildə tərcümə etmək üçün .(cümlədə sifət mənasını ifadə etməlidir. Bu isə ayənin zahiri mənasına ziddir"(٢

.(Əllamə Təbatəbai də ayəni izah edərkən toplamaq mənasını qəbul edir(٣

YEKUN

kifat] sözünün leksik mənasına nəzərən ayənin Yerin ellipktik orbit boyunca ] "كفات" .١ hərəkətinə aid olduğunu söyləmək olar. Ayətullah Misbah Yəzdinin qrammatik iradları kifat] sözü məsdər olsa belə (məna etibarilə) indiki zaman] "كفات" isə tutarlı deyil. Çünki feli sifəti kimi işlənə bilər. Bəzi təfsirçilər də bu qənaətdədirlər(٤). Bu elmi məsələ ayənin yer aldığı mətnə



---

.Məhəmməd Əli Sadat, "Əbədi ecazkarlıq və həmişəyaşarlıq", səh. ٢٥-٢۶ [١٩٧]-١

.Maarifi-Quran", səh. ٢۵۴"[١٩٨]-٢

.Əl-Mizan", c. ٢٠, səh. ١۶٨" [١٩٩]-٣

.Təfsiri-nümunə", c. ٢۴, səh. ٣٣٧" [٢٠٠]-۴

uyğundur. Çünki biri-digərini təsdiq edən ayələr Allahın nemətlərini sayır. Əlbəttə, bəzi təfsirçilərin də qeyd etdiyi kimi məqsəd insanları Qiyamət günü toplamaq(١) və ya .cazibə qüvvəsi haqqında da ola bilər

kifat] sözü bir] "كفات" Bütün bu ehtimalların hamsını toplamaq da mümkündür. Çünki kifat] sözü Yerin öz oxu] "كفات" neçə mənanı özündə cəmləmişdir. Lakin hər halda kifat] sözünün mənasında] "كفات" ətrafında fırlanmasına işarə ola bilməz. Çünki nəyinsə öz ətrafına dolanması anlayışı yoxdur. Yer qabığında dəyişiklik və ya Yerin təkində ərimiş maddələrin mövcudluğu mənalarını isə ensiklopedik soraq və izahlı .lüğət kitablarında tapa bilmədik

٥. هُوَ الَّذِی جَعَلَ لَکُمُ الْأَرْضَ ذَلُولًا فَامْشُوا فِی مَنَاکِبِهَا

.(Yeri (Yer kürəsini) sizə ram edən Odur. Onun qoynunda gəzin"(٢"

:Təfsiri-nümunənin müəllifi yazır"

zəlul] anlayışı (ram olmuş) Yer haqqında ən əhatəli ifadələrdəndir. Çünki Yer ] "ذلول" müxtəlif şəkildə sürətli hərəkətlərinə baxmayaraq sükunətdə olan bir cisim kimi mənkib] sözünün cəm halı olub çiyin] "منكب" mənakib] sözü] "مناكب" .nəzərə çarpır mənasını ifadə edir. Sanki insan Yerin çiyni üzərində dayanmış, Yer isə müvazinətini (qoruya bilmişdir"(٣

:Ayətullah Misbah Yəzdi məlum ayə haqqında yazır

Son ayədə daha çox diqqəti çəkən məqam budur ki, Yer insanın ayaqları altında tam " ram edilmiş miniyi



---

.Yenə orada [٢٠١] -١

.Mulk,١٥ [٢٠٢] -٢

.Təfsiri-nümunə", c. ٢۴, səh. ٣٣٧" [٢٠٣] -٣

"ذلول" xatırladır. Buradan belə nəticə almaq olar ki, Yer orbit üzrə hərəkət edir. Çünki .(zəlul] sözü iti gedən dəvə mənasını ifadə edir"(١)]

:Seyid Şəhristani yazır

zəlul] sözü iti gedən, ram edilmiş dəvəyə deyilir. Əgər] "ذلول" Ərəb dilində adi danışıqda" ."(ayə xaricində bir maneə olmazsa, onu Yerin hərəkətinə aid edə bilərik(٢)

Bir çox müasir yazarlar da (Gudərz Nəcəfi(٣), Məhəmməd Əli Sadat(٤), Əllamə .Təbatəbai(٥)) məlum ayəni Yerin orbit üzrə hərəkəti ilə əlaqələndirmişlər

YEKUN

Fikrimizcə ayənin Yerin orbit boyu hərəkətinə aid olmasında bir problem yoxdur. Bu .ehtimal ayənin hədəfi və ilkin zahiri mənası ilə də müvafiqdir

.٦ ثُمَّ اسْتَوَى إِلَى السَّمَاءِ وَهِيَ دُخَانٌ فَقَالَ لَهَا وَلِلْأَرْضِ اِئْتِيَا طَوْعًا أَوْ كَرْهًا قَالَتَا أَتَيْنَا طَائِعِينَ

Sonra Allah tüstü (düman) halında olan göyə üz tutdu. Ona (göyə) və Yerə belə" buyurdu: İstər-istəməz vücuda gəlin! Onlar da: İstəyərək (Allahın əmrinə itaət edərək) .(vücuda gəldik! - deyə cavab verdilər"(٦

:Seyid Şəhristani yuxarıdakı ayə haqqında yazır

ityan] sözü adi danışıqda] "اتيان" .Bu ayə də Yerin hərəkəti başa düşülən ayələrdəndir" hiss olunan yerdəyişməni (gəlmək) ifadə edir. Keçmiş alimlər Yerin hərəkət



---

١- [٢٠٤] "Maarif-Quran", səh. ٢٥٩.
٢- [٢٠٥] Şəhristani, "İslam və astronomiya", səh. ٥٦
٣- [٢٠٦] "Quranın heyrətləndirici məsələləri", səh. ٣٤.
٤- [٢٠٧] "Əbədi ecazkarıq və həmişəyaşarlıq", səh. ٢٤.
٥- [٢٠٨] "Quranın ecazkarlığı".
٦- [٢٠٩] Fussilət, ١١.

etmədiyini düşündüklərindən ayəni qeyri-həqiqi mənalara yozmuşlar. Biz Yerin hərəkət etdiyini qəbul etdiyimizdən digər yozumlara ehtiyacımız yoxdur”(١).

Müasir yazıçılardan biri məlum ayəni izah edərkən yazır:

“Sözügedən ayə yaradılışın başlanğıcı və göy cisimlərinin, xüsusilə Yerin hərəkətinə işarə vurur”(٢).

“Təfsiri-nümunə”nin müəllifi məlum ayə haqqında yazır:

“Bu ayədə məqsəd Tanrının həqiqətən (göy və ya Yerlə) danışması deyil. Burada məqsəd Allahın (yaradılışla bağlı) iradəsidir”(٣).

Əllamə Təbatəbai də “ائتيا [i`tiya] və اتينا [ətəyna]” sözlərinin Allahın yaradılışla bağlı iradəsini adi danışıq şəklində insanlara çatdırması kimi izah edir(۴).

YEKUN

Mərhum Şəhristaninin izahı ayənin ilkin zahiri mənası ilə daha uyğundur. Ayənin Yerin hərəkətinə bir işarə olması üçün heç bir maneə görmürük.

٧. وَالْجِبَالَ أَوْتَادًا

“Məgər Biz dağları da dirək etmədikmi?!”(۵)

səh:٩٥

---

١- [٢١٠] Şəhristani, “İslam və astronomiya”, səh. ۵٩-۶٠.

٢- [٢١١] “Quranın heyrətləndirici məsələləri”, səh. ٣۵.

٣- [٢١٢] “Təfsiri-nümunə”, c. ٢٠, səh ٢٢٢-٢٢٨.

۴- [٢١٣] “Əl-Mizan”, c. ٧, səh. ٣۶۶.

۵- [٢١۴] Nəbə, ٧.

وَأَلْقَى فِى الأَرْضِ رَوَاسِىَ أَن تَمِيدَ بِكُمْ

“Sizi yırğalamasın deyə, yer üzündə möhkəm dayanan dağlar yaratdı”(١).

Bəzi yazıçılar bu ayələrə əsaslanaraq Quranın Yerin öz oxu ətrafında fırlanmasından xəbər verdiyini qeyd etmişlər. İlk ayə haqqında yazırlar:

“Bildiyimiz kimi mismar bir şeyin hərəkət zamanı dağılmasından, uçmasından ehtiyat edilən zaman vurulur.”

Onlar C. Qamovun “Dağların əsas hissəsi Yer səthinin altındadır” fikrini qeyd edərək yazırlar:

“Maraqlıdır, Quran on dörd əsr öncə bu böyük sirrin üstünü açmışdır. Çünki Allahın dağları Yerin mismarı olaraq yaratmasının səbəbi budur ki, Yer hərəkət zamanı müvazinətini itirməsin, parçalanmasın.”

İkinci ayə haqqında isə yazırlar:

“Ehtimal ki, yuxardakı ayə (Nəhl, ١٥) Yerin öz oxu ətrafında fırlanması ilə bağlıdır”(٢).

Şəhristani yazır:

“Quranda dağların Yerin mismarı adlandırılması Yerin sükunətdə olmasına işarə deyil. Keçmiş alimlərin düşündüklərinin əksinə olaraq Yerin hərəkət etdiyini bildirir”(٣).

YEKUN

Yerin hərəkətlərindən biri materik hərəkəti və ya Yer kürəsinin bərk xarici qatı (Yer qabığı) ilə bağlıdır. Hansı ki,



---

١- [٢١٥] Nəhl, ١٥.

٢- [٢١٦] Gudərz Nəcəfi “Quranın heyrətləndirici məsələləri”, səh. ٣٦-٣٧, “Quran və hədislərdə yeni elmin işartıları”, c. ١, səh. ٧٥; Musəvi Lari, “İslam əqidələrinin əsasları c.

bu hərəkət bəzən zəlzələ və seysmik dalğaların meydana gəlməsi ilə nəticələnir. Məlum ayə Yerin dağların köməyi ilə müvazinətini qorumasına işarədir. Burada Yer qabığının hərəkətinə də işarə ola bilər. Lakin yuxarıdakı ayələr Yerin öz oxu ətrafında və ya orbit boyu hərəkətinə aid ola bilməz. Çünki Qurana görə dağlar özü də hərəkət .(edir(١

Deməli, alimlərin ayəni Yerin öz oxu ətrafında fırlanması ilə əlaqələndirmələrinin doğru .olduğu nəzərə çarpmır

## YERİN HƏRƏKƏTİ İLƏ BAĞLI SON SÖZ

Yerin hərəkəti və istinad olunan ayələr haqqında aşağıdakı məqamları nəzərdən .qaçırmaq lazım deyil

Qeyd olunan ١٣ ayəyə əsasən demək olar ki, Quran Yerin hərəkət etdiyini qəbul edir. .١ .Əlbəttə, bu ayələr hər biri fərqli hərəkətdən söhbət açır

Quranın işarə vurduğu elmi məqamlar o dönəmdə hakim olan Ptolomey təlimlərinə .٢ zidd idi. Çünki Ptolomey təlimlərinə görə Yer dünyanın mərkəzi və sükunətdə idi. Lakin Quran Yerin hərəkətindən söhbət açırdı. Bu Quranın xəbər verdiyi elmi bir məsələ idi. Hansı ki, təqribən ٩ əsr ondan sonra Kopernik tərəfindən sübuta yetirildi. Bu növ .məsələlər Quranın və Peyğəmbərin (s) əzəmətinin göstəricisidir

Quranın Yerin hərəkətindən xəbər verməsi onun əzəmətini göstərsə də elmi . ٣ möcüzələrindən hesab oluna bilməz. Çünki hələ Ptolomeydən öncə Samoslu Pifaqor, (e. ə. təqr. ٥٠٠-٥٨٠), Plutarx (e. ə. təqr. ۴۶-١٢٧), Samoslu Aristarx (e. ə. ٢-٣ əsrlər), Arximed (e. ə. təqr. ٢٨٧) və



---

.Nəml, ٨٨ [٢١٨] -١

başqaları Yerin hərəkət etdiyini söyləmişlər. Deməli, İslamdan öncə dünyanın elmi ictimaiyyəti Yerin hərəkət etdiyi və ya sükunətdə olduğu haqqında iki baxışla tanış idi. Onlardan biri hakim nəzəriyyə, yəni Yerin sükunətdə olması (Ptolomey təlimi), digəri isə məğlubiyyətə uğramış nəzəriyyə, yəni Yerin hərəkəti ilə bağlı versiya idi.

Elmi ecazkarlıq o zaman olur ki, heç kim Quranın verdiyi xəbəri (ondan öncə) bilmək iqtidarında olmasın. Halbuki Yerin hərəkəti nəzəriyyəsi Quran nazil olmazdan öncə bir elmi nəzəriyyə kimi irəli sürülmüşdür. Əlbəttə, bu, Quranın əzəmətinə kölgə salmır. Çünki Quran ən məşhur alimlərin Ptolomey təlimlərinin əsiri olduğu bir dönəmdə açıqca onun əksi olan elmi məsələlərdən söhbət açmışdır.

## QURANDA YERİN KÜRƏŞƏKİLLİ OLMASI İLƏ BAĞLI AYƏ VARMI?

Quranın Yerin kürəşəkilli olması haqqında söhbət açdığını əsaslandırmaq üçün "مشارق" [məşariq] və "مغارب" [məğarib] ifadələri olan ayələrə istinad olunmuşdur. Bu ayələr aşağıdakılardır.

فَلَا أُقْسِمُ بِرَبِّ الْمَشَارِقِ وَالْمَغَارِبِ إِنَّا لَقَادِرُونَ

"Məşriqlərin və məğriblərin Rəbbinə and olsun ki, Biz, həqiqətən, qadirik" (١).

"Zəif görünən o tayfanı yer üzünün daim xeyir-bərəkət verdiyimiz şərqlərinə və qərblərinə varis etdik" (٢).

"O, göylərin, Yerin və onların arasında olanların Rəbbidir. Məşriqlərin də Rəbbi Odur" (٣).



---

١- [٢١٩] Məaric, ٤٠.

٢- [٢٢٠] Əraf, ١٣٧.

٣- [٢٢١] Saffat, ٥.

Qeyd: İlk ayədə şərqlər və qərblər (məşriqlər və məğriblər) ifadələri mütləq şəkildə işlədilmiş, Yer, Günəş və ya ulduzlarla qeydlənməmişdir. İkinci ayə Yerin şərqləri və qərblərindən söhbət açır. Üçüncü ayə isə yalnız şərqlərdən söhbət açsa da onu Yer, .Günəş və ya ulduzlarla qeydləndirməmişdir

## QISA TARİX

İlk baxışdan Yerin düz (hamar) olduğu nəzərə çarpır. Bu ilkin təsəvvür antik dövrlərdən adi insanların əqidəsinə çevrilmişdir. Lakin elm adamları Yerin forması, hansı şəkildə olması haqqında fərqli fikirlər irəli sürmüşlər. Belə fikirlərdən bir neçəsinə :nəzər salaq

Anaksimen güman edirdi ki, Yer su üzərinə düşmüş bir qurğuşun parçası kimi fəzada .۱ asılı vəziyyətdə qalmışdır. O, düz (hamar) olduğu üçün suyun üzündə qalmışdır. Əgər .yığılarsa, suyun təkinə batar

Bəzi qədim kilsə nəzəriyyəçilərinə görə Yer vertikal (şaquli) formada olub, qeyri- .۲ .müəyyən bünövrələr üzərində bərkidilmişdir

Bəziləri Yerin konusvari olduğunu düşünürdülər. Onun başı yuxarıya, təki isə aşağıya .۳ .doğrudur. Alt hissəsi sonsuzdur

.Anaksimandra görə Yer girdə sütun şəklində idi .۴

.Bəziləri Yerin həcmcə kubşəkilli, formaca altı bucaqlı olduğunu düşünürdülər .۵

.Bəziləri Yerin dəf şəklində (çalğı aləti) olduğunu düşünürdülər .۶

.Bəziləri onun təbil (çalğı aləti) formasında olduğunu güman edirdilər .۷

.Heraklit Yeri içi boş gəmiyə bənzədirdi .۸

.Bəziləri onu yarımtəbil şəklində təsəvvür edirdilər .۹

.Bəziləri onu qalxan şəklində təsəvvür edirdilər .۱۰

.Bəzi yunanlılar düşünürdülər ki, Yer dairəvidir və Yunanıstan onun mərkəzidir .۱۱

Antik Yunanıstan və İran filosoflarının fikrincə, Yer tam kürəşəkilli, ekvator . ۱۲ müstəvisi qütbü ilə paraleldir. Qərbdə bu fikrin yaranması Amerikanın kəşf olunduğu dönəmə təsadüf edir (۱۴۹۲). Bəziləri bu nəzəriyyəni bütün erkən çağ İslam alimlərinə .aid etmişlər

Son illər Yerin formasının süni peyklərdə öyrənilməsi göstərmişdir ki, Yerin forması .۱۳ daha mürəkkəbdir, ürəyə (kardioid adlandırılmışdır) oxşayır. Şimal qütbü radiusunda planetimiz qabarıq, cənub qütbü radiusunda isə batıqdır. Bu nəzəriyyə bu gün üçün .(məşhur nəzəriyyədir. Məntiqi arqumentlər və elmi müşahidələr bunu təsdiq edir(۱

## QƏRB VƏ ŞƏRQ ELMİN GÖZÜ İLƏ

Şərq və qərb haqqındakı baxışları nəzərdən keçirməzdən öncə bir elmi məsələyə .diqqət yetirmək zəruridir

.Yer kürəsi Şimal və Cənub adlanan iki qütbə malikdir

Digər baxımdan isə Yer öz oxu və Günəş ətrafına fırlandığı üçün Yerdəki müşahidəçi səhər çağı Günəşin bir tərəfdən çıxıb, axşam çağı digər tərəfdən batdığını güman edir (Bu görmə hissinin yanılmasının nəticəsidir). Adi həyatda və bir elmi termin kimi .Günəşin doğduğu yerə şərq, batdığı yerə isə qərb deyilir

Hər bir insana nisbətdə yuxarı və aşağı anlayışları mövcuddur. Bu, göy və Yerdir. Deməli, hər bir insana



---

.Şəhristani, “İslam və astronomiya”, səh. ۳۲-۳۴ [۲۲۲] -۱

nisbətdə altı tərəf nəzərdə tutula bilər. Başqa sözlə desək, üzü Şimal qütbünə dayanmış müşahidəçinin ön tərəfi Şimala doğru, arxa tərəfi isə Cənuba doğru olur. Həmin müşahidəçinin sağında şərq, solunda isə qərb yerləşir. Yer kürəsində hər an Günəşin doğması (çıxması) və batması prosesi baş verir. Yəni Yer kürəşəkilli olduğundan daim Yerin bəzi nöqtələrində Günəş çıxır və bəzi nöqtələrində isə batır. Bundan başqa Günəş hər gün müəyyən saatda çıxır və müəyyən saatda da batır ki, öncəki günün günçıxan və günbatan saatları ilə fərqlənir. Deməli, hər bir müşahidəçinin dayandığı nöqtəyə nisbətdə şərq və qərb fərqli ola bilər. Yəni hər bir insan harda olursa olsun, ona nisbətdə bir şərq və bir qərb var. Belə də demək mümkündür ki, Yer kürəsinin şərqləri və qərbləri var və hər an yenilənir. Çünki Yer daim öz oxu ətrafında hərəkət edir və hər an Yerin müxtəlif nöqtələri üçün yeni şərq və qərb meydana gəlir. Bu mənada ilin günlərinin sayı qədər tülu (günün doğması) və .qürub (günün batması) mövcuddur. Nəticədə yeni şərq və yeni qərb mövcuddur

**ELMİ SİRLƏR**

Quranın Yerin kürəvi olmasına işarələr vurması haqqında müxtəlif fikirlər .söylənilmişdir ki, onlardan bir neçəsini diqqətinizə çatdırırıq

:Seyid Şəhristani Məaric surəsinin ۴۰-cı ayəsi haqqında yazır .۱

Allahın şərqlərə və qərblərə and içməsi şərq və qərbin çoxluğunu göstərir. Yeni“ kosmologiya da bunu sübut edir. Çünki Yerin kürəşəkilli olması hər an müşahidəçiyə nisbətdə Yerin bir nöqtəsinin şərq, digər nöqtəsinin isə qərb olduğuna gətirib çıxarır. .”Deməli, şərq və qərbin çoxluğu Yerin kürəşəkilli olması fikri ilə uyğun gəlir

.(O, sonda Yerin kürəvi olması ilə bağlı hədislərdən çoxlu sayda dəlillər göstərir(١

məğarib] ifadələri ilə bağlı iki ehtimal irəli]"مغارب" məşariq] və]"مشارق" Təfsirçilər . ٢ :sürmüşlər

a)Günəş hər gün yeni bir nöqtədən çıxır və yeni nöqtədə batır. Buna görə də ilin günlərinin sayı qədər şərq və qərb mövcuddur. Onlar bu fikri əsaslandırmaq üçün həzrət Əlinin (ə) İbn Kəvvanin sualına verdiyi "٣٦٥ şərq və qərb vardır" kəlamına istinad .edirlər

b)Yerin müxtəlif nöqtəsində şərq və qərb fərqlidir. Bəzən bir nöqtənin şərqi eyni zamanda digər nöqtənin qərbidir. Şərqlər və qərblər ifadəsi də üfüqlərin fərqlənməsi .ilə bağlıdır

Qeyd etmək lazımdır ki, Əraf surəsinin ١٣٧-ci ayəsi ikinci şərhə daha uyğundur. :"Təfsiri-nümunə"də bu haqda yazır

Yerin şərqləri və qərbləri ifadəsi Fironun hakimiyyətində olan geniş əraziləri nəzərdə" tutur. Çünki kiçik ərazilərdə fərqli şərqlər və qərblər, üfüq fərqlilikləri olmur. Lakin .(geniş ərazilərdə Yerin kürəvi olması ilə əlaqədar üfüqlər də fərqli olur"(٢

Saffat surəsinin ٥-ci ayəsində isə hər iki ehtimal keçərliliyi ilə yanaşı digər ehtimal da .əlavə etmək olar

.Birinci: Günəşin hər gün yeni bir nöqtədən çıxması

.İkinci: Yerin kürəviliyi ilə əlaqədar fərqli şərqlərin mövcudluğu

.Üçüncü: Müxtəlif ulduzların şərqləri

.(Hər halda məlum ayə Yerin kürəvi olması və şərqləri haqqındadır(٣



---

.İslam və astronomiya", səh. ٣٤-٣٥" [٢٢٣] -١

.Təfsiri-nümunə", c. ٦, səh ٣٢٩" [٢٢٤] -٢

Bəzi müasir yazıçılar hər üç ayəni Yerin kürəşəkilli olması ilə əlaqələndirir və bunu .۳ .(Quranın elmi möcüzəsi hesab edirlər(۱)

Mühəndis Sadat(۲), Şeyx Əhməd Muhyiddin əl-Əcuz(۳) və Şeyx Nəzih əl-Qəmiha(۴)da məlum ayədən (Məaric, ۴۰) Yerin kürəvi formada olduğunun başa düşüldüyünü önə .çəkmişlər

YEKUN

.Qeyd olunan ayələrlə bağlı bir neçə məqama diqqət yetirmək lazımdır

məğarib] ifadələri tam olaraq Yerin kürəvi olduğunu] "مغارب" məşariq] və] "مشارق" .۱ göstərmir. Yəni birbaşa "Yer kürəvidir" demir. Lakin şərqlər və qərblərin mövcudluğu Yerin kürəvi formada olmasını tələb edir. Deməli, qəti olaraq bu ayələrin Quranın elmi möcüzəsi olduğunu söyləmək olmaz. Bu incə ifadələrin elmi məsələlərə də işarə vurduğunu desək daha dəqiq olar. Çünki şərqlər və qərblərin mövcudluğu hər bir .müşahidəçi üçün hiss olunandır. Bu heç kimin gətirə bilməyəcəyi bir möcüzə deyil



---

Gudərz Nəcəfi, Quranın heyrətləndirici məsələləri", səh. ۲۸-۳۰; Əhməd Əmin, [۲۲۶] -۱ "Təkamülün yolu", c. ۷, səh. ۱۴۵; Yədullah Niyazmənd, "Quranın elmi ecazkarlığı müasir .elm baxımından", səh. ۱۸۹

.Əbədi möcüzə və həmişəyaşarlıq", səh. ۲۷-۲۸"[۲۲۷] -۲

.Məalim əl-Quran fi əvalim əl-əkvan", səh. ۳۸" [۲۲۸] -۳

.Əl-Quran yətəcəlla fi əsr əl-elm", səh. ۱۴۷"[۲۲۹] -۴

## (GÖYLƏRDƏ CANLI VARLIQLAR MÖVCUDDURMU? (YERDƏNKƏNAR SİVİLİZASİYA

Göy daim bəşər fikrini özünə məşğul edən varlıqlardandır. Göydə (Günəş sisteminin digər cisimlərində) həyatın mövcud olub-olmaması daim insanları düşündürmüşdür. Bəzi ayələrdə göydə (Kainatın planet tipli digər səma cisimlərində) həyat olduğuna .işarələr var. Təfsirçilər bu mövzu ilə bağlı aşağıdakı ayələrə istinad etmişlər

وَمِنْ آيَاتِهِ خَلْقُ السَّمَاوَاتِ وَالْأَرْضِ وَمَا بَثَّ فِيهِمَا مِن دَابَّةٍ وَهُوَ عَلَى جَمْعِهِمْ إِذَا يَشَاءُ قَدِيرٌ

Göyləri, Yeri və oralara yayıb səpələdiyi canlıları yaratmağı Onun qüdrət" (nişanələrindəndir. Allah istədiyi vaxt onları bir yerə yığmağa qadirdir!"(١)

QISA TARİX

İnsanlar əsrlər boyu Ptolomey təlimlərinə əsaslanaraq ulduzları göyün tavanına vurulmuş mismarlar hesab edirdilər. Lakin Kopernikin astronomik devrimindən və yeni nailiyyətlərdən sonra Yerdənkənar sivilizasiya haqqında düşünməyə başladılar. İnsanların digər göy cisimlərinə səfər etmək arzusu da mövcudluğu fərz olunan .Yerdənkənar sivilizasiyalarla əlaqə yaratmaqla bağlıdır

:Asimov "XX əsrin kəşfləri" əsərində yazır

Kosmik uçuşlar vasitəsilə əldə etdiyimiz məlumatlar göstərir ki, biz mütləq ulduzları" ələ keçirməliyik (onlara



---

.Şura, ٢٩[٢٣٠] -١

səfər etməliyik). Biz mütləq üstündə dostu, düşməni, nəhəngləri daşıyan planet tipli .(səma cisimlərini təsir altına almalıyıq”(۱

İlk insan Aya endikdən sonra bu maraq daha da çoxaldı(۲). Bu haqda geniş tədqiqat işləri, müşahidələr göstərir ki, yalnız bizim qalaktikada (Ağ yol) ۶۰۰ həyat mövcud olan səma cismi var. Bu ulduz və planet tipli cisimlərdə Yerdəki həyat formasına, sivilizasiyaya oxşar sivilizasiya mövcuddur. Hesablamalara görə bütövlükdə Kainatda .۶۰۰ milyon həyat forması olan cisim var

ABŞ və keçmiş SSRİ astronomunun birgə işləyib hazırladığı “Biz tək deyilik” tədqiqat əsərində göstərilir ki, bizim qalaktikada minimum ۱ milyard həyat üçün əlverişli olan .(planet tipli) cisim var

Bir çox astronomlara görə, Yeri Kainatda insan yaşayan yeganə cisim, Yerdəki həyat .(formalarını isə yaşayışın mümkün vahid formaları hesab etmək olmaz(۳

Əbd ər-Rəzzaq Nofel alimlərin Yerdənkənar sivilizasiya haqqında görüşlərini qeyd edir .(və digər səma cisimlərində həyat olması ehtimalına üstünlük verir(۴

Əbd əl-Qəni Yerdənkənar sivilizasiyanın mövcudluğunu üç aspektdən açıqlayır (elm, .(əql və Quran baxımından

O, əqli baxımdan fikirlərini belə əsaslandırır: Əgər digər səma cisimlərində həyat mövcud olmasa, bu, Allahın

səh:۱۰۵

---

.XX əsrin kəşfləri”, səh. ۶۷-۶۸“ [۲۳۱] -۱

Amerika astronavtları H. Armstronq və E. Oldrin ilk dəfə Aya enmiş (“Apollon-۱۱” [۲۳۲] -۲ gəmisi ilə) adamlardır (۲۱. ۷. ۱۹۶۹). “Apollon”un sonrakı buraxmışlarında daha ۱۰ adam .Ayda olmuşdur

.Kosmos əsrinin biliyi”, səh. ۱۶۸“ [۲۳۳] -۳

.Əl-Quran və əl-elm əl-hədis”, səh. ۲۰۰-۲۱۴“ [۲۳۴] -۴

hikmətinə ziddir. Geniş göy cisimləri yaradıb onları boş qoymaq sağlam ağıla müvafiq deyil(١).

Elmi baxımdan isə fikrini belə izah edir: Bütün varlıq aləmi (kimyəvi) tərkib, quruluş və ahəngdarlıq baxımından eynidir. Bu göstərir ki, bütün Kainatın vahid yaradıcısı var. Onların ilkin maddəsi eynidir və olarda mövcud həyat forması da Yerdəki həyat forması kimidir. Əgər bu gün alimlər Yerdənkənar sivilizasiyalar haqqında məlumat əldə edə bilməmişlərsə bu, digər səma cisimlərində həyatın mövcud olmaması demək deyil. Ehtimal ki, gələcəkdə digər alimlər yeni texniki imkanlar hesabına planet tipli digər səma cisimlərində həyatın mövcudluğunu sübuta yetirə biləcəklər(٢).

ELMİ SİRLƏR

Təfsirçilərin məlum ayə (Şura, ٢٩) haqqında söylədiklərinə nəzər salaq.

Əllamə Təbatəbai yuxarıdakı ayə haqqında yazır:

“Təfsiri-nümunə”də oxuyuruq:

“دابه” [dabbə] sözü ən kiçik həşəratdan başlayaraq nəhəng heyvanlara qədər bütün varlıqları əhatə edir. Məlum ayədən göylərdə canlı varlıqların yaşadığı anlaşılır. Alimlər isə bu haqda hələ də qəti bir söz deyə bilmirlər.

səh:١٠۶

---

١- [٢٣۵] “Quran və müasir elm”, səh. ٢٢١-٢٢٢.

٢- [٢٣۶] Yenə orada, səh. ٢٢٢-٢٢٣.

.(Onlar sadəcə bəzi planetlərin həyat üçün əlverişli olduğu ehtimalını irəli sürürlər"(١

:Həzrət Əlidən (ə) nəql olunan bir hədisdə deyilir

.(Səmada müşahidə etdiyiniz ulduzlarda da Yerdə olduğu kimi şəhərlər mövcuddur"(٢"

:Əbd ər-Rəzzaq Nofel bu haqda geniş söhbət açaraq yazır

."Quranda əsrlər öncə göylərdə də canlı varlıqların yaşadığı bildirilir"

O, bunun sübutu üçün Şura surəsinin ٢٩-cu ayəsinə əsaslanır və bildirir ki, Allah .(göylərdə və Yerdə mövcud olan canlı varlıqların hamısını bir yerə toplaya bilər(٣

Əbd əl-Qəni əl-Xətib məlum ayə haqqında danışarkən göy cisimlərində həyat olduğu (haqda fikirləri qeyd edir.(۴

:Zəməxşəri öz təfsirində yazır

.(Çox güman ki, göylərdə də Yerdə yaşayan canlıların bənzəri yaradılmışdır"(۵"

:Əbu Səid öz təfsirində yazır

."Göy cisimlərində də Yerdə olduğu kimi canlılar mövcuddur"

.(Fəxr Razi yazır: "Ehtimal ki, Allah göylərdə müxtəlif heyvanlar yaratmışdır"(۶

:Ayətullah Hüseyn Nuri yazır

Son zamanlar sovet alimləri bizim qalaktikada milyardlarla həyat üçün əlverişli olan" cisim olduğunu kəşf



---

.Təfsiri-nümunə", c. ٢٠, səh. ۵٨"[٢٣٧] -١

.Səfinə əl-bihar", c. ٢, səh. ۵٧۴" [٢٣٩] -٢

.Əl-Quran və əl-elm əl-hədis", səh. ٢١۴-٢١۶" [٢۴٠] -٣

.Quran və günün elmi", səh. ٢٢٩"[٢۴١] -۴

۵- [۲۴۲] “Əl-Kəşşaf, c. ۴, səh. ۲۲۵.

۶- [۲۴۳] “Təfsir əl-kəbir”, c. ۲۷, səh. ۱۷۱.

."etmişlər. Maraqlı burasıdır ki, Quran ۱۴ əsr öncə elmin bu nailiyyətindən xəbər verir

.O, məlum ayədə iki mühüm məqamın mövcudluğunu qeyd edir

.Göylərdə də Yerdə olduğu kimi canlı varlıqlar mövcuddur .۱

Allah istədiyi zaman bu varlıqlar bir-birindən xəbərdar olacaqlar (bir-birlərini . ۲ .(görəcəklər)(۱)

Əllamə Təbatəbaiyə aid edilən "Quranın ecazkarlığı" adlı kitabda məlum ayəyə (Şura, .۲۹) istinad olunaraq göy cisimlərində də həyat olduğu açıqlanır

Bir çox yazarlar yuxarıda qeyd olunan ayələrə əsaslanaraq (Şura, ۲۹; Nəhl, ۵۳; Nur, ۴۵) göy cisimlərində canlıların, hətta bitkilərin və abadlıqların (Buruc, ۲) mövcudluğu .(ehtimalını irəli sürmüşlər(۲)

YEKUN

Məlum ayəni (Şura, ۲۹) Yerdənkənar sivilizasiya ilə uyğunlaşdırmaqla bağlı bir neçə .məqamı diqqətdən qaçırmaq olmaz

səmavat] ifadələri Quranda bir neçə fərqli mənada] "سـموات" səma] və] "سـماء" .۱ işlənmişdir. Sözügedən açıqlama (təfsir) o zaman doğru olar ki, ayədə qeyd olunan ,səmavat] sözündən məqsədin göy cisimləri olduğu isbat edilsin. Bir halda ki] "سموات" dabbə]] "دابه" ,(səma] sözündən məqsəd Yeri əhatə edən qaz örtüyü (atmosfer] "سماء" sözündən məqsəd isə adi gözlə görülməyən kiçik varlıqlar (mikroblar) və ya göydə uçan quşlar olduğu fikri də irəli sürülə bilər. Lakin buna baxmayaraq, ayənin hər iki .açıqlamaya aid olduğu istisna edilmir



---

.Kosmos əsrinin biliyi", səh. ۱۶۸-۱۶۹" [۲۴۴] -۱

.Abbas Əli Mahmudi, "Quranda səma sakinləri" səh. ۹۵-۹۹"[۲۴۵] -۲

Əgər Yerdənkənar sivilizasiyanın mövcudluğunun elmi baxımdan isbat edilmədiyini, .٢ hələ də güclü bir ehtimal olduğunu nəzərə alsaq, bu fikri qəti olaraq Qurana aid edib .onun elmi möcüzəsi hesab edə bilmərik

Əgər ikinci ehtimalın üzərində dayansaq, o zaman ayədə hamının müşahidə etdiyi .٣ real həyatdan söhbət açıldığının şahidi olacağıq. Bu, Allahın nişanələrindəndir. Yəni Allah havanı elə bir şəraitdə yaratmışdır ki, quşlar orada sərbəst hərəkət edə bilirlər. Mikroblara gəldikdə isə erkən çağ ərəblərinin bu haqda məlumatsızlığını nəzərə alsaq, .buna elmi rəng verib Quranın möcüzələrindən hesab etmək olar

## ?QURANA GÖRƏ DÜNYANIN SONU NƏ ZAMAN VƏ NECƏ BAŞ VERƏCƏK

Quran Qiyaməti dünyanın sonu, yeni bir dünyanın başlanğıcı hesab edir. Bu səmavi kitab bir çox ayələrdə Qiyamət öncəsi baş verəcək hadisələrdən söhbət açır ki, .bunların bəziləri Qiyamətin nişanələrindən hesab olunur

Quran şərhçiləri və astronomlar mövcud Kainatın sonu ilə bağlı ayələri bir neçə qismə :ayırırlar

;a) Günəş və ulduzların sönükməsinə işarə vuran ayələr

وَإِذَا النُّجُومُ انكَدَرَتْ إِذَا الشَّمْسُ كُوِّرَتْ

And olsun günəşə və onun işığına (günəşin qalxdığı vaxta); And olsun (günəşin)“ (ardınca çıxan aya!”(١

.(Müəyyən vaxta qədər (səmada) dolanan Günəşi və Ayı ram edən məhz Allahdır”(٢“

;b) Ayın parçalanmasından söhbət açan ayələr



---

.Təkbir, ١-٢[٢٤٦] -١

.Rəd, ٢[٢٤٧] -٢

.(O saat (qiyamət) yaxınlaşdı və ay parçalandı”(۱“

;c) Səma və ulduzların mövcud düzümünün pozulması ilə bağlı ayələr

.(Göy parçalanacağı zaman; Ulduzlar dağılıb səpələnəcəyi zaman”(۲“

.(Günəşlə ay birləşəcəyi zaman”(۳“

;ç) Yerdə böyük zəlzələlərin baş verəcəyindən xəbər verən ayələr

”(Həqiqətən, qiyamət gününün (axır saatın) zəlzələsi dəhşətli şeydir!(۴“

;d) Dağların parçalanmasından söhbət açan ayələr

”(Dağlar isə didilmiş yun kimi olacaqdır!(۵“

;e) Dənizlərin od tutub yanmasından söhbət açan ayələr

.”(Dənizlər od tutub yanacağı (və ya dolub daşacağı) zaman(۶“

;ə) Səmanı tüstü bürüməsi haqqında danışan ayələr

”(Sən göyün aşkar bir dumana bürünəcəyi günü gözlə!(۷“



---

.Qəmər, ۱[۲۴۸] -۱

.(İnfitar, ۱-۲ (Haqqə, ۱۶; Furqan, ۲۵; Mürsəlat, ۹; Tur, ۹; İnşiqaq, ۱[۲۴۹] -۲

.(İnfitar, ۱-۲ (Haqqə, ۱۶; Furqan, ۲۵; Mürsəlat, ۹; Tur, ۹; İnşiqaq, ۱[۲۵۰] -۳

.(Həcc, ۱ (Muzzəmbil, ۱۴; Vaqiə, ۴; Zilzal, ۱-۲; Naziat, ۶-۷ [۲۵۱] -۴

.(Qariə, ۵ (Nəbə, ۲۰; Vaqiə, ۵-۶; Müzzəmmil, ۱۴; Haqqə, ۱۴; Tur, ۱۰[۲۵۱] -۵

.(Təkvir, ۶ (İnfitar, ۳ [۲۵۳] -۶

.Duxan, ۱۰[۲۵۴] -۷

## DÜNYANIN SONU HAQQINDA ELMİ FİKİRLƏR

:Kosmologiyada dünyanın sonu ilə bağlı iki məsələ müzakirə olunur

?Birinci: Kainatın genişlənməsinin sonu varmı

Dünya daim genişlənməkdədir. Qalaktikalar sürətlə bir-birlərindən ayrılmaqdadır. Bu genişlənmə prosesi daim davam edəcəkmi? Bu genişlənmə bir gün sona yetəcəkmi? :Alimlər bu suallara cavab olaraq üç ehtimal irəli sürürlər

;(a) Dünyanın genişlənməsi daimidir (sonsuzdur

b) Sonda dünya cazibə qüvvəsinin təsiri ilə sıxılaraq (yumularaq) bir nöqtəyə ;qayıdacaq

.c) Dünya daim partlayışlarla qarşı-qarşıyadır

Rus fiziki Aleksandr Fridman (١٨٨٨-١٩٢٥) ١٩٢٠-ci ildə göstərirdi ki, bu sualların cavabı .(Kainatın kütləsi ilə bağlıdır(١

?İkinci: Günəş, Yer və ulduzların sonu necə olacaq

Bəzi fizik və astronomların fikrincə, Günəş ١٠ mlrd. il istilik vermək qabiliyyətinə (malikdir. Hal-hazırda onun ömründən ٥ mlrd. il keçmişdir(٢). Deməli, planetimiz (Yer



---

Əgər dünyanın kifayət qədər kütləsi olarsa, sonda cazibə qüvvəsi onun [ ٢٥٥] -١ genişlənməsini saxlayacaq, göy cisimləri bir-birinə doğru hərəkət edəcək və nəhayət, onlar hamısı bir nöqtəyə toplaşacaq. Əks təqdirdə (yəni kifayət qədər kütlə olmadıqda) dünya genişlənməyini davam etdirəcək.Alimlər dünyanın kütləsini müəyyənləşdirməklə hansı variantın mümkün olduğunu üzə çıxarmaq istəyirlər .((Kosmos və qalaktika yolu, səh. ٥٠-٥٢

Dr. Erick "Yeni fizika", səh, ٢٠-٢١. O , yazır: "Günəş saniyədə ٥٦٤ mln.t hidrogen [٢٥٦] -٢ yandırır. Bu miqdardan ٥٦٠ t helium yaranır, ٤ mln.t isə digər maddələr (bunun yalnız ٧٪-i yanacaq kimi istifadə olunur) təşkil edir və enerjiyə çevrilir. Nəticədə işıq,

hələ ۵ milyard il Günəş ətrafında fırlanacaqdır. Günəş ömrünün son günlərində hava balonu tək şişərək nəhəng bir ulduz şəklini alacaq və günəş sisteminin iki planeti – .Venera (Karvanqıran) və Merkuri ilə birləşəcəkdir

Yer ۱۰۰۰ dərəcə istiliyə malik olacaq. Həyat izləri silinəcək. Bütün okeanlar buxara .(çevriləcək”(۱

:Bəzi nəzəriyyəçilər ulduzların sönükməsi haqqında yazırlar

Bütün ulduzlar istilik-nüvə reaksiyaları hesabına şüalandığından nəhayət bu“ şüalanma sona yetəcəkdir. Ulduzlar genişlənəcək və bundan yaranan parlaq qazlar (ulduzların üst qabığı) nağılvari şəkildə fəzaya səpələnəcək. Bunlar, “planetşəkilli dumanlıqlar” adlanır. Ulduzların nüvə ehtiyatı bitdikdə cazibə qüvvəsi onları öz təsiri altına salacaq və çox isti kül təpəciklərinə çevriləcəklər. Çox böyük ulduzlar baş verəcək bir partlayış nəticəsində öz parlaqlıqlarını itirəcəklər. Daxilində nüvə partlayışı baş verən ulduzların üst qabıqları kənara sıçrayacaq. Can verməkdə olan ulduz yalnız .(bir neçə saat enerji yayacaq”(۲

## ELMİ SİRLƏR

Bəzi təfsirçilər məlum ayələrin dünyanın sonu ilə bağlı kosmoloji nailiyyətlərlə üst-üstə .düşdüyü haqqında söhbət açmışlar

Ayətullah Məkarim Şirazi, “Pəyami-Quran” adlı təfsir əsərində dünyanın sonu ilə .۱ :bağlı ayələri təhlil edərkən “Təkvir” surəsinin ۱-۲-ci ayələri haqqında yazır

kuvvirət] sözü, bükülmək, yığılmaq (sıxılmaq) mənalarını ifadə edir. Bəzən isə] ”كورت“ sönükmək kimi tərcümə



---

.Yenə orada, ۵۴-۵۵ [۲۵۷] -۱

.Kosmos və qalaktika yolu”, səh. ۲۵-۲۶“ [۲۵۸] -۲

olunur. Ehtimal ki, Günəşə nisbətdə hər iki məna keçərlidir. Belə ki, günəş tədricən .(sıxılaraq (büzüşərək) parlaqlığını itirəcək (sönükəcək

inkədərət] sözü sönükmək, qaralmaq, çökmək, parçalanmaq mənalarını ifadə] "انکدرت" edir. Deməli, Qurana görə dünyanın sonunda Günəş sisteminin ən parlaq cismi .sönükəcək. Digər ulduzların da taleyi belədir

Alimlərin fikrincə Günəşin enerjisi onun daxilində gedən istilik-nüvə reaksiyalarından törəyir. Onun çəkisi hər gün ١ milyard ton azalır və bu onun tədricən sönükməsinə, .(parlaqlığını itirməsinə gətirib çıxarır"(١

:O, Günəş və Ayın cəmləşməsi ("Qiyamət", ٨) haqqında yazır

Çox güman ki, Günəş və Ayın cəmləşməsindən məqsəd Ayın cazibə müvazinətinin" .(pozulması nəticəsində mərkəzə, yəni Günəşə doğru cəzb olunmasıdır(٢

:İnfitar" surəsinin ١-٢-ci ayələri haqqında yazır"

Ulduzların da düzümü, cazibə müvazinəti pozulacaqdır. Çox güman ki, Quran da buna" .(işarə vurur"(٣

O, "İnfitar" surəsinin ٣ və "Təkvir" surəsinin ۶-cı ayələrini izah edərkən üç ehtimalı qeyd :edir

Birinci ehtimal: Su iki ünsürdən - oksigen və hidrogendən təşkil olunmuşdur. Bunlar hər ikisi yanmaq qabiliyyəti olan qazlardır. Suyun tərkibi ayrılacaq və böyük yanğınlar .törənəcək

İkinci ehtimal: Qiyamət öncəsi böyük zəlzələlər nəticəsində Yer yarılacaq və dənizlər .bir-birinə qovuşacaq

Üçüncü ehtimal: Dağların parçalanaraq dənizlərə tökülməsi və yaxud göydən yağan bərk cisimlərin

۱- [۲۵۹] “Pəyami- Quran”, c. ۶, səh. ۳۳-۳۴.

۲- [۲۶۰] Yenə orada, səh. ۳۵.

۳- [۲۶۱] “Pəyami-Quran”, c. ۶, səh. ۳۵

okeanlara düşməsi suyun daşmasına və bütün quru əraziləri su basmasına gətirib .çıxaracaqdır

Yazıçılardan biri Qiyamət surəsinin ٩-cu ayəsinə toxunaraq gerçəkliyə hakim olan .٢ :mövcud düzümün pozulması haqqında yazır

Atom nüvəsi ilə onun ətrafına fırlanan elektronlar arasındakı boşluq onların" kütlələrinə nisbətdə çox genişdir. Əgər bir atomun ١ kmolduğunu şərtləşsək, onun yalnız ١ m-ini nüvə və proton tutur. Elektron isə ١ km-lik fasilədə nüvə ətrafında .(hərəkət edir (fırlanır

Əslində bütün varlıqlar (canlı və ya cansız) atomlardan təşkil olunmuşdur. Əgər atomlar arasındakı məsafə və boşluq aradan getsə, bütün varlıqlar öncəki çəkilərini qorumaq şərtilə olduqca kiçik varlıqlara çevrilər və bu zaman bütöv maddi aləm bir .(göz qırpımında dağılar. Yer kürəsi kiçik bir narınc şəklini alar(١

Sonra göy cisimləri kiçik yumaq (şar) şəklinə düşərək bir-biri ilə toqquşacaqlar. Bu elmi həqiqət (böyük Köpək bürcündə) Sirius adlanan çox böyük bir ulduzun bir anda kiçik bir .(ulduza çevrilməsi zamanı isbat olundu"(٢

Bəziləri Təkvir, ٣ ayəsini suyun tərkibində oksigen atomunun hidrogendən ayrılması .٣ .(kimi izah edirlər(٣

Bəzi müasir yazıçılar Təkvir surəsinin ١, İnfitar surəsinin ١ və ٢-ci ayələrinə .٤ toxunaraq Günəş və ulduzların sönükməsi haqqında bir neçə nəzəriyyəni qeyd :etmişlər



---

Joliot adlı bir alim yazır: "Əgər insan bədəninin atomlarının məsafələri aradan [٢۶٢] -١ qalxarsa, o, çəkisini qorumaqla, misal üçün, ٧٠ kq çəkili insan ٧٠ kq mikrob şəklinə .düşər. Belə ki, onu yalnız mikroskopla görmək mümkün olar

.Quranın heyrətləndirici məsələləri", səh. ١٢٩-١٣١" [٢۶٣] -٢

Təkamülün yolu", səh. c. ٣, səh. ١٨٩; "Quranın heyrətləndirici məsələləri", səh."[٢۶۴] -٣

:a) Doktor C. Qamov yazır

Elə bir gün gələcək ki, Yer (eləcə də digər planetlər) böyük bir partlayış nəticəsində“
.(qaz-toz şəklinə düşəcəklər”(١

:b) Professor A. Maseviç yazır

.(Bir gün Günəşin hidrogen ehtiyatı nüvə reaksiyaları nəticəsində bitəcək”(٢“

:c) Elm adamlarından biri yazır

Termodinamik prinsiplərə görə bütün cisimlər getdikcə hərarətini itirir. Elə bir gün“ gələcək ki, bütün cisimlərin hərarəti bərabər səviyyəyə enəcək və bu, bütün .(varlıqların, göy cisimlərinin məhvinə gətirib çıxaracaq”(٣

:Bəzi yazıçılar Ayın parçalanması (Qəmər, ١) haqqında yazır .٥

Son dövrlərdə astronomlar belə bir nəticəyə gəlmişlər ki, bir gün Ay iki və ya daha çox“ .hissəyə bölünəcək. Bunlar da öz növbəsində partlayaraq min dəfələrlə bölünəcəklər

Avropa astronomuJeames göstərir ki, gələcəkdə Ay Yerə son dərəcə yaxınlaşacaq. Bu .(zaman Yer çökmək təhlükəsi ilə üzləşəcək”(۴

Əbd ər-Rəzzaq Nofel də dünyanın sonu, Günəş və Ayın taleyi haqqında bir neçə .۶ .nəzəriyyənin mövcud olduğunu göstərir

Əhməd Məhəmməd Süleyman məlum ayələr haqqında bir neçə ehtimalı qeyd .٧ duxan] sözünü] ”دخان“ etdikdən sonra Duxan surəsinin ١٠-cu ayəsində sözügedən



---

.Günəşin sonu”, səh. ١۶٣“ [٢۶٥] -١

.Quranın heyrətləndirici məsələləri”, səh. ١٣۴“ [٢۶۶] -٢

.Məhdi Bazərqan, “Sonsuz yol”, səh. ۴٩٠; “Təkamülün yolu”, səh. ١٨٣ [٢۶٧] -٣

.Dünyanın keçmişi və gələcəyi”, səh. ١٨٣“ [٢۶٨] -۴

alov kimi tərcümə edir və dünyanın sonu ilə əlaqələndirir. Sonra Günəşin partlaması və sönükməsi ehtimallarını qeyd edərək bildirir ki, Yer ya Günəşin istisindən törənən alov, .(ya da onun sönükməsindən qaynaqlanan şaxta nəticəsində məhv olacaq(١

Bəzi alimlər Duxan surəsinin ١٠-cu ayəsini ilahi möcüzə hesab edir və bildirirlər ki, .٨ .(duxan] (tüstü) olacaq və bu elmi bir həqiqətdir(٢] "دخان" dünya Qiyamətdə

YEKUN

Qeyd olunan fikirlərin dünyanın sonu ilə uyğun olduğuna baxmayaraq, bir neçə .məqama diqqət yetirmək lazımdır

Ayın parçalanması haqqında (Qəmər, ١) qeyd olunanlar iki cəhətdən tənqid oluna .١ .bilər

Birincisi, qeyd olunan elmi məsələlər qəti olaraq sübuta yetirilməmişdir. Ayın parçalanacağının elmi səbəbləri qeyd olunmayıb, sadəcə onun Yerə yaxınlaşması önə çəkilmişdir. Bu versiya doğru olsa belə Ayın Yerə cəzb olunması nəticəsində baş verir. Bir halda ki, Quran Qiyamət öncəsi Günəş və Ayın bir yerə toplaşmasından söhbət açır .((Qiyamət, ٩

:İkincisi, təfsirçilər Ayın parçalanması haqqında iki ehtimalı qeyd edirlər

a) Ayədən məqsəd Peyğəmbər (s) dönəmində baş vermiş məşhur "Şəqq əl-qəmər" (Ayın bölünməsi) möcüzəsidir. Hansı ki, bu möcüzə özü Qiyamətin yaxınlaşmasını göstərən nişanələrdəndir. Necə ki, sonuncu



---

Quran və elm", səh. ۶٨-٧١" [٢۶٩] -١

ftnref٢٧٠_ -٢

.Peyğəmbərin (s) gəlişi özü də Qiyamətin yaxınlaşmasının əlamətlərindəndir

.b) Ayədən məqsəd Ayın Qiyamət zamanı parçalanmasıdır

Duxan" surəsinin ١٠-cu ayəsi haqqında təfsir kitablarında üç ehtimal irəli" .٢ .sürülmüşdür

.Birinci ehtimal: Ayədə məqsəd odlu tüstüdür. Hansı ki, Qiyamətin əzablarından biridir

İkinci ehtimal: Ayədə məqsəd tüstü sözünün məcazi mənasıdır. Yəni məqsəd .Peyğəmbər (s) dönəmində kafirləri əhatə edən quraqlıqdır

.Üçüncü ehtimal: Məqsəd Qiyamət öncəsi hər yeri bürüyəcək tüstüdür

Təfsirçilərə görə ilk iki ehtimal zəifdir. Üçüncü ehtimal isə daha məqsədəuyğundur. .(Bunu təsdiq edən çoxsaylı rəvayətlər də mövcuddur(١)

Hər halda Əhməd Məhəmməd Süleymanın irəli sürdüyü fikir (tüstüdən məqsədin alov .olması fikri) leksik və hədis baxımdan təsdiq olunmur

Quranda Günəş və ulduzların sönükməsi, onların düzümünün dağılması haqqında .٣ ümumi işarələr olsa da bu haqda qəti elmi nəzəriyyə mövcud olmadığı üçün bu və ya .digər versiyanı Qurana aid etmək yanlışdır

succirət] ifadələrinin suyun tərkibindəki atomların] "ســجرت" fuccirət] və] "فجرت" .۴ partlaması ilə bağlı olması haqqında heç bir tutarlı dəlil yoxdur. Oksigenin hidrogendən "فجرت" ayrılmasını da yalnız bir ehtimal olaraq önə çəkmək olar. Digər açıqlamalar da .succirət] ifadələrinə yaddır] "سجرت" fuccirət] və]

səh:١١٧

---

Pəyami-Quran", c. ۶, səh. ٢۵-٢٧; "Təfsir əl-kəbir", c. ٢٧, səh. ٢۴٢; "Ruh əl-məani"," [٢٧١] -١ .c. ٢۵, səh. ١٠٧; "Bihar əl-ənvar", c. ۵٢, səh. ٢٠٩; "Dürr əl-mənsur", c. ۶, səh. ٢٩

Quranın Günəşin, ulduzlar və digər planetlərin sonu haqqında işarələri mövcud elmi .۵ nəzrəiyyələrə müəyyən qədər uyğundur. Bu bir növ elmi sirlərin üstünün açılması hesab olunur. Lakin bir gün bu qəti olaraq öz elmi sübutunu taparsa o zaman Quranın .elmi möcüzəsi hesab oluna bilər

## ÜÇÜNCÜ FƏSİL

## QURAN VƏ RİYAZİ ELMLƏR

Son illərdə qələm sahibləri Quranın ecazkarlığının digər tərəfi, ədədlərlə bağlı möcüzələri haqqında fikir yürütməyə başlamışlar. Onların fikrincə Quranda riyazi bir ahəngdarlıq mövcuddur. Əlbəttə, bu fikrin izlərinə ilk olaraq Syutinin "əl-İtqan" .(əsərində rast gəlirik(١

Son illərədək bu elmi sirrin üstü açılmamışdı. Kompyuterin meydana gəlməsi bu yeni yaranmış fikrin inkişafına təkan verdi və Quranın ecazkarlığını bir daha sübuta yetirdi. Sözügedən qələm sahibləri bu vasitə ilə digər nəticələr də əldə edirlər ki, qarşıda bu haqda söhbət açacağıq. Bu sahədə tədqiqat aparan elm adamlarının önündə gedən .adlar Rəşad Xəlifə, Əbd ər-Rəzzaq və başqalarıdır

Qarşıda isə bu fikirləri qəbul etməməkdə israrlı olan digər Quran şərhçiləri var. Belə ki, bəziləri bu hesablamaları yanlış, bəziləri isə daha da irəli gedərək Bəhailiyin fitnəsi, yanlış yolda olan təmayülçü bir cərəyan



---

Bizim bu kitabda tədqiq etdiyimiz mövzu Quranın elmi ecazkarlığıdır. Elmdən isə [٢٧٢]-١ məqsədimiz təcrübi elmlərdir. Deməli, Quranın ədədlərlə bağlı ecazkarlığı bizim mübahisə obyektimizdən kənardır; çünki riyaziyyat rasional (əqli) elimlərdəndir. Lakin bu məsələ böyük əhəmiyyət daşıdığı üçün Quranın elmi ecazkarlığı ilə bağlı bir çox kitablarda haqqında söhbət açılmışdır. Digər tərəfdən də elmi ecazkarlıq sözün geniş mənasında bütün elmləri (rasional, ənənəvi, empirik, intuitiv və s.) əhatə edir. Bütün .bunları nəzərə alıb Quranın ədədlərlə bağlı möcüzələrinə də qısaca toxunduq

hesab edir və buna dəlil olaraq Rəşad Xəlifənin peyğəmbərlik iddia etdiyi üçün .öldürüldüyünü göstərirlər

Biz öncə hər iki fikrin tərəfdarları və onların kitabları haqqında məlumat verəcək və :sonda yekun fikrimizi diqqətinizə çatdıracağıq

;a) Quranın ədədlərlə bağlı ecazkarlığını qəbul edənlər

Bu haqda çoxlu sayda elm adamları kitab yazmışlar. Burada bir neçə mühüm əsəri .diqqətinizə çatdırırıq

.Möcüzə əl-Quran əl-kərim", Doktor Rəşad Xəlifə" .١

Doktor Rəşad Xəlifə Misirin "Təntə" şəhərində sufi ailəsində dünyaya göz açdı. O, ١٩٧١-.ci ildə Məkkədə rəsmi şəkildə təsəvvüf xələfləri cərgəsinə qoşuldu

Yeni təhsilini Qahirə "Eyn əş-şəms" Kənd Təsərrüfatı Universitetində başa vurdu. Sonradan Arizona universitetində aspiranturanı (١٩٥٩-١٩٦١), Kaliforniya universitetində .isə doktoranturanı (١٩٦٢-١٩٦٤) Bitki Biologiyası fakültəsində bitirdi

O, üç il müddətində kompyuterdən istifadə edərək Quran haqqında tədqiqat apardı. Bu tədqiqatın nəticəsini ١٣٥١ h. ş. ilində dünya mediyasına açıqladı. Onun "Möcüzə Quran əl-Kərim" əsəri ١٩٨٣-cü ildə çapdan çıxdı. Çox keçmədən Amerikada ingilis .variantı çap olundu

Rəşad Xəlifənin bütün səyi Quranda "müqəttəə" hərflərin sirlərini açmağa yönəlmişdir. O, sübut edir ki, surələrin başlanğıcında yerləşən "müqəttəə" hərflər həmin surənin hərfləri ilə sıx əlaqədədir. O, bu hesablamaları aparmaq üçün kompyuterdən kömək almış və bildirmişdir ki, Quranın ٢٩ surəsində "müqəttəə" hərf

.var. Bu hərflərin məcmusu ərəb əlifbasının ٢٨-hərfini təşkil edir

.O, bu hərflərin ١١٤ surəyə nisbətini tədqiq etmiş və maraqlı nəticələr əldə etmişdir

.surəsində digər surələrə nisbətdə çoxluq təşkil edir " ن و القلم" hərfi "ن"

O, ١٩ ədədinin (Müddəssir, ٣٠) Quranda özünəməxsus yeri olduğunu qeyd edir və bəzi ayə və sözlərin sayını ona tətbiq edərək riyazi bir düzüm qarşıya qoyur. O, çoxsaylı hesablamalarla, riyazi cədvəllərlə bunu isbat etməyə çalışır və aşağıdakı nəticəni əldə :edir

a)Quran Allah kəlamıdır. "Müqəttəə" hərflər özünəməxsus yerlərində yerləşdirilməklə əlifba hərflərinin Quran boyunca dəqiq paylanmasını göstərir. Belə bir inkişaf etmiş .üslubun bəşər tərəfindən təqdim oluna biləcəyini heç kim iddia edə bilməz

O, Quranın ecazkarlığını bu yolla sübut etməyə çalışır. Hətta həzrət Musa (ə) və İsanın .(ə) da möcüzələrini Quranla sübut edir

;b)Quran surələrinin mövcud tərtibi bilavasitə Allahın ilhamıdır

;c)Quran surələrinin bugünkü ardıcıllıqla Allah tərəfindən nazil olması

;ç)Surələrin nazil olduğu məkanın (Məkkə və ya Mədinə) təsdiqlənməsi

d)Quranda sözlərin məxsus qaydada yazılması bilavasitə Allahın göstərişidir. Buna ;görə də Quranda sözlərin yazılışının dəyişilməməsini tövsiyə edir

;e)Surələrin ayələrə bölünməsi Allahın əmri ilə gerçəkləşmişdir

ayəsi hər bir surənin ayrılmaz hissəsidir (Tövbə surəsindən başqa). بسم الله الرحمن الرحيم (ə) .O, bunu da riyazi yollarla sübut edir

."Quranın ecazkarlığı", müqəttəə hərflərin statistik təhlili" .٢

Kitabın Müəllifi Rəşad Xəlifədir. Tərcümə və əlavələr isə Seyid Məhəmməd Təqi Ayətullahiyə məxsusdur. Tərcüməçi bu kitabı ingiliscədən çevirmiş, bəzi əlavələr də .etmişdir

.XX əsrin möcüzəsi", İbn Xəlifə" .٣

O, ١١٠ səhifədən ibarət əsərində Quranın əmrlərinin ٩٠٪-nin yeddi, üç və ya bir .olduğunu və təkrarlanması zəruri olduğunu qeyd etmişdir

ibadət edin) əmri üç dəfə ümumkütləyə müraciətlə qeyd olunmuşdur.) اعبدوا ,Misal üçün Eyni ifadə ilə üç dəfə məkkəlilərə, üç dəfə İslam peyğəmbərinə (s) müraciət olunmuşdur. Şüeyb (ə), Nuh (ə), Hud (ə), Saleh (ə) və İsa (ə) hər biri üç dəfə öz .qövmünə bu ibarə ilə müraciət etmişdir. Bu, çox qəribə bir sirdir

.O, bu ədəd düzümünü Quranın elmi möcüzəsi hesab edir

.Əl-Mənzumat əl-ədədiyyə fil-Quran", Mustafa Əbu Yusif Bədran" .٤

"الله" Bu kitab ٨٨ səhifədən ibarətdir. Əsasən müqəttəə hərflərin riyazi əlaqələrini və .sözünün müxtəlif variantlarını tədqiq edir

.Əl-Ecaz əl-ədədi lil-Quran əl-kərim", Əbd ər-Rəzzaq Nofel" .٥

Bu kitab üç cilddə çap olunmuş, sonradan Mustafa Hüseyni Təbatəbai tərəfindən tərcümə edilmişdir. O, Quranda sözlərin təkrar olunmasının ümumi bir qayda ilə həyata keçirildiyini iddia edir. Misal üçün, dünya sözü ١١٥, axirət sözü də ١١٥

dəfə işlənmişdir. Şeytan və Məlaikə sözləri hər biri ۶۸ dəfə işlənmişdir. Həyat və ölüm .sözləri ۱۴۵ dəfə işlənmişdir

O, bunu bir möcüzə kimi qiymətləndirir və bildirir ki, Quranın sözlərindəki bu ahəngdarlıq onun vəhydən başqa bir şey olmadığının sübutudur. Çünki bu insan .qüdrətinin, bəşər ağlının fövqündədir

۶. "Ecazatun hədisətun elmiyyətun və rəqəmiyyətun fil-Quran", Doktor Rafiq Əbu əs-Süud.

O, kitabının bir fəslində Quranın ədədlərlə bağlı möcüzələrindən söhbət açır və Əbd ər-Rəzzaqın fikirlərinə bənzər fikirlər söyləyir. Misal üçün, diqqəti aşağıdakı sözlərin .Quranda işlənməsinə yönəldir

;ər- Rəhman ۵۷, ər-Rəhim ۱۱۴ dəfə

;əl- Cəza ۱۱۷, əl- Məğfirə ۲۳۴ dəfə

;əl- Fuccar ۳, əl-Əbrar ۶ dəfə

;əl- Üsr ۱۲, əl- Yüsr ۳۶ dəfə

;Qul ۳۳۲, Qalu ۳۳۲ dəfə

;İblis ۱۱, İstəazəllah ۱۱ dəfə

;əl- Müsibət ۷۵, əş- Şükr ۷۵ dəfə

;əl- Cəhr ۱۶, əl- Əlaniyə ۱۶ dəfə

;əş- Şiddə ۱۰۲, əs- Səbr ۱۰۲ dəfə

;əl- Məhəbbə ۸۳, ət-Taət ۸۳ dəfə

۷. "Sistemlər metodunun işlədilməsi", L. Rossel. O, kitabın bir fəslində Rəşad Xəlifənin .qeydlərini tərcümə edir

۸. "Quranda ۱۹ möcüzəsi", Bəssam Nahad Cərrar. O, Rəşad Xəlifənin riyazi

hesablamalarını izah edərək ona iradlarını bildirir və ۱۹ ədədinin ecazkarlığının yeni izahını verir. Quranda sözü gedən ۳۸ ədəd mövcuddur. Bu ۱۹ ədədinin toplanmasından alınan ədəddir. Quranda düzgün

şəkildə işlənən ədədlərin sayı ۲۸۵- dir. Bu da ۱۹ ədədinin toplanması nəticəsində .(meydana gəlir (۱۵ x ۱۹ = ۲۸۵

.Təfsiri-nümunə", Ayətullah Məkarim Şirazi" .۹

O, təfsir əsərinin ikinci cildində Ali-İmran surəsinin birinci ayəsini izah edərkən Doktor Rəşad Xəlifənin fikirlərini geniş şəkildə qeyd edir, haqqında fikir yürütmək üçün isə .ətraflı tədqiqata ehtiyac olduğunu vurğulayır

:O, Rəşad Xəlifənin fikirlərini qeyd etdikdən sonra aşağıdakı nəticələri alır

;a) Quranın orijinal yazı xəttini qoruyun

;b) Bunlar Quranın təhrif olunmadığını bir daha təsdiq edir

c) Dolğun mənalı işarələr (Müqəttəə hərflərdən sonra Quranın haqq tərəfindən ;(göndərildiyi qeyd olunur

O, yekun olaraq yazır: "۲۳ il ərzində Peyğəmbərə (ə) nazil olan Quranda o qədər dəqiq hesablamalar mövcuddur ki, onları qorumaq yalnız elektron beyinlərin bacaracağı .(işdir(۱

.Quranın ədədlərlə bağlı ecazkarlığı və iradlara cavab", Mahmud Əhmədi .۱۰

.O, Əbd ər-Rəzzaq və Rəşad Xəlifəyə ünvanlanan iradlara cavab verməyə çalışır

.Əl- Möcüzə", Ədnan Rəfai" .۱۱

Burada da Əbd Ər-Rəzzaq Nofelin və Rafiq Əbu Səidin fikirlərinə oxşar fikirlər qeyd .edir

.Əl-Ecaz əl-ədədi fi surəti əl-fatihə", Təlhə Cövhər" .۱۲

Muddəssir,) " تسعه عشر " ayəsini بسم الله الرحمن الرحيم O, əsasən ۱۹ ədədindən söhbət açır və ۳۰) ayəsi ilə müqayisə edir. Sonda isə ۱۹ hərfdən ibarət ayələri toplamış və

.Quranın ədədlərlə bağlı riyazi ecazkarlığını sübut etməyə çalışmışdır

.Quranda tək və cüt möcüzəsi”, Kuruş Cəmnişan“ .۱۳

O, Fəcr surəsinin cüt və təkə and içilən üçüncü ayəsinə əsaslanaraq Quranda tək və cüt ədədlər sistemi olduğu fikrinə düşmüşdür. Nəticədə cüt ədədlərin tam olaraq Quran ayələrinin sayına bərabər, yəni ۶۲۳۶, tək ədədlərin isə bütün surələrin sayının cəminə bərabər, yəni ۶۵۵۵ olduğu anlaşılmış və beləcə Quranın ecazkarlığının digər .tərəfi də üzə çıxmışdır

.Mavərai-ehtimal”, Abdullah Ərik“ .۱۴

adlı məqalə yazmış və Tövbə بسم الله المفقوده Bəzi yazıçılar yuxarıdakı kitaba əsaslanaraq ayəsinin olmaması, Nəml surəsində isə təkrar olunmasının بسم الله الرحمن الرحیم surəsində .çox hikmətli bir fakt və Quranın ecazkarlığına sübut olduğunu vurğulamışlar

.Minəl-ecaz əl-bəlaği və əl-ədədi”, Doktor Əbu Zöhrə Nəcdi“ .۱۵

.b) Quranın ədədlərlə bağlı ecazkarlığını qəbul etməyənlər

Bu haqda bir neçə kitab və məqaləyə rast gəldik. Burada onlara qısa nəzər salacaq və .dəlilləri ilə tanış olacağıq

Tisətu əşərə məlikən” (Quranın ədədlərlə bağlı ecazkarlığının Bəhailiyin hiyləsi“ .۱ .olduğu haqqında), Hüseyn Naci Məhəmməd Muhyiddin

O, ١٩ ədədini Quranın möcüzəsi və sirlərindən hesab edənlərə qarşı çıxır və onların .Allahın adından yalan danışdıqlarını iddia edir

O, ١٩ ədədinin Bəhailiyin şüarlarından olduğunu qeyd edir və bildirir ki, onlar müsəlmanlara görə mürtəd və kafirdirlər. Onlara görə hər il ١٩ ay, hər ay ١٩ gündür. "Əl-Bəyan" adlanan kitabları ١٩ fəsildən, hər fəsil ١٩ hissədən ibarətdir. Onların .gündəlik namazlarının sayı ١٩ rəkətdir

O, kitabın digər hissəsində ١٩ ədədinin Qurana xas olmadığını bildirir və Quranın .ədədlərlə bağlı möcüzəsi haqqında yazanların yanlışlıqlarından nümunələr göstərir

.Əl-Möcüzə əl-Quraniyyə", Doktor Məhəmməd Həsən Hitu" .٢

.O da Hüseyn Nacinin fikirlərini təkrar və təsdiq edir

.Quranda ١٩ möcüzəsi", Bəssam Nəhad Cərrar" .٣

O özü Quranda ١٩ ədədi ilə bağlı möcüzəni qəbul etsə də Rəşad Xəlifənin yanlış :fikirlərini açıqlayaraq yazır

Hərflərin surələrdə təkrar olunmasını araşdırdıqdan sonra gördüm ki, Rəşad Xəlifə" ."istədiyi nəticəni almaq üçün bilərəkdən yalan danışmışdır

.Quranın ədədlərlə bağlı möcüzəsi və riyazi düzümü", Abbas Yəzdani" .۴

O, uyğun məqaləsində Quranın ədədlərlə bağlı riyazi ecazkarlığını qəbul edənlərin yanlışlıqları haqqında danışır və bu təmayülçü cərəyanın insanlarda çaşqınlıq .yaratdığını bildirir

ayəsi ١٩ hərfdən ibarətdir. Bu ilk ayənin bütün بسم الله الرحمن الرحيم :Rəşad Xəlifə yazırdı
dəfə ١١۴ رحيم ,۵٧ رحمن ,٢۶٩٨ الله ,١٩ "بسم الله" sözləri ١٩-a bölünəndir. Belə ki, ümumilikdə
sözündən الله işlənmişdir. Halbuki bu rəqəmlərdən yalnız ۵٧ rəqəmi doğrudur. Əgər
sözlərini فالله، لله، تالله، بالله اللهم məlum nəticəni almaq istəsək

səh:١٢۶

isə بسم ,sözü Quranda ٢٢ dəfə اسم .sözü isə hesablanmamalıdır اللهـم .də hesablamalıyıq
.yalnız ٧ dəfə işlənmişdir

yəvm] (gün) sözünün Quranda ٣٦٥ dəfə işlənməsi fikrinə cavab] يوم O, Ədnan Rəfainin
يومهم ، يـومكم ، يـومئـذ ,yəvm] sözünün tək şəklini nəzərdə tutmuş] يـوم ,olaraq yazır: “O
.”sözlərini nəzərdən qaçırmamışdır فا ليوم ، باليوم ifadələrini hesablamadığı bir halda

.Ümumilikdə bu növ hesablamalarda məntiqi üsluba riayət olunmamışdır

:O, Kuruş Cəmnişana cavab olaraq yazır

Bu fikrin əsaslı iradı ondadır ki, Quranın ecazkarlığını sübuta yetirmir. Çünki istənilən“ qələm sahibi kitab yazıb onun fəsillərinin, cümlələrinin sayında belə bir düzüm nəzərdə .”tuta bilər

:Əbd ər-Rəzzaq Nofelə irad tutaraq yazır

sözü ١٧ dəfə deyil, ٧ dəfə استعاذه İblis sözünün Quranda ١١ dəfə işlənməsi doğru olsa da“ işlənmişdir. Bundan başqa hər biri ٧٥ dəfə işlənən müsibət və şükür anlayışları arasında nə əlaqə olduğu aydın deyil. Əgər söylənilən riyazi ahəngdarlıqlar doğru olsa belə bu Quranın bəşər qüdrəti xaricində bir kitab olduğunu isbat etmir. Çünki istənilən .(şəxs bu kimi riyazi düzümə malik bir kitab yaza bilər”(١

:O, sonda aşağıdakı nəticələri qeyd edir

Rəşad Xəlifənin önə çəkdiyi riyazi ecazkarlığın izləri Syutinin “əl-İtqan” əsərində . ١ .mövcuddur



---

Bu əsaslandırma yanlışdır. Öncədən bir alim tərəfindən riyazi məqsədlə yazılan [٢٧۴] -١ kitabı Quranla müqayisə etmək olmaz. Çünki Quran ٢٣ il ərzində təhsilsiz bir şəxs tərəfindən təqdim olunmuşdur. Bundan başqa əgər həqiqətən bu riyazi düzümün möcüzə olduğu sübut olunarsa, gələcəkdə belə bir işin görülə biləcəyi ehtimalı indiki .möcüzəni istisna etmir. Çünki bu cür uzaq ehtimallar daim olmuşdur

Bu yanlış cərəyandır və Quran maarifinin yayılmasına heç bir xidmət etməmişdir. .۲ Rəşad Xəlifə məlum yanlış fikirləri nəticəsində Qiyamətin vaxtını dəqiqləşdirdi (h. q. .(۱۷۰۹) və peyğəmbərlik iddiası etdi (sonda isə öldürüldü

.Quranın riyazi düzümü haqqında verilən statistik rəqəmlər bir çox hallarda yanlışdır .۳

.Söz və hərflərin sayılmasında vahid bir metod nəzərdə tutulmayıb .۴

Əgər Quranda sözlərin təkrar olunmasında xüsusi bir ahəngdarlıq varsa da bu .۵ Quranın ecazkarlığını isbat etmir. Çünki bu dəqiq yazılar bəşər yazı nümunələrində də .mövcuddur

.Alınan nəticələr arasında məntiqi əlaqə yoxdur .۶

Bu təmayülçü cərəyan Quranın təhrif olunduğunu söyləyənlər üçün dayaq .۷ nöqtəsidir. Onlar, riyazi hesablamalar nəticə etibarı ilə yanlış olduqda bunu Quranın .təhrif olunduğuna dəlil kimi göstərirlər

Bəzi bu kimi uyğunluqlardan şairanə istifadə yol veriləndir. Lakin bunu elmi şəklə .۸ .salmaq olmaz

Quran və hədislərdə Quranın riyazi düzümü haqqında heç bir işarə yoxdur. Quran .۹ .hidayət və əməl kitabıdır

Quranın ecazkarlığını anlamaq üçün ərəb dilinin incəliklərini bilmək, davamlı tilavət .۱۰ .(edərək düşünmək lazımdır(۱

YEKUN



---

Quranda ۱۹ möcüzəsi", səh. ۲۱, ۱۴۰. Bəzilərinə görə Doktor Rəşad Xəlifəyə qarşı" [۲۷۵] -۱ radikal mövqelərin kökündə onun bəzi məzhəblərə meyilli olması dururdu. Çox güman .ki, onun öldürülməsinə səbəb də bu radikal mövqelər olmuşdur

Quranın ədədlərlə bağlı riyazi möcüzəsi haqqında bir neçə məqama diqqət yetirmək .zəruridir

Öncə də qeyd etdiyimiz kimi bir çox müsəlman alimləri Quranın riyazi düzümü . ١ haqqında tədqiqatlar aparmış və maraqlı nəticələr əldə etmişlər. Təbii ki, bəzən yanlış nəticələr də alınmışdır. Müxalif və müvafiqlərin söylədiklərinə nəzər saldıqda görürük ki, Quranın riyazi möcüzəsi müəyyən mənada hamı tərəfindən qəbul olunur. Daha .dəqiq desək xüsusi iqrari şəkildə qəbul, ümumi iqrari şəkildə isə rədd olunur

Öncə də qeyd olunduğu kimi Quranda ١٩ ədədinin təməl prinsip olması fikri yanlışdır. .٢ Amma bu həmin fikirdə olan müsəlman mütəfəkkirlərin bəhai və ya təmayülçü olduğunu söyləməyə əsas veriri. Fikrimizcə elmi məsələlərdə bu şəkildə davranmaq doğru deyil. Maraqlı burasıdır ki, Rəşad Xəlifəni yanlış təfəkkürə malik təmayülçü .adlandıranlar özləri bu və ya digər şəkildə Quranın riyazi möcüzəsini qəbul edirlər

Quranın riyazi düzümü (hər iki tərəfin qəbul etdiyi məhdud vəziyyət) . ٣ heyrətləndiricidir. Çünki heç bir təhsil görməyən, oxumaq, yazmaq bilməyən bir şəxs ٢٣ il ərzində, fərqli şəraitdə -döyüş zamanı, sülh və əminamanlıq zamanı belə bir kitab təqdim edilmişdir (yəni adətən kitab yazan alimlər kimi hər şeydən kənarda tam sakit kitabxana şəraitində yazmayıb). Bu çox heyrətləndiricidir. Lakin mövcud riyazi düzüm ?Quranın ecazkarlığını isbat edirmi

Burada iki əsaslı irad mövcuddur. Birincisi, bu məsələ kiçik müqəddimə (fərdi hökm) baxımından natamamdır. Çünki xüsusi iqrari şəkildə qəbul olunur. İsbat olunan .məsələlər Quranın ecazkarlığını sübuta yetirəcək qədər çox deyil

İkincisi, böyük müqəddimə (ümumi hökm) baxımından da natamamdır. Çünki Quranın insanları mübarizəyə çağırması ümumi bir iddia deyil və Quranın bütün tərəflərinə aid olmur. Bu iddianın əhatəsində olan tərəflər içində isə ədədlərlə bağlı ecazkarlıq yoxdur .((yəni Quranda buyurulmamışdır

Biz birinci fəsildə ikinci irada cavab verərərək bildirdik ki, Quranın məlum iddiası ümumi olub bütün tərəfləri əhatə edə bilər. Lakin birinci irad hələ də öz qüvvəsində .qalır

Yuxarıdakı qeyd olunanlara əsasən Quranın riyazi ecazkarlığı qəti olaraq isbat . ۴ .edilməmişdir və Rəşad Xəlifənin əldə etdiyi nəticələr qəbulolunmazdır

Quranın riyazi ecazkarlığını qəbul edən bəziləri onu Quranın təhrif olunmamasının . ۵ dəlili kimi göstərirlər. Halbuki göstərilən sadəcə riyazi düzümdür. Lakin bu riyazi düzümün necə olmalı olduğu bəlli deyil. Deməli, Quranın mövcud riyazi düzümü onun .təhrif olunub olunmamasına dəlil ola bilməz

## DÖRDÜNCÜ FƏSİL:QURAN VƏ BİOLOJİ ELMLƏR

### (YERDƏ HƏYATIN MEYDANA GƏLMƏSİ VƏ İNKİŞAFI (ÜZVİ ALƏMİN İNKİŞAFI

Yerdə həyatın necə meydana gəlməsi daim bəşər övladını düşündürmüşdür. Bu haqda bir çox alimlər, ekspertlər rəy vermiş, fikir söyləmişlər. Quran da bu məsələdən yan keçməmiş, bəzi məsələlərə aydınlıq gətirmişdir. Bu, son qəti elmi nailiyyətlərlə üst-üstə düşdüyündən Quranın elmi möcüzəsi hesab olunur. Burada mövzu ilə bağlı .ayələri və təfsirçilərin baxışlarını incələcəyik

### ELMİ SİRLƏR VƏ ŞƏRH

və Nur surəsinin (وَجَعَلْنَا مِنَ الْمَاءِ كُلَّ شَيْءٍ حَيٍّ) Ayətullah Məkarim Şirazi Ənbiya surəsinin ۳۰ .۱ :ayələri haqqında üç ehtimal irəli sürür (وَاللَّهُ خَلَقَ كُلَّ دَابَّةٍ مِن مَّاءٍ) ۴۵-ci

ma`] ifadəsindən məqsəd nütfədir (spermatozoid və toxum] ”مـــاء“ a) Ayədə .mayesindən ibarət sperma)(۱). Bu ehtimal bir çox rəvayətlərdə də təsdiqlənir



---

Bu açıqlama yanlışdır. Çünki bütün canlılar nütfədən yaranmır. Misal üçün, [ ۲۷۶] -۱ dabbə] sözünün əhatə] ”دابـه“ birhüceyrəli orqanizmlər (amyöblər, infuzorlar və s.) və etdiyi digər canlılar hüceyrələrin bölünməsi yolu ilə artırlar. Lakin əgər ayədəki hökmü .ümumi hökm kimi qəbul etməsək, o zaman məlum ehtimal öz qüvvəsində qalır

b) Ayədə məqsəd yaradılan ilk varlıqdır. Çünki rəvayətlərə görə Allah ilk olaraq suyu yaratdı. İnsanları da sonradan sudan yaratdı. Son elmi araşdırmalar da göstərir ki, ilk həyat nişanələri suda (dənizlərdə) meydana gəlmişdir.

c) Ayədə məqsəd budur ki, hal-hazırda canlı varlıqları ayaqda saxlayan başlıca maddə sudur. Su olmadan heç bir canlı varlıq həyat sürə bilməz(١).

O, Hud surəsinin ٧-ci ayəsini izah edərkən Ənbiya surəsinin ٣٠-cu (وَكَانَ عَرْشُهُ عَلَى الْمَاءِ) ayəsi haqqında dördüncü ehtimalı qeyd edərək yazır:

"عرش" [ərş] sözü kök etibarı ilə tavan və ya tavanlı bir şey haqqında işlənir. "عرش" [ərş] sözünün digər mənası isə padşah taxtıdır. Sonradan iqtidar (qüdrət) mənasını kəsb etmişdir.

"ماء" [ma`] sözünün ilkin mənası sudur; lakin sonradan hər bir axıcı, maye haqqında işlənməyə başlanmışdır.

Yaradılış öncəsi obyektiv gerçəklik ərimiş vəziyyətdə (maye halında) idi. Deməli, varlıq aləmi öncə maye halında olmuşdur. Buna Ənbiya surəsinin ٣٠-cu ayəsində də işarə vurulmuşdur"(٢).

٢. Əllamə Təbatəbai Hud surəsinin ٧-ci ayəsini izah edərkən yazır:

"Gördüyümüz bütün canlı varlıqlar sudan yaranmışdır. İlkin həyat maddəsi sudur. Ayədə də məqsəd Allahın iqtidarının (yaradılış zamanı) suya hakim olmasıdır"(٣).



---

١- [٢٧٧] "Təfiri-nümunə", c. ١٣, səh. ٣٩۶; c. ١۴, səh. ۵٠٨-۵٠٩.

٢- [٢٧٨] Yenə orada, c. ٩, səh. ٢۵-٢۶.

٣- [٢٧٩] "Təfsir əl-mizan", c. ١٠, səh. ١۵۵

۳. Ayətullah Mərifət yaradılışla bağlı bir neçə rəvayət nəql edərək yazır:

"Şəri dəlillər göstərir ki, ilk yaranan varlıq su olmuşdur. Hud surəsinin ۷-ci ayəsi də göstərir ki, hətta yer və səma yaranmazdan öncə su mövcud olmuşdur". Digər ayələr də (Ənbiya, ۳۰; Nur, ۴۵; Furqan, ۵۴) həyatın sudan başlanğıc aldığını bildirir"(۱).

O, Ənbiya surəsinin ۳۰-cu ayəsi haqqında yazır:

"Ayədə məqsəd suyun bütün canlı varlıqların inkişaf prosesində oynadığı mühüm roldur. Necə ki, digər ayədə "Allah hər bir canlını sudan yaratmışdır" (Nur, ۴۵) deyə buyurur. Bunu elm də sübut edir"(۲).

۴. Müasir yazıçılardan biri Ənbiya surəsinin ۳۰ və Nur surəsinin ۴۵-ci ayələrini izah edərək yazır:

"Elmi nailiyyətlərə görə bütün canlı varlıqlar sudan başlanğıc almışlar. Quran isə buna əsrlər öncə bir neçə ayədə işarə vurmuşdur. Bu, Quranın əsrlər öncə bir neçə ayədə işarə vurduğu məsələdir. Bu, Quranın elmi möcüzələrindən biridir"(۳).

۵. Doktor Paknijad məlum ayəni izah edərkən yazır:

"Suda aminturşu molekulları və jelatin zərrəcikləri meydana gəlir və kimyəvi reaksiya yaranır. İki quru cismin biri-digərində heç bir təsir buraxmır. Başqa sözlə desək, kimyəvi reaksiya həyat mövcud olan yerdə gedir. Kimyəvi reaksiya olduqda suyun mövcudluğu zəruridir. Çünki su həyat mənbəyidir. Su canlı varlıqların ayrılmaz hissəsidir".

O, ilk canlı maddə (aminturşu molekulları) haqqında yazır:



---

۱- [۲۸۰] "Ət-Təmhid", c. ۶, səh. ۳۱-۳۳.

۲- [۲۸۱] "Ət-Təmhid", c. ۶, səh. ۳۴.

۳- [۲۸۲] "Quran və hədisdə yeni elmin işartıları", c. ۱, səh. ۱۰۴.

Yaradılışın başlanğıcında dəhşətli ildırımlar çaxır, gur yağışlar yağır, dənizlər dolur,“ daşır və yavaş-yavaş meydana gələn molekullar bir-birinə qovuşurdu. Bu qovuşmaya səbəb cazibə qüvvəsi deyildi. Onları qovuşduran, bir-birinə doğru çəkən elektirik yükü .(və kimyəvi reaksiya idi(١

Atomlar sıxlaşdı, molekullar əmələ gəldi. Dənizlər molekullarla doldu. Molekullar bir-birinə qovuşaraq yapışqan məhlula çevrildi və jelatin zərrəcikləri meydana gəldi. Zaman keçdikcə jelatin qatılaşdı (kristallaşdı), nəticədə qıtlıq yarandı və zərrəciklərin böyük əksəriyyəti funksiyasını itirərək ölgünləşdi. Onlarda yaşıl rəngli maddə (xlorofil) əmələ gəldi və günəş enerjisindən güc aldı. Bunlar ilk bitkilər idi. Araşdırmalar zamanı əldə olunan bəzi (daşlaşmış) bitki qalıqlarının yaşının ٣ milyard olduğu təyin .olunmuşdur

İlk bitkilər, yəni xlorofil bir çox hallarda böyük jelatin zərrəsi tərəfindən yeyilirdi. Bu .(bitki yeyənlər yer üzündə ilk canlı heyvanlar hesab olunurlar”(٢

Doktor Maurice Bucaille Ənbiya surəsinin ٣٠ və Nur surəsinin ۴۵-ci ayələrini qeyd .۶ :edərək yazır



---

Onun yazdığına görə bəzi labaratoriyalarda suya elektrik təkanı verməklə[٢٨٣] -١ .aminturşu molekullarının əldə olunması təcrübə olunmuşdur

O, Nur surəsinin ۴۴-cü ayəsini izah edərkən yazır:“Canlıların dənizdə meydana [٢٨۴] -٢ gəlməsi sübuta yetmişdir. Çünki canlı varlıqların enerjiyə ehtiyacı labüddür. Erkən yaradılış dönəmində bu enerji fermentasiya, sonra isə oksidləşmə yolu ilə təmin edilirdi. Oksigeni sonra da ultrabənövşəyi şüaları cəzb edən (udan) azotun meydana gəlməsi canlıların dənizdən çıxıb quruda yaşamalarına imkan yaratdı. Bu gün də məlum yaradılış prosesi okeanlarda mövcuddur. Daim hər bir guşədə həyat yaranır, .(inkişaf və təkamül edir (İlk universitet və son peyğəmbər, c. ١, səh. ١٣۵-١۴۴

Ehtimal ki, ayədə məqsəd hər bir canlının ilkin maddə olaraq sudan yaranması və ya“ hər bir canlının əvvəlinin su olmasıdır. Hər iki halda elmi nailiyyətlərə tam uyğundur. .”Çünki həyat sudan başlanğıc almışdır

ma` ] sözünün iki mənasına (su, maye) toxunaraq digər bir versiyanı da qeyd] ”ماء“ ,O edir (heyvan mayası). Onun fikrincə, hər üç açıqlama elmi nailiyyətlərlə üst-üstə düşür və Quranda cahillik dönəmində həyatın yaranması haqqında yayılmış miflərə yer .(yoxdur(١

Seyid Qütb Nur surəsinin ٤٥ və Ənbiya surəsinin ٣٠-cu ayələrini qeyd edərək . ٧ onlardan iki məqamın anlaşıldığını vurğulayır. Birincisi, həyat ilk olaraq sudan .((dənizlərdən) başlamışdır. İkincisi, canlıların tərkibində başlıca ünsür sudur(٢

Bəzi yazıçılar məlum ayələri izah edərkən insan orqanizminin su ilə əlaqəsindən . ٨ .söhbət açır və bildirirlər ki, insan orqanizminin ٧٠٪-ni su təşkil edir

YEKUN

(ماء) İzah olunan ayələrdən (Ənbiya ٣٠ və Nur ٤٠) anlaşıldı ki, həyat ilk olaraq sudan .ma` ] ifadəsi haqqında ümumilikdə dörd ehtimal mövcuddur]”ماء“ .başlanğıc almışdır

ma` ]sözündən məqsəd nütfədir (spermatozoid və toxum mayesindən ibarət] ”ماء“ .١ sperma). Bu ehtimal Nur surəsinin ٤٥-ci ayəsinə müvafiqdir. Çünki ayənin davamında deyilir: “Onların bəzisi qarnı üstə sürünür, bəzisi iki, bəzisi isə dörd ayaq üstündə gəzir”. Ayədən məqsədin sürünənlər, dördayaqlılar və insanlar olduğu



---

.Tövrat, İncil, Quran və elmin müqayisəsi”, səh. ٢٥٠-٢٥١“ [٢٨٥] -١

.Fi zilali-Quran”, c. ۶, səh. ١١١; “Ət-Təmhid”, c. ۶, səh. ٣۴-٣۵“ [٢٨۶] -٢

anlaşılır (hansı ki, nütfə yolu ilə çoxalırlar). Bu ehtimalı şübhə altına alan bütün canlıların nəsil artımının nütfə yolu ilə olmamasıdır. Ənbiya surəsinin ۳۰-cu ayəsindən .(də göründüyü kimi ayə bütün canlıları əhatə edir(۱

Canlıların təşkil olunduqları başlıca maddə sudur. Bu ehtimal Ənbiya surəsinin ۳۰-cu .۲ ayəsinə uyğun olsa da Nur surəsinin ۴۵-ci ayəsinə uyğun deyil. Nur surəsində .yaradılışın başlanğıcından söhbət açılır

İlk varlığın sudan yaranması. Bu ehtimal hər iki ayəyə uyğundur. Elmi nailiyyətlər də .۳ .bunu təsdiq edir

.Məqsəd suyabənzər mayedir ki, dünya ondan yaradılmışdır .۴

ma` ]sözünün hərfi mənası, eləcə də ayələrin ilkin zahiri mənası ilə] "ماء" Bu ehtimal uyğun gəlir. Lakin öncə də qeyd olunduğu kimi, yalnız Nur surəsinin ۴۵-ci ayəsində ilkin .zahiri məna etibarı ilə məqsədin nütfə olduğunu düşünmək olar

Qeyd: Diqqətinizə çatdırdığımız ehtimalların hamısı ayələrin məqsədi ola bilər. Bəzi .(təfsirçilər də bu fikirdədirlər(۲

Sözügedən ayələrin fərqli izahları olduğuna görə, bu və ya digər ehtimalı qəti olaraq .۲ ayəyə aid edib, digər ehtimalları isə rədd etmək olmaz. Lakin ayələrdən məqsədin dörd ehtimaldan hansı olmasından asılı olmayaraq, Quranın elmi sirlərindəndir. Bu elmi işarələr Quranın əzəmətinin sübutudur. Lakin bu fikirlər antik yunan filosofları .tərəfindən də səsləndiyinə görə elmi möcüzə hesab olunmur



---

İnsanın yaradılışı haqqında ayrıca ayə mövcuddur ki, onun "atıcı su"dan[۲۸۷] -۱ .yarandığını bildirir. Növbəti bəhslərdə bu haqda söhbət açacağıq

.Təfsiri-nümunə", c. ۱۴, səh. ۵۰۹" [۲۸۸] -۲

## İLK İNSANIN YARANMASI VƏ TƏKAMÜL HİPOTEZİ

Yer kürəsində ilk insanın (ondan öncə də bitki və heyvanların) mənşəyi daim sual doğuran məsələlərdən olmuşdur. Müqəddəs kitabda (Tövrat) və Quranda bu haqda söhbət açılmış və (suallara) cavab verilmişdir. Dövrümüzdə bioloji elmlərin inkişafı, Jan Batist Lamark (۱۷۴۴-۱۸۲۹) və Çarlz Robert Darvinin (۱۸۰۹-۱۸۸۲) nəzəriyyələri bu bəhsi daha da rövnəqləndirdi. Belə ki, din alimləri və təcrübi elmlər üzrə mütəxəssislər bir-birlərinin baxışlarını tənqid atəşinə tutdular. Bəzi müsəlmanlar təkamül nəzəriyyəsini (transformizm) qəbul edib bunun isbatı üçün müəyyən ayələrə istinad etdilər. Bəziləri isə Növlərin dəyişməzliyi nəzəriyyəsini müdafiə edir və Quranın digər ayələrinə əsaslanırlar. Hətta (zahirən təkamül təlimi ilə uyğun gələn) bəzi ayələri Quranın ecazkarlığının sübutu kimi dəyərləndirmişlər. Biz burada Təkamül və ya Növlərin dəyişməzliyi nəzəriyyəsini rədd və ya isbat etməyi qarşımıza məqsəd qoymamışıq. Çünki bu bizim mübahisə obyektimiz xaricindədir(۱). Burada hər iki tərəfin Qurana .istinadını diqqətinizə çatdıracaq və tənqidi yanaşacağıq

## TƏKAMÜL HİPOTEZİNİN QISA TARİXİ VƏ ALİMLƏRİN BAXIŞLARI

Burada Təkamül nəzəriyyəsinin qısa tarixinə nəzər salacaq, hər iki nəzəriyyənin .izahını verəcək və dəlillərinə toxunacağıq

:Bəzi mütəfəkkirlər yazırlar



---

.Ət-Təmhid", c. ۶, səh. ۳۴-۳۵" [۲۸۹] -۱

Təkamül nəzəriyyəsi hələ miladdan öncə mövcud olmuşdur. Miladdan sonra da ərəb“ alimləri, (sonralar İslam alimləri) bu haqda fikir yürütməyə başladılar. Müsəlmanlardan Farabi “İdeal cəmiyyət baxışları”, Qəzvini, “Əcaib əl-məxluqat” və “İxvan əs-səfa, İbn Misqəveyh “Təhzib əl-əxlaq” və “əl-Fəvz əl-əsğər” əsərlərində bu haqda söhbət açmışlar”. Təkamül nəzəriyyəsi elm tarixində müxtəlif formalarda mövcud olmuşdur. Lakin XIX əsrdə Lamark və Darvindən sonra təkamül haqqında müzakirələr daha da .(genişləndi(١

:Təkamül nəzəriyyəsinin tərəfdarları əsasən iki katiqoriyaya ayrılırlar

;Təkamülü bütün varlıqlara, hətta maddə və enerjiyə aid edərək ümumiləşdirənlər .١

Təkamülü yalnız canlı varlıqlara, üzvi aləmə (mikroorqanizmlər, bitkilər, heyvanlar .٢ .və insanlar) aid edənlər

Birinci katiqoriyaya aid olan alimlər arasında da fikir ayrılığı mövcuddur. Bəziləri təkamülün hərəkətverici qüvvəsinin təbiətin fövqündə durduğu (materiyanın mütləq inert (təsirsiz) olub “canlanmaq” üçün hərəkət verilməsi lazım gəldiyi), bəziləri isə .materiyaya hərəkət verilməsi lazım olmadığı qənaətindədirlər



---

Fikrimizcə “Təkamül” termini bəzən dar mənada (birhüceyrəli orqanizmlərdən[٢٩٠] -١ insana doğru təkamül və ya ibtidai həyatı formalardan ali formalara doğru qradasiya istiqamətində dəyişmə) işlənir. Bəzən isə geniş mənada (fiziki, psixi, mənəvi, elmi, ictimai, əxlaqi və s. təkamül) işlənir ki, birinci mənanı da əhatə edir. Lamark və Darvindən öncə təkamül sözün geniş mənasında, onlardan sonra isə dar mənada .işlənməyə başladı

## TƏKAMÜL VƏ NÖVLƏRİN DƏYİŞMƏZLİYİ KONSEPSİYALARININ İZAHI

Öncə də qeyd olunduğu kimi təbiətşünaslıq elmləri ilə məşğul olan alimlər arasında həyatın və insanın (canlı təbiətin) mənşəyi haqqında iki nəzəriyyə mövcuddur.

۱. Növlərin təkamülü və ya transformizm nəzəriyyəsi. Bu nəzəriyyəyə görə üzvi aləmdə mövcud olan növlər sabit deyil. İndi yaşayan növlər əvvəl yaşayan növlərdən təbii yolla əmələ gəlmişdir. Deməli, indiki bütün üzvi aləm, bitkilər, heyvanlar və insan özü də milyon illər davam edən inkişaf prosesinin məhsuludur. Başlanğıcda ibtidai formalar, birhüceyrəlilər okeanlarda xüsusi şəraitdə (cansız varlıqdan) törəmişdir. Bu mikroskopik varlıqlar ibtidai həyati formalardan ali formalara doğru qradasiya istiqamətində dəyişməyə başladılar. Okeanlardan sahilə, sahildən havaya keçdilər. Təkamül prosesinin ən kamil nümunəsi bugünkü insanlardır. Onlar insanabənzər meymunların təkamülü nəticəsində meydana gəlmişlər.

۲. Növlərin dəyişməzliyi nəzəriyyəsi. Bu nəzəriyyəyə görə üzvi aləmi təşkil edən növlər indiki şəkildə yaradılmış və dəyişməzdir. Heç bir növ digər növə çevrilməmişdir. İnsan da ayrıca yaradılmış və dəyişməmişdir.

Hər iki nəzəriyyənin tərəfdarları öz fikirlərini qətiyyətlə müdafiə etmiş və elmi dairələrdə dərin çəkişmələr müşahidə olunmuşdur. Lamark və Darvin Təkamül nəzəriyyəsini yeni dəlillərlə elmi ictimaiyyətə təqdim etdikdən sonra mövcud çəkişmələr daha da şiddətləndi

səh:۱۳۹

Şübhəsiz, təbiətşünaslıq elmi dairələrində Təkamül təlimini müdafiə edən elm .(١) .adamları çoxluq təşkil edir

## TRANSFORMİSTLƏRİN DƏLİLLƏRİ

Təkamül nəzəriyyəsini müdafiə edənlərin qarşıya qoyduğu dəlilləri aşağıdakı şəkildə .qruplaşdırmaq olar

Birinci dəlil: Təkamül nəzəriyyəsinin başlıca dəlili paleontoloji nailiyyətlər, qazıntı qalıqları üzərində aparılan tədqiqatlardır. Canlı varlıqların daşlaşmış skeletləri üzərində aparılan müqayisəli tədqiqatlar göstərir ki, canlılar (növlər) ibtidai formalardan ali formalara doğru qradasiya istiqamətində dəyişilmişdir. Qalıqların bu fərqliliyini yalnız .Təkamül nəzəriyyəsi ilə izah etmək olar

İkinci dəlil: Burada müqayisəli müşahidələr əsas götürülür. Müxtəlif heyvan skeletlərinin müqayisəli tədqiqatı nəticəsində növ əlamətlərində çox geniş dəyişkənlik .olduğu üzə çıxmış və bəlli olmuşdur ki, heyvanların mənşəyi birdir

Üçüncü dəlil: Burada embrioloji tədqiqatlar əsas götürülür. Hələ təkmilləşməmiş heyvan rüşeymlərini (embrionları) müqayisə etsək, onlarda böyük bənzərlik .olduğunun şahidi olarıq. Bu, onların mənşəyinin ümumi olduğunun göstəricisidir

## NÖVLƏRİN DƏYİŞMƏZLİYİ TƏLİMİNİN TƏRƏFDARLARININ CAVABLARI

Növlərin dəyişməzliyi nəzəriyyəsini müdafiə edənlər bütün bu dəlillərə bir ümumi cavab verirlər. Onlara görə, bu dəlillər qənaətbəxş deyil. Qeyd olunan hər üç dəlil insanda təkamül haqqında ilkin təsəvvür (ehtimal, zənn) yaratsa da onu qəti şəkildə ,sübut etmir. Daha dəqiq desək



---

Qeyd etmək lazımdır ki, Lamarkizm və Darvinizm təkamülü büsbütün bir-birinə [٢٩١] -١ əks olaraq şərh edir. Lamarkizm təkamülü uyğunlaşma (adaptasiya) ilə, darvinizm isə .uyğunlaşmanı təkamüllə izah edir

Təkamül nəzəriyyəsinin isbatı, onun bir hipotez (fərziyyə) şəklindən qəti elmi qanun şəklinə keçməsi konkret əqli (rasional) arqument və ya təcrübi, sensual fakt tələb edir. Lakin rasional biliklər, fəsəfə bu kimi mövcudlar haqqında fikir yürüdə bilmir. Təcrübələr isə kökü milyon illər öncəyə gedib çıxan məsələlər haqqında dəqiq nəticə əldə etməkdən acizdir. Bizim müşahidə etdiklərimiz zaman keçdikcə bitki və heyvanlarda baş verən qəfil dəyişkənlikdir (mutasiya(١)). Misal üçün, adi qoyun cinsindən qəflətən yeni qoyun tipi törəyir ki, yunu adi qoyunlarla fərqlənir. Yəni adi qoyun cinsinə nisbətdə daha zərif olur. Bu yeni törəyən qoyun tipindən merinos adlanan yeni qoyun cinsi formalaşır. Həmin mütasiyalar gözün, dırnağın rəngində, dərinin formasında da özünü göstərir. Lakin hələ başlıca bədən üzvlərində baş verən mühüm dəyişiklik və ya növdən növə keçid (çevrilmə) müşahidə olunmamışdır. Deməli, biz qəfil sıçrayışlar nəticəsində növ dəyişmələrinin, misal üçün, sürünən heyvanların uçuş qabiliyyətinə malik quşa çevrilməsini zənn etsək də bu, ehtimaldan başqa bir şey deyil. Çünki biz bunu təcrübi olaraq müşahidə etməmişik. Bütün bunlar göstərir ki, transformistlərin qarşıya qoyduğu dəlillər Təkamül təliminin yalnız bir hipotez (fərziyyə) olduğunu sübuta yetirə bilər. Buna görə də təkamül bir nəzəriyyə deyil, .hipotez (fərziyyə) adlandırılmalıdır



---

١- [ ٢٩٢] Genetik aparatda genlərin bir allel vəziyyətdən başqa vəziyyətə keçməsi, xromosomların sayının və quruluşunun müxtəlif dəyişilməsini birləşdirməklə qəflətən .baş verən davamlı (sabit) dəyişkənliklər

## TƏKAMÜL TƏLİMİ VƏ TEOLOGİYA

Bir çoxları Təkamül hipotezi ilə teologiya (və ya metafizika) arasında böyük bir uçurum olduğunu göstərməyə çalışırlar. Çünki darvinizmin meydana gəldiyi dönəmdə kilsə ruhaniləri ilə bu təlimin tərəfdarları arasında şiddətli çəkişmələr baş verdi. Dövrün siyasi-ictimai şəraitinin təsiri altında elə təsəvvür yarandı ki, guya darvinizm teologiyaya qarşıdır. Lakin bu gün artıq məlum olmuşdur ki, darvinizm və teologiya heç də qarşı-qarşıya deyillər. Yəni biz darvinizmi qəbul və ya rədd etməyimizdən asılı olmayaraq teoloji inanc sahibi ola bilərik. Əgər Təkamül təlimi hipotez olmaqdan çıxıb bir elmi nəzəriyyə (qanun) kimi qəbul olunsa, səbəbiyyət qanununu isbat etmiş olacaq. Üzvi aləmdə mövcud olan səbəbiyyət qanunu qeyri-üzvi təbiətə hakim olan səbəbiyyət qanunundan heç də fərqlənmir. Təbiət hadisələrinin (yağış, zəlzələ və s.) səbəblərini dəqiqləşdirmək teoloji baxışların qarşısına sədmi çəkir? Təbii ki, yox. Buna görə də növlər arasında dəyişkənlik və ya təkamül əlaqələrinin kəşfi də teoloji baxışlara zidd ola bilməz. Bütün bunlar nəinki teoloji baxışlara qarşı deyil, əksinə bu .(növ baxışların isbatı üçün yeni dəlillər ortaya çıxarır(١

## TƏKAMÜL HİPOTEZİ VƏ İNSANIN MƏNŞƏYİ

Antik dövrlərlə bağlı tədqiqat aparan bəzi arxioloqların fikrincə Yerdə həyat ٥٠٠ mln. il bundan öncə başlamışdır. Məməlilər ٨٠ mln. il, insan isə ٣ mln. il öncə meydana



---

Təfsiri-nümunə”, c. ١١, səh. ٨١-٨٥“[٢٩٣] -١

gəlmişdir. Onların qənaətinə görə, bu (insanın yaradılışı) qədim Daş dövrünə (Paleolit) .təsadüf edir

:Doktor Paknijad yazır

Məməlilərin nə zaman yaranması haqqında dəqiq məlumat əldə olunmamışdır. Bu" gün onların tarixinin sürünənlər qədər qədim olduğu söylənilir. Onlardan bəziləri ağaclarda yaşayırdılar. Aralarında qəribə yaradılışa malik (baş barmaqlı) pişiyəbənzər, iri gözlü Samur adlanan heyvan cinsi var idi. Bunları meymuna qədərki canlılar adlandırırlar. Zaman keçdikcə onların burnu qısaldı və ilkin meymunlar şəklinə düşdü. Sonradan meymunlar bugünki dörd əsas tipdə formalaşdılar (qorilla, oranqutan, hibban, şimpanze - sonuncu, təkmilləşmə baxımından hamısından öndədir). Növbəti mərhələdə bir neçə meymun insanabənzər şəkilə düşməyə başladı. ۱۹۶۲-ci ildə Keniyada tapılan insan qalığının (kəllə və ətraf sümükləri) ۱۴ mln. öncəyə aid olduğu müəyyən edilmişdir. Şərqi Afrikada (Tanzaniyada) tapılan digər insan qalığının (kəllə) ۱,۷ mln. il yaşı olduğu müəyyən edilmişdir. Digər qədim hominid isə Efiopiyada aşkar edilmişdir. Təyin edilmişdir ki, onların nitq ünsiyyəti ibtidai inkişaf mərhələsini keçirdi. Ehtimallara görə bir neçə yüz sözdən ibarət dildə danışırmışlar. Qəbilə şəklində yaşayır və ۴۰ il ömür sürürmüşlər (alim və arexoloqlar digər insan növləri də aşkar etmişlər ki, .(bu haqda davamlı olaraq dövri mətbuatda oxuyuruq

Qədim insanlar ۵۰۰ min il tarixə malikdirlər. Lakin müasir insanın tarixi yalnız ۵۰ min ildir. Ondan öncəki dövr haqqında isə hər hansı bir məlumat yoxdur. Ən məşhur qədim insanlar avstralopiteklər, titekantroplar, neoantroplar, və kromanyonlardır ki, ardıcıl olaraq ۳۵, ۱۵۰, ۳۰۰, ۵۵۰ min il öncəyə təsadüf edirlər. Onlar insan

idilər və insan həyatı sürürdülər. İtiuclu, dəstəli kəsici alətlər düzəldir, oddan istifadə edirdilər. Neoantroplar öz ölülərini dəfn edirdilər. Onların arasında dini inanclar mövcud olmuşdur. Onlar ۶۰۰ il öncə mağarada yaşadıqları, ölümdən sonrakı həyata .etiqad bəslədikləri aşkar olunmuşdur

Kamil insanlar ۵۰ min il öncə geniş artımla müşayiət olunmuşlar. Lakin onların primatlardan, yoxsa digər insanabənzər meymunlardan əmələ gəlməsi məlum deyil (۱)Bu insanların düzəltdiyi bəzi alətlər hələ də istifadə olunmaqdadır (tilov, ox, yay və s.). Onlar proqramlı dini ayinlər icra edirdilər. Lakin buna baxmayaraq hələ də mağarada yaşayırdılar. Təqribən ۱۰ min il öncə mağaradan çıxaraq çıraq və geyimdən istifadəyə başladılar. Biologiyaya görə bu (mağaradan uzaqlaşmaq) bəşər (sivlizasiyasının başlanğıcı olmuşdur (۲

**TƏKAMÜL HİPOTEZİ VƏ QURAN**

.Təkamül təliminin isbatı üçün istinad olunan ayələr

:Bu ayələri aşağıdakı şəkildə qruplaşdırmaq olar

.Hər bir şeyin sudan başlanğıc aldığını bildirən ayələr .۱



---

Doktor Paknijad insan və meymun orqanizmlərinin oxşar və fərqli tərəfləri[۲۹۴] -۱ haqqında geniş söhbət açmışdır. Misal üçün, onların qanı ۴ qrupa – AB, O, B, A,- bölünür. Şimpanze meymunlarının qanını insana vurmaq olar. Lakin meymunların südünü uşağa içirmək olmaz (halbuki digər heyvanların südünü - inək və s. - uşağa içirmək olar). Bir kişinin beyni erkək meymun beynindən üç dəfə böyükdür. Meymunların boğazlıq dövrü insanda olduğu kimi ۲۷۰ gündür ("İlk universitet, son .(peyğəmbər", c. ۱, səh. ۱۷۱-۱۷۴

.Yenə orada, c. ۱, səh. ۱۶۶-۱۷۸[۲۹۵] -۲

.(Hər bir canlını sudan yaratdıq” (Ənbiya, ٣٠“ ( وَجَعَلْنَا مِنَ الْمَاءِ كُلَّ شَيْءٍ حَيٍّ )

:Ayətullah Meşkini yuxarıdakı ayəni qeyd edərək yazır

Məlum ayə canlı təbiətin (nəbatat, heyvanat və s.) sudan yaradıldığına aydınlıq gətirir.“ .(Belə olduqda Təkamül təliminin bəzi müddəaları sübuta yetmiş olur”(١

Seyid Qütb də məlum ayənin suyun həyatın başlanğıcı olmasına işarə vurduğunu qəbul edir və bildirir ki, müasir elm üzvi aləmin sudan başlanğıc aldığını dəstəkləyir. Həyatın mənşəyi dəniz suyu olmuşdur. Sonradan bütün cins və növlər ondan törəmişdir. Deməli, Darvinə şöhrət qazandıran nəzəriyyə əsrlər öncə Quranda öz .(əksini tapmışdır(٢

:Bəzi yazıçılar Yerdə həyatın mənşəyi haqqında yazır

Yerin ömründən ١٥٠٠ il keçdikdən sonra tədricən soyumağa başladı. Yer təkində“ reaksiyalar getdi, təkanlar, zəlzələlər baş verdi. Nəticədə Yerdəki buxarlanma buludlara çevrildi. Yağış yağdı. Yer səthini su basdı və dənizlər əmələ gəldi. Təqribən ٥٠٠ mln. il dənizlərdə ibtidai həyat formaları mövcud idi. Sonra birhüceyrəli varlıqlar, müxtəlif bitki və heyvanlar meydana gəldi. Bu, təqribən ١٧٥ mln. il öncəyə təsadüf .(edir”(٣

Ötən bəhslərdə hər şeyin sudan başlanğıc aldığı haqqında elm adamlarının baxışlarını .(diqqətinizə çatdırdıq (Yerdə həyatın mənşəyi

YEKUN



---

.Quranda təkamül”, səh. ٢٣-٢٤“ [٢٩۶] -١

.Fi zilal əl-Quran”, c. ۶, səh. ١١١“ [٢٩٧] -٢

.Əbd əl-Qəni əl-Xətib, “Quran və müasir elm”, səh. ١٢٩-١٣٠ [٢٩٨] -٣

Məlum ayə haqqında növbəti fəsildə geniş söhbət açacağıq. Lakin diqqətinizə çatdıraq ki, bu ayə haqqında dörd ehtimal mövcuddur (İnsanın nütfədən yaranması, ibtidai varlıqların sudan başlanğıc alması, canlı varlıqların əsasən, sudan təşkil olunmaları və dünyanın ilkin maddəsinin suyabənzər maye olması). Yalnız birinci ehtimal ayəyə nəzərən məqsədəuyğundur. Buna görə də ehtimal olaraq ayənin üzvi aləmin mənşəyinin sudan (dəniz və okeanlardan) başlanmasına işarə vurduğunu qəbul etmək .olar. Lakin bu, ayənin yeganə izahı deyil

.۲ )وَاللَّهُ خَلَقَ كُلَّ دَابَّةٍ مِن مَّاءٍ فَمِنْهُم مَّن يَمْشِي عَلَى بَطْنِهِ وَمِنْهُم مَّن يَمْشِي عَلَى رِجْلَيْنِ وَمِنْهُم مَّن يَمْشِي عَلَى أَرْبَعٍ (

Allah hər bir canlını sudan yaratmışdır. Onların bəzisi qarnı üstə sürünür, bəzisi iki,“ .(bəzisi isə dörd ayaq üstündə gəzir” (Nur, ۴۵

:Ayətullah Meşkini sözügedən ayə haqqında yazır

ma` ] ifadəsinin nütfə (sperma) kimi izah olunması ayənin ilkin] ”ماء“ Ayədə sözü keçən“ mənasına ziddir. Deməli, ayə canlıların sulu gildən yaranması haqqında rəyə uyğundur). Ayədə sürünənlərin (reptililər) əvvəl qeyd olunmasına səbəb çox güman ki, bu növ canlıların ən bariz nümunəsi olan balıqların zaman baxımından daha əvvəl yaradılmasıdır. Quruda yaşayan bu növ heyvanlar isə daha sonra yaradılmışlar. İkiayaqlılardan məqsəd insan, quşlar və bəzi meymun növləridir. “İki ayaq üzərində” ümumi ifadəsi bəzilərinin insan və digər canlıların ayrı növə aid olduqlarını iddia edən .baxışının yanlışlığını üzə çıxarır

Doktor Biazar Şirazi Nur surəsinin ۴۵-ci ayəsini paleontologiyada göstərilən :heyvanların mərhələli yaradılışına tətbiq edərək yazır

Birinci mərhələ (dövr): Bu mərhələdə müxtəlif növ mərcan polipləri, axçalı (pulcuqlu)“ .balıqlar, kərtənkələlər, ilanlar, bağalar, timsahlar və digər sürünənlər meydana gəldi

( فَمِنْهُم مَّن يَمْشِي عَلَى بَطْنِهِ )

İkinci mərhələ (dövr): Bu dövrdə quşlar meydana gəldi. Onların ən qədim nümunəsi göyərçin balasına oxşayan at olmuşdur. Lakin uçmaq qabiliyyətini itirmişdir. Bu .qisminə daxildirlər ( وَمِنْهُم مَّن يَمْشِي عَلَى رِجْلَيْنِ ) heyvanlar ayədə sözü gedən

Üçüncü mərhələ (dövr): İlkin məməlilərin izləri ikinci dövrün sonlarından başlayaraq görünməkdə idi. Bu dönəmdə at, inək, dəvə, fil, müxtəlif meymun növləri və s. .”( وَمِنْهُم مَّن يَمْشِي عَلَى أَرْبَعٍ ) (məməlilər meydana gəldi(١

Doktor Paknijad birhüceyrəli canlıların yaranması haqqında ətraflı söhbət açır və :növbəti üç mərhələ arasındakı fasilə haqqında yazır

Birinci: Suda yaşayanlarla quruya çıxanlar arasında fasilə yarandı. Bu əsasən, qan“ .( فَمِنْهُم مَّن يَمْشِي عَلَى بَطْنِهِ ) dövranı, tənəffüs orqanı inkişaf etmiş balıq və sürünənlərə aid idi

.( وَمِنْهُم مَّن يَمْشِي عَلَى رِجْلَيْنِ ) İkinci: Quşların təkmilləşərək havada uçması

Üçüncü: Məməlilər. Heyvanlar təkamül nəticəsində yumurtamaqla çoxalmadan وَمِنْهُم مَّن يَمْشِي عَلَى ) diridoğmaqla çoxalmaya keçdilər. Bunlar daha çox dördayaqlılar idi .”( أَرْبَعٍ

səh:١۴٧

---

.Dünyanın gələcəyi və keçmişi”, səh. ٣٩-۴٢“[٢٩٩] -١

O, Quranın tədricən təkmilləşən heyvanlar haqqında verdiyi ecazkar xəbərlərə toxunaraq Nur surəsinin ۴۵-ci ayəsini sözügedən mərhələlərə tətbiq edir. Onun .(fikrincə təkamül nəzəriyyəsi dinlə heç də ziddiyyət təşkil etmir(١)

YEKUN

hissəsi haqqında üç versiya mövcuddur (Nütfədən ) وَاللَّهُ خَلَقَ كُلَّ دَابَّةٍ مِنْ مَاءٍ ( Ayənin ilk .١ yaranma, ibtidai varlıqların sudan başlanğıc alması və canlı varlıqların əsasən, sudan .(təşkil olunması)(٢)

Fikrimizcə, bitki və heyvanların yaradılışının ayənin üç hissəsinə tətbiq olunması .٢ doğru deyil(٣). Ayə hazırki canlı varlıqların bölgüsü kimi izah edilsə daha məqsədəuyğun olar. Maraqlıdır ki, ayənin ikinci və üçüncü hissəsini "və" bağlayıcısı ayırır. Bu, ayənin mərhələli yaradılışa aid olmadığını göstərir. Yəni hər üç qismin sudan .(nütfədən) yaradılması istisna edilmir

Digər diqqət çəkən məqam isə ayədəki bölgünün bütün heyvanları əhatə etməməsidir. Sadəcə olaraq bir neçə nümunə qeyd olunmuşdur. Buna sübut ayədə .dörddən çox ayağı olan və ya üzən heyvanlara heç bir işarə vurulmamışdır

Məlum ayənin yaradılışın mərhələli inkişafı ilə bağlı elmi nailiyyətlərə tətbiq .٣ olunmasının Quranın əzəmətini göstərməsinə baxmayaraq, Quranın ecazkarlığını .isbat etməsi doğru deyil

səh:١۴٨

---

.İlk universitet və son Peyğəmbər (s)", c. ١, səh. ١۵٠-١۵۴" [٣٠٠] -١

.Təfsiri-nümunə", c. ١۴, səh. ۵٠٨-۵٠٩" [٣٠١] -٢

Bu, müasir elmi nailiyyətlərə də müvafiq deyil. Bioloji elmlərə görə meymun [٣٠٢] -٣ üçüncü mərhələdə yaranmışdır. Təkamül nəzəriyyəsinə görə isə insan məlum meymun nəslindən törəmişdir. Halbuki ayədə (insan daxil olmaqla) iki ayaqlılar ikinci .mərhələyə aid edilir

.Yaradılışın üç mərhələsinə işarə vuran ayələr .٢

.Təkamül nəzəriyyəsinin müdafiəçilərinin istinad etdiyi digər ayələr aşağıdakılardır

وَلَقَدْ خَلَقْنَاكُمْ ثُمَّ صَوَّرْنَاكُمْ ثُمَّ قُلْنَا لِلْمَلآئِكَهِ اسْجُدُواْ لآدَم ) )

Sizi (babanız Adəmi) yaratdıq, sonra sizə surət verdik və mələklərə: Adəmə səcdə“ .(edin! – dedik” (١)

:Ayətullah Meşkini Əraf surəsinin ١١-ci ayəsini izah edərək yazır

Sözügedən ayə Təkamül nəzəriyyəsini isbat etmək üçün ən uyğun ayədir. Çünki“ summə]]ثـم ) ayəyə görə Allah öncə insanı yaratmış, naməlum müddətdən sonra bağlayıcısı buna sübutdur) onu bugünkü insan şəklinə salmışdır. Uzun müddət sonra .”isə mələklərə insan növünün bir fərdinin önündə səcdə etməyə əmr etmişdir

:O, ayəni insanın üç mərhələdə yaradılışı istiqamətində izah edərək yazır

.Birinci mərhələ: Yaradılışdan sonra və insan şəklinə salınmazdan öncəki mərhələ“

İkinci mərhələ: İnsan surəti verildikdən sonra və həzrət Adəmin (ə) insan növünün bir .fərdi olaraq seçilməsindən öncəki mərhələ

Üçüncü mərhələ: Adəmin seçilməsi və mələklərə ona səcdə etmələrinin əmr olunması .”mərhələsi

O, Hicr surəsinin ٢٨-٢٩-cu ayələrini və eləcə də Sad surəsinin ٧١-ci ayəsini izah edərək bəşər]ifadəsindən məqsəd ümumilikdə insan] ”بشــر“ bildirir ki, ayədə sözü keçən ifadəsi isə (سويته) ”تسـويه“ .növüdür. Yəni “Adəm” və ya hər hansı bir seçilmiş fərd deyil insanın təkamül yolunu



---

.Əraf, ١١. Hicr, ٢٨-٢٩ və Səcdə ٨-٩ ayələri də eyni məzmundadır [٣٠٣] -١

keçərək insan şəklini alması və ruhun üfürülməsi üçün hazır vəziyyətə düşməsinə (işarədir(١)

Maraqlı burasıdır ki, müasir təfsir alimlərindən Ayətullah Məkarim Şirazi Hicr surəsinin ٢۶, ٢٨ və ٢٩-cu ayələrini "Növlərin dəyişməzliyi" nəzəriyyəsinin ən tutarlı dəlili kimi .(dəyərləndirmişdir(٢)

YEKUN

Ayətullah Meşkininin məlum ayəni (Əraf, ١١) insanın yaradılışının üç mərhələsi ilə .١ .əlaqələndirməsi qəribədir. Çünki ayədə üçüncü mərhələyə hər hansı bir işarə yoxdur

Hər iki tərəfin dəlillərinə nəzərən demək olar ki, məlum ayələrin "Təkamül .٢ .nəzəriyyə"sinə heç bir aidiyyətı yoxdur

.İnsanın yaradılışının ilkin mərhələsindən (ilkin maddədən) söhbət açan ayələr .٣

;a) İnsanın torpaqdan yaradılması

هُوَ الَّذِی خَلَقَکُمْ مِنْ طِینٍ ثُمَّ قَضَی أَجَلاً وَأَجَلٌ مُسَمّیً عِنْدَهُ )

səh:١۵٠

---

.Əraf, ١١. Hicr, ٢٨-٢٩ və Səcdə ٨-٩ ayələri də eyni məzmundadır[٣٠۶] -١

Hicr surəsinin məlum ٢٨-٢٩-cu ayəsindən dərhal sonra ٣٠, ٣١-ci ayələrdə [ ٣٠۵] -٢ mələklərin səcdə etməsindən söhbət açılması (İblisdən başqa hamısı – bütün mələklər – səcdə etdi) göstərir ki, insan və ya bəşərdən məqsəd həzrət Adəmdir (ə). Ayələrdəki ümumi vəziyyət göstərir ki, Adəmin torpaqdan yaradılması ilə indiki insan surətinə düşməsi arasında digər növlər mövcud olmamışdır".O, "Təkamül nəzəriyyəsi"nin "ثم" tərəfdarlarına cavab olaraq yazır: "Əraf surəsinin ١١-ci ayəsində sözügedən summə] bağlayıcısı ərəb dilində tərtib və fasilə mənasını ifadə edir. Lakin bu heç də] summə] bağlayıcısı ən qısa] "ثم" fasilənin milyon illər olduğu demək deyil. Çünki .(fasilələri belə ifadə edir" ("Təfsiri-nümunə", c. ١١, səh. ٨٨-٨٩

Sizi palçıqdan yaradan, sonra da (sizin üçün) bir müəyyən əcəl təyin edən Odur.“ .(Müəyyən əcəl onun yanındadır” (Ənam, ٢)(١)

Axı Biz onları (insanların babası Adəmi) yapışqan (kimi) bir“ ( إِنَّا خَلَقْنَـٰهُم مِّن طِينٍ لَّازِبٍ ) .(palçıqdan yaratdıq” (Saffat, ١١

Mən quru və qoxumuş (dəyişib başqa şəklə düşmüş) ) ( إِنِّى خَالِقٌۢ بَشَرًا مِّن صَلْصَالٍ مِّنْ حَمَإٍ مَّسْنُونٍ ) .(qara palçıqdan insan yaradacağam!” (Hicr, ٢٨

:Ayətullah Meşkini məlum ayələr haqqında yazır

Bütün bu ayələr insanın indiki şəkilə düşməzdən öncəki vəziyyətini açıqlayır. Burada“ məqsəd bütün fərdlər deyil. Çünki bütün fərdlər torpaqdan yaranmır. “Bir vaxt (əcəl) təyin etdik” cümləsindən məqsəd budur ki, Allah insanın yaradılışını müəyyən müddət ərzində tamamladı. Bu müddət yalnız onun özünə məlumdur. Bu zamandan məqsəd .(insanın yaradılışı ilə indiki şəklə düşməsi arasındakı fasilə də ola bilər”(٢

Biz,“ ( وَلَقَدْ خَلَقْنَا الْإِنسَانَ مِن سُلَالَةٍ مِّن طِينٍ ) Bəzi yazıçılar Muminun surəsinin ١٢-ci ayəsi :həqiqətən, insanı tərtəmiz (süzülmüş) palçıqdan yaratdıq” haqqında yazırlar

.(Məlum ayə insanın birbaşa torpaqdan yaranmadığını açıqca bəyan edir”(٣“

Sözügedən ayə haqqında digər maraqlı fikirlər də irəli sürülmüşdür. Bəziləri ayənin ,(darvinizmi rədd etdiyini(٤

səh:١٥١

---

.Sad, ٧١; Səcdə, ٨ və Muminun, ١٢ ayələri də həmin məzmundadır [٣٠۶] -١

.Quranda təkamül”, səh. ٢۶-٢٧“ [٣٠٧] -٢

.Doktor Mustafa Mahmud, “Quran, muhavələtun li-fəhmi əsri”, səh. ۵٣-۵۵ [٣٠٨] -٣

.Əl-Kəvn vəl-insan bəynəl-elmi vəl-Quran”, səh. ١۵٢“ [٣٠٩] -۴

bəziləri insanın su və torpaqdan yarandığına bir işarə olduğunu(١), bəziləri isə hər halda Quranın elmi möcüzəsi olduğunu bildirmişlər(٢).

YEKUN

١. "İnsanın mərhələli yaradılışı" haqqında söhbət açarkən onun torpaqdan yaradılması ilə bağlı ətraflı söhbət açacağıq və diqqətinizə çatdıracağıq ki, məlum ayə haqqında iki əsaslı şərh mövcuddur.

Birinci: Bütün insanlar nütfədən yaradılmışdır. Nütfə qida maddələrindən yaranmış, qida maddələri isə torpaqdan əmələ gəlmişdi(٣).

İkinci: Yalnız həzrət Adəm (ə) torpaqdan yranmış, digər insanlar isə nütfədən yaranmışlar. Deməli, insanların kökü həzrət Adəmin vasitəsi ilə torpağa gedib çıxır(٤).

Bütün bunlara nəzərən ayənin qəti olaraq təkamül nəzəriyyəsinə aid olduğunu söyləmək doğru deyil. Çünki birinci şərhi (nütfənin torpaqla əlaqəsi) qəbul etsək, növlərin təkamülü ilə heç bir əlaqəsi olmadığı anlaşılacaq. İkinci şərhi (Adəmin torpaqdan yaranması) qəbul etsək, növlərin dəyişməzliyi haqqındakı fikirləri dəstəkləmiş olacağıq.

Əgər vəziyyətdən çıxış üçün "اجل" [əcəl] ifadəsinin insanın torpaqdan yaranması ilə] indiki insan surətinə düşməsi arasındakı zaman fasiləsi kimi izah etsək, o zaman tamamilə yeni bir mövzu açılmış olacaq.

səh:١٥٢

---

١- [٣١٠] Yenə orada.

٢- [٣١١] "Əl-İşarat əl-elmiyyə fil-ayat əl-kəvniyyə", səh. ١١.

٣- [٣١٢] "Təfsiri-nümunə", c. ١۴, səh. ٢٣; c. ١٧, səh. ١٢۵; c. ٢٠, səh. ١۶۵.

۴- [٣١٣] "Maarif əl-Quran", səh. ٣٣٠.

sulalə] ifadəsi seçilmiş (süzülmüş), bir şeyin yığcam forması mənalarını ifadə] "سلالہ" .٢
edir. Bəzilərinin fikrincə Muminun surəsinin ١٢-ci ayəsində məqsəd nütfədir. Hər halda
.bu ayə zaman fasiləsinə heç bir işarə vurmur

Ayə haqqında irəli sürülən şərh və ehtimallar çox və fərqli olduğu üçün burada elmi .٣
ecazkarlıqdan söhbət gedə bilməz (Növbəti bəhslərdə bu haqda ətraflı söhbət
.(açacağıq

;b) İnsanın sudan yaradılması

İnsanları sudan (nütfədən) yaradan, onları (bir-biri ilə) əsl qohum (qan qohumu) və"
.(sonradan qohum edən Odur"(١

İnsanı yaratmağa palçıqdan başladı. Sonra onun nəslini nütfədən - bir qətrə zəif"
.((dəyərsiz) sudan əmələ gətirdi"(٢

:Ayətullah Meşkini Furqan surəsinin ٥٤-cü ayəsini şərh edərək yazır

Bu ayə insanın indiki şəklə (kamil insan surətinə) düşmədən öncəki halını bəyan"
.(edir"(٣

YEKUN

.Sonra da söhbət açacağımız kimi yuxarıdakı ayə haqqında iki əsas ehtimal mövcuddur

Birinci: İnsanın sudan yaradılmasından məqsəd budur ki, onun bədəninin böyük bir
.(hissəsini (٧٠٪) su təşkil edir(٤



---

.Furqan, ٥٤[٣١٤] -١

.Səcdə, ٧-٨[٣١٥] -٢

.Quranda təkamül", səh. ٢٧"[٣١۶] -٣

.Quran maarifi", səh. ٣٢٠-٣٢٠" [٣١٧] -۴

.(İkinci: İnsan nütfədən yaradılmışdır(١

Bütün bunlar göstərir ki, məlum ayənin insanın mərhələli təkamülü və darvinizimlə heç .bir əlaqəsi yoxdur

.c)İnsanın nütfədən yaranması

إِنَّا خَلَقْنَا الْإِنسَانَ مِن نُّطْفَهٍ أَمْشَاجٍ نَّبْتَلِيهِ

(Həqiqətən, Biz insanı qarışıq bir nütfədən yaratdıq. Biz onu imtahana çəkəcəyik"(٢"

:Ayətullah Meşkini Dəhr surəsinin ٢-ci ayəsi haqqında yazır

Ayədə "nütfə"dən məqsəd su və onun qarışıq tərkibidir ki, palçıq şəklinə salınmışdır." Bu ilkin həyat maddəsindən öncə hüceyrələr, sonra ibtidai həyati formalar, daha sonra .(isə ali həyati formalar yaradıldı"(٣

:Əbəsə surəsinin ١٩-cu ayəsi haqqında yazır

Əgər "nütfə"dən məqsədin su olduğunu qəbul etsək ayə belə bir məna kəsb edəcək:" Allah insanı məxsus sudan yaratdı. Onun bir haldan digər hala düşəcəyini qərara aldı ."(təkamül). Nəticədə bugünkü insan şəklinə düşdü

O, sonda ayənin ikinci mənası haqqında söhbət açır ki, burada nütfədən məqsəd hər .(bir insanın mənşəyi olan spermadir(٤

YEKUN

İnsanın mərhələli yaradılışı" haqqında söhbət açarkən qeyd edəcəyik ki, nütfə leksik" baxımdan zəif axıcılığa malik hər bir şeyə aid edilir. Qatqısız suya, kişi və qadın



---

.Yenə orada, ٣٢٩-٣٣٠[٣١٨] -١

.Dəhr, ٢. Əbəsə surəsinin ١٩-cu ayəsi də həmin mənanı daşıyır[٣١٩] -٢

.Quranda təkamül", səh. ٣٩" [٣٢٠] -٣

toxumuna (sperma) da axıcı olduğu üçün nütfə deyilir. Sonra isə Quranda nütfə termininin hansı mənalarda işləndiyini incələyəcək və diqqətinizə çatdıracağıq ki, .(məlum ayə haqqında on üç baxış mövcuddur(١

Lakin təfsirçilər arasında "nütfə" dən məqsəd yalnız "su" olduğu qənaətində olan əmşac] sözü nütfədən məqsədin su] "امشاج" təfsirçi yoxdur. Ayədə qeyd olunan olmadığını göstərən konteksdir. Nütfənin sulu palçıq mənasını isə heç bir leksikoloji qaynaqda tapa bilmədik. Deməli, ayədə "nütfə" dən məqsəd ya kişi nütfəsi (toxumu), ya da qadın və kişi toxumlarının qarışığıdır. Ayətullah Meşkininin izahı isə heç bir hərfi .və ya terminoloji məna ilə düz gəlmir

İnsanın yaradılışının ikinci mərhələsinə işarə vuran ayələr (insan surəti . ۴ .(verilməsindən sonra, Adəmin (ə) seçilməsindən öncə

İnsanlar tək bir ümmət idi. Allah onlara müjdə verən və xəbərdarlıq edən (əzabla" qorxudan) peyğəmbərlər göndərdi, insanlar arasındakı ixtilafları ayırd etmək üçün O, peyğəmbərlərlə birlikdə haqq olan kitab nazil etdi. Halbuki özlərinə aşkar dəlillər gəldikdən sonra aralarındakı kin (və həsəd) üzündən (dində) ixtilafda bulunanlar kitab .(əhlindən başqası deyildir"(٢



---

Bu versiyaların ən mühümü aşağıdakılardır:Qadın və kişi spermasının qatışığı; ٢.[٣٢٢] -١ İrsiyyət və genetik amillər; ٣. Nütfənin (spermanın) tərkibi və s. ("əl-Mizan", c. ٢٠, səh. .(٢٠٩, ٢١٠; "Təfsiri-nümunə", c. ٢۵, səh. ٣٣۴

.Bəqərə, ٢١٣[٣٢٣] -٢

Yunus surəsinin ۱۹-cu ayəsi də bu məzmundadır. Ayətullah Meşkininin fikrincə insana surət verildikdən sonra və Adəm (ə) onların arasından seçilməzdən öncə insanlar uzun müddət vahid bir toplum şəklində həyat sürmüşlər. O, yuxarıda sözügedən iki ayəni bu .(zaman fasiləsinə (mərhələyə) aid edir(۱

Ayətullah Məkarim Şirazi də Bəqərə surəsinin ۲۱۳-cü ayəsini bəşər həyatının ۴ .(mərhələsinə aid olduğunu bildirir(۲

Onun fikrincə dinin göndərilməsi insanın yaranması ilə eyni dövrə təsadüf etmir. Dinin göndərilməsi sinifli cəmaiyyətə keçid dönəminə təsadüf edir. Deməli, ilk ulul-əzm .(peyğəmbərin Adəm (ə) deyil, Nuh (ə) olduğunu desək yanılmarıq(۳

YEKUN

:Qeyd olunan ayələrdən iki nəticə çıxarmaq olar

İnsan Yer kürəsində yarandıqda iki mərhələdən keçmişdir. Birinci mərhələdə heç bir .۱ din və ya peyğəmbər olmamışdır. Sonradan həzrət Adəm (ə) seçilmiş və insanlar dinli cəmiyyət şəklində yaşamağa başlamışlar. Deməli, həzrət Adəm (ə) ilk yaranan insan .(deyil (Bu, Darvinin Təkamül nəzəriyyəsi ilə üst-üstə düşür

Peyğəmbərlərin (ə) göndərilməsi iki cür olmuşdur. Birinci mərhələdə Adəm (ə) . ۲ yaradıldığından və onun nəsli artdıqdan sonra heç bir şəriət və ya kitab verilməyən peyğəmbərlər göndərilmiş və bəşərə ibtidai fərdi həyatlarında bələdçilik etmişlər. İkinci mərhələdə sinifli cəmiyyət formalaşmış və insanlar qanuna ehtiyac

səh:۱۵۶

---

.Quranda təkamül", səh. ۲۷-۲۸" [۳۲۴] -۱

.Təfsiri-nümunə", c. ۲, səh. ۵۸" [۳۲۵] -۲

.Yenə orada [۳۲۶] -۳

duymuşlar. Bu zaman həzrət Nuh (ə) kimi şəriət və kitab sahibi peyğəmbərlər göndərilmişlər. Deməli, ikinci nəticəyə görə Adəm (ə) Yerdə yaranmış ilk insan .(olmuşdur (Bu, "Növlərin dəyişməzliyi" nəzəriyyəsi ilə də üst-üstə düşür

Ayətullah Meşkini birinci versiyanı əsas götürmüş, Ayəullah Məkarim Şirazi isə ikinci versiyaya üstünlük vermişdir. Qeyd olunan iki versiyaya nəzərən qəti olaraq ayənin hansı nəzəriyyəni (növlərin təkamülü, yoxsa dəyişməzliyi) təsdiq etdiyini demək .mümkün deyil

.Üçüncü mərhələyə (Adəmin (ə) insanların arasından seçilməsinə) işarə vuran ayələr .۵

Allah Adəmi, Nuhu, İbrahim övladını və İmran ailəsini aləmlər (məxluqat, insanlar," .(bəşər övladı) üzərində seçilmiş etdi"(۱

:Doktor Yədullah Səhabi məlum ayə haqqında yazır

Bu ayələrə (Ali-İmran, ۳۳; Əraf, ۱۱; Səcdə, ۷-۹) görə Adəm (ə) öncədən birgə" yaşadıqları insanların arasından seçildi. Buna görə də insanın Adəmdən törəməsi fikri (Qurana görə əsassızdır"(۲

Ayətullah Məkarim Şirazi Ali-İmran surəsinin ۳۳-cü ayəsini növlərin təkamülünə aid :edənlərə cavab olaraq yazır

ifadəsindən məqsədin həzrət Adəmin (ə) müasirləri olduğuna heç bir "العالمين" Ayədə" əsas yoxdur. Əksinə bu tarix boyu mövcud olan bütün cəmiyyətlərə aiddir. Buna görə də Adəm dönəmində çoxlu sayda insan olduğunu və



---

.Ali-İmran, ۳۳[۳۲۷] -۱

.İnsanın yaradılışı", səh. ۱۰۸"[۳۲۸] -۲

həzrət Adəmin (ə) onların arasından seçilməsini əsassız olaraq ayəyə aid etməyə (lüzum yoxdur"(١

Ayətullah Misbah Yəzdi Ali-İmran surəsinin ٣٣-cü ayəsini izah edərkən "Adəmin (ə) :insanların içindən seçilməsi fikri" haqqında yazır

Ayəni belə izah etmək olar ki, bir insan özündən sonra gələcək bütün insanlardan" üstün hesab edilmişdir. Əgər bir az mülayim mövqedən çıxış edib Adəm dönəmində .(cəmiyyətin mövcudluğunu qəbul etsək, bu, onun öz övladlarıdır"(٢

YEKUN

Ali-İmran surəsinin ٣٣-cü ayəsi haqqında da iki fərqli ehtimal olduğu üçün qəti olaraq müəyyən ehtimal üzərində dayanmaq olmaz. Təbii ki, belə olduqda ayənin iki nəzəriyyədən (növlərin təkamülü, yoxsa dəyişməzliyi) hansının təsdiqi olduğu da .qaranlıq olaraq qalır

## NÖVLƏRİN DƏYİŞMƏZLİYİ NƏZƏRİYYƏSİNİN İSBATI ÜÇÜN İSTİNAD OLUNAN AYƏLƏR

.Bütün insanların vahid bir candan yaradıldığını bildirən ayələr .١

وَهُوَ الَّذِیَ أَنشَأَكُم مِّن نَّفْسٍ وَاحِدَهٍ فَمُسْتَقَرٌّ وَمُسْتَوْدَعٌ



---

.Təfsiri-nümunə", c. ٢, səh. ٣٢١"[٣٢٩] -١

.Quran maarifi", səh. ٣٤٥" [٣٣٠] -٢

Sizi tək bir nəfərdən (Adəmdəm) yaradan da Odur. (Sizin üçün) bir qərar yeri (ana“ .(bətni, ata beli), bir də bir əmanət yeri (qəbir) vardır”(١)

Bəni-Adəm] (Adəm övladları) deyə müraciət edən ayələrə(٢) də] ”بنی آدم“ Bundan başqa .istinad olunmuşdur

Ayətullah Meşkini “Növlərin dəyişməzliyi” nəzəriyyəsindən söhbət açarkən Adəmin (ə) Allah tərəfindən yaradılan ilk insan olduğunu, sonra Həvvanın yaradıldığını və digər .insanların isə bu iki nəfərdən törətdiklərini bildirir

:O, yazır

Bu nəzəriyyənin isbatı üçün istinad olunan ayələr bütün insanların vahid candan (bir“ fərddən) yaradıldığını bildirən ayələrdir. Bəzi ayələrdə isə onun cütü də yad edilmişdir. .”Bunun Həvva olduğu şübhəsizdir

:Ənam surəsinin ٩٨-ci ayəsini izah edərkən yazır

Ayədən məqsəd budur ki, Allah sizi Adəmdən yaratmışdır. Bəziləriniz hələ atalarınızın“ (مستودع) bəziləriniz isə Qiyamətə qədər qəbirlərdə əmanət olaraq ,(مستقر) belində .”saxlanılırsınız

Onun qənaətincə birinci izahı da qəbul etsək, Növlərin təkamülü nəzəriyyəsi ilə heç bir ziddiyyət təşkil etmir. Ehtimal ki, bütün insanlar Adəm (ə) və Həvvadan yaradılmışlar. Onlardan öncə də varlıqlar olmuş, lakin onların nəsli tükənmişdir. Bu arada seçilmiş .(nəsil, yəni yetkin zəkaya malik Adəm nəsli qalmışdır(٣

:nəfsin vahidə] ifadəsi haqqında yazır] ”نفس واحد“ Ayətullah Məkarim Şirazi

səh:١٥٩

---

١- [٣٣١] Ənam, ٩٨. Nisa, ١; Əraf, ١٨٩; Zümər, ۶ ayələri də həmin məzmundadır.

٢- [٣٣٢] Əraf, ٢٧-٣٥; Yasin, ۶٠; İsra, ٧٠.

٣- [٣٣٣]“Quranda təkamül”, səh. ۴٨.

nəfsin vahidə] ifadəsindən məqsəd vahid şəxsdir. O, Quranın] "نفس واحـدة" Ayələrdə"
bugünkü insanların atası kimi təqdim etdiyi Adəmdir (ə). Bir çox ayələrdə sözü keçən
Bəni-Adəm] ifadəsi də buna işarədir. Növ baxımından vəhdət ehtimalı isə zəif] "بنی آدم"
.(ehtimaldır"(١)

YEKUN

nəfs] Quran ayələrində ruh və can (bəzən də insanın orqanizmi) mənalarını ifadə] "نفس"
dən məqsədin insandan öncəki varlıqlar-"نفس") edir(٢). Ayətullah Meşkininin fikirlərini
olması fikrini) qəbul etsək, ayənin iki izahı olduğu anlaşılacaq. Biri bütün insanların
Adəmdən (ə) törəməsi, digəri isə Adəm (ə) və digər insanların özlərindən öncə mövcud
olmuş varlıqlardan törəməsi. Birinci izah "Növlərin dəyişməzliyi", ikinci izah isə
"Növlərin təkamülü" nəzəriyyəsi ilə uyğun gəlir. Deməli, heç bir izahı ayələrin tam şərhi
.hesab etmək olmaz

.Adəmin (ə) torpaqdan yaradıldığını bildirən ayələr .٢

إِنَّ مَثَلَ عِيسَى عِندَ اللّهِ كَمَثَلِ آدَمَ خَلَقَهُ مِن تُرَابٍ ثِمَّ قَالَ لَهُ كُن فَيَكُونُ

Allah yanında İsa da Adəm kimidir. Allah onu (Adəmi) torpaqdan yaratdı. Sonra ona:"
.((Bəşər) ol! - dedi, o da oldu"(٣

.(İnsanı (Adəmi) saxsı kimi quru palçıqdan O yaratdı"(٤"

Doktor Əbu Həcər yuxarıdakı ayələri(٥), Doktor Ədnan Şərif isə insanın torpaqdan
yaradıldığını göstərən bütün

səh:١۶٠

---

.Təfsiri-nümunə", c. ٣, səh. ٢۴۵" [٣٣۴] -١

.Yenə orada, c. ۵, səh. ٣۶٧ [٣٣۵] -٢

.Ali-İmran, ۵٩[٣٣۵] -٣

.Ər-Rəhman, ١۴[٣٣٧] -۴

.Ət-Təfsir əl-elmi lil-Quran fil-mizan", səh. ۴٠٠" [٣٣٨] -۵

ayələri darvinizmə zidd hesab edir(١).Çünki ayələr insanın öncəki canlı varlıqlardan .deyil, torpaqdan yarandığını göstərir

.Ayətullah Meşkini Ali-İmran surəsinin ٥٩-cu ayəsi haqqında iki ehtimal irəli sürür

Birinci ehtimal: Bu ehtimala görə ayə "Növlərin dəyişməzliyi" nəzəriyyəsini təsdiq edir. Yəni insanın bilavasitə ata-anadan yaradılmadığını önə çəkir və bu, "Növlərin .dəyişməzliyi" nəzəriyyəsi ilə tam üst-üstə düşür

İkinci ehtimal: Bu ehtimala görə ayə Təkamül nəzəriyyəsini təsdiq edir. Çünki İsanın (ə) torpaqdan (qida maddələri - nütfə - laxtalanmış qan) yaradılmaqda Adəmə (ə) bənzədilməsində heç bir irad yoxdur. Əgər Allahın həzrət İsaya (ə) Adəm (ə) kimi həyatının ilk anlarından başlayaraq fövqəladə zəka, metafizik iradə verdiyini söyləsək də yanılmarıq. Ayədə iki peyğəmbər yaradılış və elm baxımından bir-birinə kun] (ol) əmri isə "fövqəladə zəka, bilik və ya peyğəmbərliyə malik] "كن" .bənzədilmişdir .ol" kimi anlaşılır

Torpaqdan yaranmaq baxımından bənzədilmələri isə xristian təfəkkürünü rədd edir. Çünki xristianlar Adəm (ə) və İsanın (ə) yaradılışının ilahi ənənə yolu ilə baş vermədiyini iddia edirlər (yəni onlar peyğəmbər olmalarına, metafizik zəkaya malik olmalarına .(baxmayaraq, bioloji tərkibcə digər insanlardan fərqlənmişlər)(٢

Ayətullah Məkarim Şirazi Ali-İmran surəsinin ٥٩-cu ayəsinin nazilolma səbəbini ifadəsindən "خلقه من تراب" açıqladıqdan sonra yazır: "Adəmin yaradılışı ilə bağlı



---

.Minəl-ülum əl-ərziyyə Quraniyyə", səh. ٢٠٧" [٣٣٩] -١

.Quranda təkamül", səh. ۵۵-۵۶" [٣۴٠] -٢

məqsəd onun bədəni, maddi tərəfidir. Bu, ayənin ardına diqqət yetirdikdə daha aydın olur. Çünki sonra ona həyat verilməsindən, ruh bəxş edilməsindən söhbət açılır(۱) .(”(Sonra ona: (Bəşər) ol! – dedi, o da oldu

YEKUN

.Fikrimizcə, burada bir neçə məqama diqqət yetirmək lazımdır

.Adəm (ə) və İsanın (ə) ataları olmaması baxımından .۱

Hər ikisinin vasitəli şəkildə torpaqdan yaranması baxımından (yəni qida maddələri .۲ nütfəyə çevrilir). Həzrət İsada (ə) bu proses Məryəm (ə) vasitəsi ilə, Adəmdə (ə) isə .özündən öncəki insan və ya meymun nəsli vasitəsi ilə baş verdi

.Hər ikisinin peyğəmbərlik baxımından bənzədilməsi .۳

Bioloji tərkib baxımından bənzədilməsi. Çünki xristianlar İsanın (ə) bioloji tərkibinin .۴ .digər insanlardan fərqli olduğunu iddia edirdilər

Hər ikisinin fövqəlada biliyə, ecazkar zəkaya malik olmaları baxımından . ۵ .bənzədilməsi. Yalnız ikinci və dördüncü bənzətmələr ayənin özündə də açıqlanmışdır

.Həzrət İsanın (ə) torpaqdan yaradılması haqqında da iki ehtimal mövcuddur

.Bilavasitə torpaqdan yaradılması .۱

Vasitəli şəkildə yaradılışının torpağa gedib çıxması (bu iki ehtimal həzrət Adəm (ə) .۲ .(haqqında da mövcuddur



---

Məlum ayə Nəcran xristianları haqqındadır. Onlar həzrət İsanın (ə) atasız [۳۴۱] -۱ dünyaya gəldiyini əsas götürərək, onun Allah olduğunu iddia edirdilər. Ayə onlara cavab verdi. Qəbul etmədikdə isə “mübahiləyə” dəvət olundular (Təfsiri-nümunə”, c. ۲, .(səh. ۴۳۵-۴۳۶

Birinci ehtimal (bilavasitə torpaqdan yaradılması) doğru deyil. Deməli, ikinci ehtimal məqsədəuyğundur (vasitəli şəkildə torpaqdan yaradılması). Bu, "Növlərin təkamülü" .nəzəriyyəsini təsdiq edir

.Hər iki nəzəriyyəyə uyğun izah olunan ayələr .٣

Allah insanı nütfədən (mənidən, bir qətrə sudan) xəlq etdi. Bununla belə, o, birdən-" .(birə açıq-aşkar bir düşmən kəsildi"(١

Onunla söhbət edən (mömin) yoldaşı isə belə dedi: Əvvəlcə səni (baban Adəmi)" torpaqdan, sonra bir qətrə sudan (mənidən) yaratmış, daha sonra səni adam şəklinə "((insan qiyafəsinə) salmış Allahı inkarmı edirsən?(٢

O Rəbbin ki, səni (yoxdan) yaratdı, düzəldib qaydaya (insan şəklinə) saldı. Sənə Özü" .(istədiyi surətdə biçim verdi"(٣

.(۴)( خَلَقَ الْإِنسَانَ مِنْ عَلَقٍ) "O, insanı laxtalanmış qandan yaratdı"

ələq]sözündən məqsəd yapışqan torpaq və ya bətndə formalaşan laxta (bərkiyib [ "علق" .(qatılaşmış) qandır(۵

YEKUN

Məlum ayələrin hər iki nəzəriyyəyə aid edilməsinin yanlış olmasına baxmayaraq, bəzi ayələr haqqında keçən



---

.Nəhl, ۴. Yasin, ۷۷; Nəcm, ۶۶ ayələri də həmin məzmundadır [۳۴۲] -۱
.Kəhf, ۳۷. Fatir, ۱۱ də həmin məzmundadır [۳۴۳] -۲
.İnfitar, ۷-۸ [۳۴۴] -۳
.Ələq, ۲۱ [۳۴۵] -۴
.Quranda təkamül", səh. ۶۳-۶۶"[۳۴۶] -۵

səhifələrdə ətraflı söhbət açdığımız üçün, digər ayələrə isə sözügedən nəzəriyyələrin .isbatı üçün istinad olunmadığına görə bu bəhsi uzatmağa ehtiyac duymuruq

## QURANDA TƏKAMÜL NƏZƏRİYYƏSİ HAQQINDA YEKUN SÖZ

Müasir elmi dairələrdə elmi nəzəriyyələr əvəz oluna biləcək versiyalar şəklində qəbul olunur(۱). Başqa sözlə desək, elmi nəzəriyyələr faydalı fikirlər kimi qəbul olunur və onu əvəz edə biləcək yeni və dəqiq bir nəzəriyyə irəli sürülənədək öz elmi dəyərini itirmir. Təkamül nəzəriyyəsi qəti olaraq isbat olunmasa da o hal-hazırda elmi ictimaiyyət tərəfindən (təcrübi elmlər nəzərdə tutulur) məqbul nəzəriyyə kimi dəyərləndirilir. Eləcə də "Növlərin dəyişməzliyi" nəzəriyyəsi bir ehtimal olaraq irəli sürülmüşdür. Gördüyünüz kimi Quran ayələri hər iki nəzəriyyənin xeyrinə şərh oluna bilər. İki nəzəriyyədən birini tam təsdiq edən aydın bir ayə mövcud deyil. Belə olduqda təbii ki, .heç bir nəzəriyyəni qəti olaraq Qurana aid etmək olmaz

:Qeydlər

Quranın hər hansısa bir nəzəriyyəni isbat və ya rədd etməsi bir zərurət deyil. Çünki .۱ Quran hidayət kitabıdır və onun elmi məsələlərə toxunması da hidayət məqsədi .daşıyır

Təkamül nəzəriyyəsini qəbul və ya inkar etməkdə dinə etiqad heç bir rol oynamır. .۲ Yəni Təkamül nəzəriyyəsini qəbul etməyib dinə etiqad bəsləmək mümkün olduğu kimi, eyni nəzəriyyəni qəbul edərək dinə



---

.Burada məlum, fərz edilən və naməlum terminləri xarakterikdir [۳۴۷] -۱

.(etiqad bəsləmək də mümkündür. Bəzi etiqadlı təbiblər bu yolu getmişlər(١

Təkamül nəzəriyyəsini qəbul etmək və onu Quran ayələrinə tətbiq etmək heç də .٣ Quranın elmi möcüzəsi deyil. Çünki bir tərəfdən istinad olunan ayələr haqqında fərqli ehtimallar, müxtəlif şərhlər mövcuddur, digər tərəfdən isə növlərin (üzvi aləmin) mərhələli təkamülünün (birhüceyrəlidən insana qədər) ayələrə tətbiqi dəqiq deyil (Nur .(surəsinin ٤٥-ci ayəsi haqqında danışarkən bunun şahidi olduq

## BİTKİ VƏ ƏŞYALARIN CÜTLÜYÜ (ERKƏK VƏ DİŞİ CİNSİ HÜCEYRƏLƏRƏ – QAMETLƏRƏ (MALİK OLMASI

Cütlükdən məqsəd erkək və dişidən (bitkilərdə erkəkcik və dişicik) ibarət olmaqdır. Quran bir çox ayələrə nəinki bitkilərin, hətta bütün əşyaların cüt olduğuna (yəni erkək .və dişi cinslərindən ibarət olmasına) işarələr vurur

وَمِن كُلِّ الثَّمَرَاتِ جَعَلَ فِيهَا زَوْجَيْنِ اثْنَيْنِ يُغْشِى اللَّيْلَ النَّهَارَ إِنَّ فِى ذَلِكَ لَآيَاتٍ لِّقَوْمٍ يَتَفَكَّرُونَ

Bütün meyvələrdən (erkək-dişi olmaqla) cüt-cüt yetişdirən, gecəni gündüzlə“ (gündüzü də gecə ilə) örtüb bürüyən Odur. Şübhəsiz ki, bunda (bütün bu deyilənlərdə) düşünən insanlar üçün (Allahın qüdrətini və vəhdaniyyətini sübut edən) neçə-neçə ”(dəlillər vardır!(٢

”(Məgər onlar yer üzünə baxıb orada gözəl cütlər yetişdirdiyimizi görmürlərmi?(٣“

səh:١٦٥

---

.İlk universitet, son peyğəmbər”, c. ١, səh. ١٥٤“ [٣٤٨] -١

.Rəd, ٣. Ər-Rəhman, ٥٢ və Taha, ٥٣ ayələri də həmin məzmundadır [٣٤٩] -٢

.Şüəra, ٧. Həc, ٥; Loğman, ١٠; Qaf, ٧ və Taha, ٥٣ ayələri də eyni məzmundadır [٣٥٠] -٣

Yerin yetişdirdiklərindən, onların (insanların) özlərindən və bilmədiklərindən (erkək və"
."(dişi olmaqla) cütlər yaradan Allah pakdır, müqəddəsdir! (Eyibsiz və nöqsansızdır!)(١

Biz hər şeydən (erkək və dişi, bir-birinin əksi olmaqla) cüt-cüt yaratdıq. Bəlkə, bir"
"(düşünüb ibrət alasınız!(٢

Sizi tək bir nəfərdən (Adəmdən) xəlq edən və onunla ünsiyyət etmək (sakit, rahat"
."(olmaq) üçün özündən zövcəsini (Həvvanı) yaradan Odur(٣

:Məqamlar

.Fikrimizcə yuxarıdakı ayələri aşağıdakı şəkildə sıralamaq olar .١

Bəzən Quran meyvələrin cütlüyündən, növbəti mərhələdə isə bitkilərin cütlüyündən söhbət açır. Sonra insanların bilmədiyi şeylərin cütlüyündən, daha sonra isə dünyada .mövcud olan bütün əşyaların cütlüyündən danışır

Bütün bunlardan məqsəd diqqəti ilahi nişanələrə yönəltmək və insanı düşünməyə .٢ .vadar etməkdir

Şübhəsiz ki, bunda (bütün bu deyilənlərdə) düşünən insanlar üçün (Allahın qüdrətini"
(və vəhdaniyyətini sübut edən) neçə-neçə dəlillər vardır!" (Rəd, ٣

(Bəlkə, bir düşünüb ibrət alasınız!" (Şüəra, ٧"

:zəvc]sözü leksik baxımdan aşağıdakı mənaları ifadə edir] "زوج" .٣

.zəvc] deyilir] "زوج" Heyvanlarda erkək və dişi cinsin hər birinə .١



---

.Yasin, ٣۶ [٣۵١] -١
.Zariyat, ۴٩ [٣۵٢] -٢
.Əraf, ١٨٩[٣۵٣] -٣

zəvc]] "زوج" (.Qeyri-heyvanlarda biri-birinə yaxın olan hər bir şeyə (ayaqqabı tayı və s .٢
.deyilir

.zəvc]deyilir] "زوج" Biri-birinə yaxın və oxşar olan hər bir şeyə .٣

.zəvc] deyilir] "زوج" Biri-birinə yaxın və zidd olan hər bir şeyə .۴

**QISA TARİX**

İnsanlar tarix boyu erkək və dişi cinsinin yalnız insan, heyvan və xurma kimi bəzi bitkilərə aid olduğunu düşünürdülər. Lakin İsveç botaniki Karl Linney (١٧٠٧-١٧٢٧) ١٧٣١-ci ildə bitkilərin də erkək və dişi cinslər üzrə bölündükləri haqqında fikrini açıqladı. Bu .(nəzəriyyə elmi ictimaiyyət tərəfindən müsbət qarşılandı(١

Sonralar kəşf olundu ki, maddə son dərəcə kiçik zərrəciklər şəklində olan enerji yığınından, yəni atomdan təşkil olunmuşdur. Çox keçmədən cütlük məsələsi hər şeyə aid edildi. Çünki artıq varlıqların əsasını təşkil edən atomun (mənfi yüklü) elektron və .(müsbət yüklü) protonlardan ibarət olduğu aşkarlanmışdı

XX əsrin görkəmli fiziki Maks Plank "hər maddi cisim elektron və protonolardan" ibarətdir" deyə bildirirdi(٢). Zaman keçdikcə atomda neytron adlanan üçüncü elmentar zərrəcik aşkar olundu. Neytron neytral (elektrik yükünə malik olmayan) elementar .zərrəciklər

Son fiziklər kvark adlanan digər əsaslı zərrəcik kəşf etmişlər. Elektron, proton və neytron kvarkdan təşkil



---

Bir müddət keçdikdən sonra kilsə ruhaniləri tərəfindən K. Linneyin fəaliyyəti [٣۵۴] -١
.(donduruldu. Onun əsərləri dinə zidd kitablar elan olundu ("Ziyalıların sovqatı", səh.٧٣
.Maks Plank, "Yeni fizikada dünyanın mənzərəsi", səh. ٩۵ [٣۵۵] -٢

olunmuş və onlarda müsbət, mənfi və neytral elektrik yüklərinin meydana gəlməsini .(təmin edir(١

**ELMİ SİRLƏR**

Bir çox təfsirçilər və elm adamları nəinki bitkilərin, hətta bütün şeylərin (erkəkcik və dişicik olmaqla) cüt olmaları ilə bağlı qeyd olunan ayələrə əsaslanmışlar. Aşağıda belə .fikirlərdən bir neçəsini diqqətinizə çatdırırıq

Mərhum Təbərsi təqribən ٩ əsr bundan öncə Quran ayələrini əsas götürərək .١ ("Məcmə əl-bəyan" təfsir əsərində) bitkilərin, heyvanların, hətta əşyaların (erkək və .(dişi olmaqla) cüt-cüt yaradıldıqları fikrini önə çəkir və qəbul edir(٢

:Ayətullah Məkarim Şirazi Yasin surəsinin ٣٦-cı ayəsini şərh edərkən yazır

zəvc]sözünün cəm formasıdır və adətən erkək və] "زوج" əzvac]sözü] "ازواج" ,Aydındır ki" dişi cinslərin cütlüyünə deyilir. Sonradan bu söz daha geniş mənada, bir-birinə yaxın olan və ya biri-digərinin əksi olan hər bir varlıq haqqında işlənməyə başladı. Quran (nazil olduğu dönəmdə yalnız xurma və s. bəzi bitkilərin (erkək və dişi olmaqla



---

İndiyədək U və D adi, S qəribə və s. heyranedici kvarkın varlığı aşkar edilmişdir.[٣٥٦] -١ U və D adi kvarklar stabil elementar zərrəciklərin təşkilində mühüm rol oynayır. U kvarkı ٢/٣ elektrik yükünə, D kvarkı isə ١/٣ elektrik yükünə malikdir. Müsbət elektrik yükünə malik proton iki U və bir D kvarkından təşkil olunmuş və müsbət elektrik yükü hasil olmuşdur. ٢/٣ + ٢/٣ – ١/٣ = +١ Bunun əksinə olaraq neytronlar iki D və bir U kvarkdan təşkil olunmuşdur. Buna görə də neytral yüklüdür. - ١/٣ – ١/٣ + ٢/٣ =٠ ("Yeni fizika", səh. .(٣٤-٣٥

.Məcmə əl-bəyan", c. ٨, səh. ٤٢٤" [٣٥٧] -٢

cüt olduqları məlum idi. Lakin Quran bu qanunun hər bir şeyi əhatə etdiyini aşkara çıxartdı. Son dövrlərdə cütlük məsələsinin ümumilikdə bütün bitkiləri (nəbatat aləmini) .”əhatə etdiyi elmi yollarla sübuta yetirilmişdir

zəvc] sözünü növ və ya digər] ”زوج“ Zariyat surəsinin ۴۹-cu ayəsini şərh edərkən :mənalara yozanlara cavab olaraq yazır

zəvc]sözü adətən erkək və dişi cinslərə deyilir. Bu baxımdan] ”زوج“ Ərəb dilində“ nəbatat və ya heyvanat aləmi arasında fərq qoyulmur. Əgər həmin ifadəni daha geniş فی“ mənada götürsək bütün mənfi, müsbət yükləri əhatə edir. Əgər yuxarıdakı ayədə hər bir şeydən) ifadəsinə nəzər salsaq, bunun nəinki canlı varlıqlara, hətta) ”كل شیء dünyada mənfi və müsbət yüklü zərrəciklərdən ibarət hər şeyə aid olduğunu görərik. Artıq elmi baxımdan atomların müxtəlif zərrəciklərdən ibarət olduğu isbat olunmuşdur. Bu zərrəcikləri mənfi elektrik yüklü elektronlar və müsbət elektrik yüklü protonlar şey`] ifadəsini isə növ və ya fəsilə kimi başa] ”شیء“ təşkil edir. Ayədə sözügedən .(düşməyə məcbur deyilik”(۱)

:Əllamə Təbatəbai “Quranın ecazkarlığı” kitabının ön sözündə yazır .۳

Dünya cəhalətə qərq olduğu bir dönəmdə Quran on ayədə bitkilərin cütlüyündən“ .(söhbət açır və bildirir ki, bitkilər cüt yaradılmışlar (Rəd, ۳; Şüəra, ۷ və s.)(۲)

:Bəzi yazıçılar Yasin surəsinin ۳۶-cı ayəsindən belə nəticə alırlar .۴

Tam aydındır ki, ayə bitkilərin (erkəkcik və dişicik olmaqla) cütlüyünə aiddir. Bundan“ başqa, ayə bizim



---

.Təfsiri-nümunə”, c. ۲۲, səh. ۳۷۶“ [۳۵۸] -۱

.Quranın ecazkarlığı”, səh. ۱۵“ [۳۵۹] -۲

bilmədiyimiz şeylərin də cüt-cüt yaradıldığını bildirir. Buradan ayənin mənfi və müsbət elektrik yüklərinə və s. aid olduğunu da söyləmək olar”(١).

٥. Digər yazıçılar da məlum ayələrin nəinki bitkilərin, hətta atomun tərkibini təşkil edən elektron və protonları da əhatə etdiyini vurğulamışlar(٢).

٦. Əhməd Məhəmməd Süleyman da sual-cavab şəklində tənzimlədiyi kitabda Zariyat surəsinin ۴٩-cu ayəsinə əsaslanaraq maddənin cütlüyü qənaətinə gəlmişdir(٣).

٧. Məhəmməd Əli Sadat atomun tərkibi haqqında ətraflı söhbət açaraq atom barəsindəki bəhslərin tarixi keçmişinə toxunur və Zariyat surəsinin ۴٩-cu ayəsinə əsaslanır(۴).

٨. Müasir yazarlardan biri maddənin cütlüyündən (Puality of Matter) söhbət açarkən Zariyat, ۴٩; Ər-Rəhman, ۵٢ və Taha, ۵٣ ayələrinə istinad edir(۵).

٩. Məhəmməd Təqi Şəriəti sözügedən ayələri Quranın ecazkarlığının nümunələri hesab edərək hər bir şeyin (erkək və dişi olmaqla) cüt-cüt yaradıldığını bildirir(۶).

١٠. Əbd ər-Razzaq Nofel Əraf surəsinin ١٨٩-cu ayəsi haqqında yazır:

“Bu gün kəşf olunan məlum elmi həqiqət (bütün varlıqların eyni zərrəciklərdən ibarət olması) ١۴٠٠ il öncə Quranda açıqca bildirilmişdir. “نفس واحده” [nəfsin vahidə] ifadəsindən [məqsəd vahid elektrik yüklü (mənfi və müsbət olmaqla) elektron və protonlardır”.

O, “ليکسن اليها” ibarəsi haqqında yazır:

səh:١٧٠

---

١- [٣۶٠] “Elm və dinin əlaqəsi”, səh. ٣۵-٣۶.

٢- [٣۶١] “Quranın heyrətləndirici məsələləri”, səh. ۵٧-۶٠.

٣- [٣۶٢] “Quran və təbabət”, səh. ٢٧-٢٨.

۴- [٣۶٣] “Əbədi möcüzə və həmişəyaşarlıq”, səh. ٣٩-۴٣.

۵- [٣۶۴] Lətif Raşidi, “Quranda təbiətşünaslıq elmlərinə bir baxış”, səh. ٢۴.

۶- [٣۶۵] “Təfsiri-novin”, səh.

zəvc] göstərilmişdir. Bu gün elmdə] "زوج" in təskinliyinə səbəb kimi-"نفس واحده" Ayədə"
sübuta yetirilmişdir ki, elektron və protonların stabilliyi onlarda mövcud olan elektrik
.(yükünün bərabərliyi və ya fərqliliyindən asılıdır"(١

Təntavi bitkilərin cütlüyü haqqında geniş söhbət açaraq bitki və heyvanları müxtəlif .١١ bölgülərini, onların cinslərini tədqiq etmişdir. Lakin bunların məlum ayə ilə (Zariyat, ۴٩) .heç bir bağlılığı yoxdur

YEKUN

.Burada bir neçə məqama toxunmağı zəruri hesab edirik

Əbd ər-Rəzzaq Nofelin Əraf surəsinin ١٨٩-cu ayəsini şərh edərkən irəli sürdüyü . ١ .fikirlər iki cəhətdən tənqid oluna bilər

zəvc] sözləri istər leksik, istərsə də terminoloji məna] "زوج" nəfs]və] "نفس" ,Birincisi .baxımından elektron və protonlar haqqında işlədilmir

İkincisi, protonun elektrondan əmələ gəlməsi elmi baxımdan yanlışdır. Öncə də qeyd .olunduğu elektron və proton hər biri adi U və D kvarklarından təşkil olunmuşdur

Üçüncüsü, ayədəki ümumi vəziyyət və məsələnin qoyuluşu göstərir ki, onun :açıqlaması ayəyə uyğun deyil. Çünki ayədə oxuyuruq

Sizi tək bir nəfərdən (Adəmdən) xəlq edən və onunla ünsiyyət etmək (sakit, rahat" olmaq) üçün özündən zövcəsini (Həvvanı) yaradan Odur. (Adəm) zövcəsi ilə yaxınlıq etdikdə o, (Həvva) yüngül bir yüklə yükləndi (hamilə oldu) və (bir müddət həmin yükü) daşıdı (onunla oturub-durdu). (Həvva) ağırlaşdığı vaxt onların hər ikisi



---

.Quran və hədisşünaslıq", səh. ١۵۴-١۵٧" [٣۶۶] -١

Allaha dua edib: Əgər bizə saleh (sağlam, ağıllı, hər şeyi yerli-yerində) bir uşaq versən, (bu ne’mətə görə Sənə) şükür edənlərdən olarıq! – dedi(١)”.

Ayə qadının kişidən uşağa qalması (Həvvanın Adəmdən) və uşaq dünyaya gətirməsi haqqında danışır. Deməli, “نفس” [nəfs] və “زوج” [zəvc] sözlərindən də məqsəd elektron və proton deyil, kişi və qadındır.

٢. Digər ayələr (Rəd, ٣; Şüəra, ٧; Yasin, ٣۶) meyvə və bitkilərin cüt-cüt (erkəkcik və dişicik cinsi hüceyrələr şəklində) yaradıldığını bildirir. Öncə də qeyd etdiyimiz kimi, təbiətdə hakim olan bu qanun ١٨-ci əsrdə kəşf olunmuşdur. Ondan öncə isə cütlük məsələsinin yalnız xurmaya aid olduğu düşünülürdü. Deməli, bu bir növ elmi sirdir və Quranın ecazkarlığını göstərir.

٣. Cütlük məsələsini ümumiləşdirilərək hər şeyə aid edilməsi Zariyat surəsinin ۴٩-cu ayəsində açıqca göstərilir. Lakin bunun elektron və protonlar kimi izah olunması ayənin tam mənası demək deyil.

۴. Zariyat surəsinin ۴٩-cu ayəsində “زوجين” [zəvcəyn] sözünün real nümunələri tam dəqiqliyi ilə göstərilməmişdir. Lakin buna baxmayaraq, cütlük məsələsinin ümumiləşdirilərək hər bir şeyə aid edilməsi İslamın erkən çağlarında heç kimin təsəvvür belə etmədiyi elmi sirlərdəndir və elə ona görə də Quranın elmi möcüzələrindən sayılır.

۵. Bəziləri varlıqların cütlüyünün ümumiləşdirilməsi bəzi birhecüyrəlilərin qarşı cinsə ehtiyac olmadan çoxalması ilə ziddiyyət təşkil etdiyini iddia edə bilərlər. Qeyd etməliyik ki, bu haqda növbəti bəhslərdə ətraflı söhbət açacaq və ziddiyyətin olmadığını aydınlaşdıracağıq.



---

١- [٣۶٧] Əraf, ١٨٩.

## TOZLANDIRMA, QURANIN ELMİ MÖCÜZƏSİ KİMİ

Hər bir erkək və dişi varlıq mayalandıqda (tozlandıqda) məhsuldar olur. Onların mayalanması erkək və dişi cinsi hüceyrələrin (qametlərin) birləşməsi nəticəsində baş verir.(١)

Quran bitki və buludların mayalanmasına (tozlanmasına) işarə vuraraq buyurur:

وَأَرْسَلْنَا الرِّيَاحَ لَوَاقِحَ فَأَنزَلْنَا مِنَ السَّمَاءِ مَاءً فَأَسْقَيْنَاكُمُوهُ وَمَا أَنتُمْ لَهُ بِخَازِنِينَ

"Biz (buludla) yüklənmiş (bitkilərə, ağaclara həyat verən, onları tozlandıran) külək göndərdik, göydən yağmur endirib sizə su verdik. Yoxsa onu yığıb saxlayan (bir yerə toplayan) siz deyilsiniz!"(٢)

"Buludları hərəkətə gətirən küləkləri göndərib onları göy üzündə istədiyi kimi yayan və topa-topa edən Allahdır. Artıq buludların arasından yağış çıxdığını görürsən. Onu (yağışı) bəndələrindən istədiyinə verən kimi onlar sevinərlər".(٣)

## QISA TARİX

Burada iki tarixçəyə nəzər salaq:

١. Bəşər hələ İslamdan öncə bilirdi ki, əgər bitkilərin erkəkcik tozcuğu tozlanma əməliyyatı üçün çiçəkli meyvə



---

١- [٣۶٨] Hər bir növün məlum (cinsi) ünsiyyəti digər növlərdən fərqlənir. Misal üçün, bitkilərdə tozlanma, buludlarda müsbət və mənfi yüklü buludların toqquşması, insan və hevanlarda isə spermanın xüsusi yolla ötürülməsi vasitəsi ilə baş verir.

٢- [٣۶٩] Hicr, ٢٢.

٣- [٣٧٠] Rum, ۴٨. Fatir, ٩ ayəsi də həmin məzmundadır.

ağaclarına ötürülməsə az məhsul əldə olunacaq. Misal üçün, Ərəbistanda bağçılar xurma ağaclarının erkəkcik salxımlarını tozlanma üçün çiçəkli budaqlara səpərək süni tozlanma üsulundan istifadə edirdilər. Lakin ۱۸-ci əsrin sonlarında, ۱۹-cu əsrin əvvəllərində yeni tədqiqat vasitələri (mikroskop və s.) meydana çıxdıqca kəşf olundu ki, heyvanlarda və bitkilərdə mayalanma və tozlanma olmadıqda çoxalma, artım mümkün deyil(۱) (Bu, yalnız bəzi bitki və heyvanlarda mümkündür. Hansı ki, onların .(çoxalması (artımı) hüceyrələrin bölünməsi və s. yollarla gerçəkləşir

Əsrlər boyu bəşər yağışın buludlardan yağdığı haqqında dəqiq məlumata malik .۲ deyildi. Lakin son dövrlərdə fizika sahəsində əldə olunan nailiyyətlər, meteorologiya kimi yeni elmi sahələrin təsis olunması buludların mayalanmasını (mənfi və müsbət yüklü buludların toqquşmasını) üzə çıxardı (hətta süni yolla yağış yağdırılması da tədqiqatların obyektinə çevrildi). Bu zaman bəlli oldu ki, buludların mayalanmasında küləklər mühüm rol oynayır. Bir tərəfdən havanın tərkibindəki su buxarının kondensasiyası nəticəsində yaranmış su damlalrı, buz kristalları və ya onların qarışığının atmosferdə yığılmasında, digər tərəfdən isə elektrik yükü ilə .(yüklənməsində və həmin yükün boşaldılmasında əvəzsiz roll oynayır(۲



---

Sonralar məlum oldu ki, örtülütoxumlularda iki cür tozlanma – öz-özünə [ ۳۷۱ ] -۱ tozlanma (avtoqamiya) və çarpaz tozlanma (geytenoqamiya, yaxud ksenoqamiya) olur. Çarpaz tozlanma heyvan (zoofiliya), külək (anemofiliya), su (hidrofiliya) vasitəsi ilə olur. Çiçəkli bitkilərin əksər növləri heyvanlar vasitəsi ilə əsasən, cücülərlə (entomofiliya), bir qism quşlarla (ornitofikiya), az hissəsi məməlilərlə (yarasalar, .gəmiriçilər və s.) tozlanır

.Quranda yağış", səh. ۵۹" [۳۷۲] -۲

Təfsirçilər Hicr surəsinin ۲۲-ci ayəsini şərh edərkən sözügedən tozlanma haqqında geniş söhbət açmışlar. Ayə ilə bağlı üç fərqli baxış mövcuddur. Hər bir baxış .tozlanmanın bir növünə yönəlmiş və elmi açıqlamalar verilmişdir

.Ayə ilə bağlı məlum baxışlara nəzər salaq

.a) Bitkilərin tozlanması

:Müasir yazıçılardan biri yazır

Ayə bitkilərin küləklər vasitəsilə tozlanmasını (anemofiliya) aydın şəkildə bəyan edir.“ .(Ayrıca, bitkilərin erkəkcik və dişicik olmaqla cütlərdən ibarət olduqları da anlaşılır”(۱

Fəthullah Kaşani bitkilərin tozlanmasını ayə haqqındakı iki ehtimaldan biri hesab .(edir(۲

:Bəzi yazıçılar yuxarıdakı ayənin bitkilərlə bağlı olduğunu bildirərək yazırlar

Bitki və güllər bir-birinə yetmək üçün yerlərini dəyişə bilmədiklərinə görə onlarda“ (çarpaz) tozlanma cücülər (entomofiliya), əsasən də külək vasitəsilə (anemofiliya) baş .(verir”(۳

.Onların fikrincə Qurana görə evlilik yalnız insan və heyvana məxsus deyil

Əhməd Məhəmməd Süleyman məlum ayəni (Hicr, ۲۲) şərh edərkən onun bitkilərin tozlanması ilə bağlı olduğunu bildirir. O, tozlanma vasitələrini əsas (cücülər və s.) və qeyri-əsas (su və s.) olmaqla iki yerə bölür və küləyin də tozlanma əməliyyatında .mühüm rolu olduğunu qeyd edir



---

.Din və elmin əlaqəsi”, səh. ۳۶“ [۳۷۳] -۱
.Mənhəc əs-sadiqin”, c. ۵, səh. ۱۵۷“ [۳۷۴] -۲
.Quran və hədisdə yeni elmin işartıları”, c. ۲, səh. ۲۳“ [۳۷۵] -۳

O, göstərir ki, suda-quruda bitən bitkilərin böyük əksəriyyəti külək vasitəsi ilə tozlanır və elə buna görə də Quran tozlanma vasitələrindən yalnız külək haqqında söhbət açmışdır. Bu, Quranın möcüzəsidir. Çünki bəşər yalnız ۱۸-ci əsrin sonu və ۱۹-cu əsrin əvvəllərində tozlanma haqqında bilgi əldə edə bildiyi halda Quran əsrlər öncə bu .(məsələyə aydınlıq gətirmişdir(۱

Bəzi ərəb nəzəriyyəçiləri heç bir şərh vermədən məlum ayənin ağacların tozlanmasına .(aid olduğunu bildirmişlər(۲

.(b) Buludların tozlanması (toqquşması

Mərhum Təbərsi (h. q. ۵۴۸) məlum ayəni buludların toqquşmasına aid edən ilk :təfsirçidir. O, ayəni izah edərkən yazır

“وَأَرْسَلْنَا الرِّيَاحَ لَوَاقِحَ vasitəsidir (toqquşma) tozlanma buludların külək yəni. فَأَنزَلْنَا مِنَ السَّمَاءِ مَاءً .(yəni yağış yağdırdıq”(۳

:Mühəndis Bazərqan həmin izahı qəbul edərək yazır

Ayə buludların yüklənməsi və tozlanması (toqquşması) ilə bağlıdır. Hansı ki, bunun“ .”nəticəsində yağış yağır

:O, əsərinin digər hissəsində yazır

Qeyd etmək lazımdır ki, qeyd olunan iki şərtin (havanın tərkibində su buxarının“ kondensiyası nəticəsində yaranmış su damlaları və havanın soyuyaraq su buxarları ilə doyma vəziyyətinə yaxınlaşması) təmin olunması buludun əmələ gəlməsi və yağış yağması üçün kifayət deyil. Burada üçüncü şərt də zəruridir. Bu, buludların tozlanma ,əməliyyatıdır (Germination Stimulatio). Deməli



---

.Quran və təbabət”, səh. ۲۴-۲۶“ [۳۷۶] -۱

.Əl-Furqan və əl-Quran”, səh. ۵۱۱“ [۳۷۷] -۲

.Məcmə əl-bəyan”, c. ۳, səh. ۳۳۴“[۳۷۸] -۳

buludun əmələ gəlməsi heç də yağış və ya qar yağması üçün kifayət deyil. Küləyin təhriki və dəxaləti mütləqdir”(١).

Əhməd Əmin yazır:

“Ayədə məqsəd küləyin müsbət elektrik yüklü bulud parçasının mənfi elektrik yüklü bulud parçası ilə toqquşmasındakı (ünsiyyətə girməsindəki) roludur. Bu, ayənin həmişəyaşar bir möcüzə olduğunun göstəricisidir. Çünki ayə təqribən ١٣٩٠ il öncə bugünkü elmi araşdırmaların nəticəsini açıqlamışdır”(٢).

Ayətullah Məkarim Şirazi də buludların tozlanması ehtimalını qəbul, bitkilərin tozlanması ehtimalını isə rədd edir(٣).

Əhməd Ömər Əbu Həcər də məlum ayəni (Hicr, ٢٢) buludların toqquşması kimi izah etmişdir(۴).

c) Buludların və bitkilərin tozlanması.

Bəzi yazıçılar Hicr surəsinin ٢٢-ci ayəsini nəbatat aləmində baş verən tozlanma və buludların toqquşması kimi izah etmişlər (yəni hər iki ehtimalı qəbul etmişlər)(۵).”

Digər yazıçı isə haqqında söhbət açdığımız ayələri (Hicr, ٢٢ və Rum, ۴٧) qeyd edərək buludları təhrik edən (hərəkətə gətirən) diyar-diyar dolandıraraq yağışa çevirən küləklər kimi izah edir(۶).

Məhəmməd Əli Sadat məlum ayəni (Hicr, ٢٢) şərh edərək yazır:

səh:١٧٧

---

١- [٣٧٩] “Külək və yağış Quranda”, səh. ۵٩, ١٢۶.

٢- [٣٨٠] “Təkamülün yolu”, səh. ۵٧.

٣- [٣٨١] “Təfsiri-nümunə”, c. ١١, səh. ۶١.

۴- [٣٨٢] “Ət-Təfsir əl-elmi lil-Mizan”, səh. ۴۶١-۴۶٣.

۵- [٣٨٣] “Quranın heyrətləndirici məsələləri”, səh. ۶٢.

۶- [٣٨۴] Mustafa Zəmani, “Quranın elmi öngürülmələri”, səh. ٩١-٩٣

Yeni elmi nailiyyətlər göstərir ki, ayə açıqca küləyin tozlanma vasitələrindən biri (bitki“
.(və buludların tozlanmasında) olduğunu qeyd edir”(١)

bağlayıcısının mövcud olduğu bir halda onu yalnız bitkilərə aid etməyin ”فاء“ O, ayədə
:yanlış olduğunu bildirərək yazır

Ayənin mətninə azacıq diqqət yetirsək və onu digər ayələrlə müqayisə etsək görərik“
ki, ayənin birinci hissəsi ümumi məqsəd daşıyır və burada heç bir inhisardan söhbət
:gedə bilməz. Misal üçün, Quranın özündən bir neçə nümunəyə nəzər salaq

Göydən su (yağış) endirən Odur. Biz onunla hər bir bitkini yetişdirdik, yaşıl fidanlar“
.(göyərtdik, onlardan bir-birinə sarmaşmış (sünbül olmuş) dənələr çıxartdıq”(٢

:Eləcə də Əraf surəsinin ٥٧-ci ayəsində oxuyuruq

Küləkləri Öz mərhəməti önündə (yağışdan qabaq) müjdəçi olaraq göndərən Odur.“
Belə ki, küləklər (yağmur yüklü) ağır buludları hərəkətə gətirdiyi (daşıdığı) zaman Biz
onları (buludları) ölü (qurumuş) bir məmləkətə tərəf qovur, ora yağmur endirir və
.”onunla hər cür meyvə yetişdiririk

Ayələrin hər birində suyun ayrı bir funksiyasından və yalnız bir təsirindən (bitkilərin
göyərməsi) söhbət açılmışdır. Halbuki suyun enməsinin (yağışın yağmasının) faydası
əxrəcna] felindən] أخرجنا bununla bitmir (Yaddan çıxarmayaq ki, ayələrin hər ikisində
.(bağlayıcısı gəlmişdir)”(٣ ”فاء“ öncə

səh:١٧٨

---

.Əbədi möcüzə və həmişəyaşarlıq”, səh. ٣٥-٣۶“ [٣٨٥] -١
.Ənam, ٩٩[٣٨۶] -٢
.Yenə orada, səh. ٣٩ [٣٨٧] -٣

YEKUN

.Burada bir neçə məqama diqqət yetirmək zəruridir

:ləvaqih] ifadəsindən dörd məna nəzərdə tutula bilər] "لواقح" Ayədə sözügedən .١

.Külələri (buludların) yükü olaraq göndərdik .١

.Küləkləri (bitkilərin) tozcuğu olaraq göndərdik .٢

.Küləkləri (buludları) tozlandıran olaraq göndərdik .٣

.Küləkləri (bitkiləri) tozlandıran olaraq göndərik .۴

ləvaqih] ifadəsi qeydsiz işləndiyi üçün onun təsirli və ya təsirsiz fel kökündən] "لواقح" olduğu məlum deyil. Elə buna görə də dörd ehtimaldan heç birini istisna etmək olmaz. cümləsindən فَأَنزَلْنَا مِنَ السَّمَاءِ مَاءً Lakin ayənin ardından, yəni yağışın nəticəsi kimi göstərilən .birinci və üçüncü ehtimalların məqsədəuyğun olduğu anlaşılır

ləvaqih] ifadəsindən məqsəd bitki və ya buludların] "لواقح" Sözügedən ayədə yer alan .٢ tozlanmasından daha geniş məna ola bilər. Belə ki, bitki və buludların tozlanması isə həmin geniş anlayışın iki nümunəsidir. Elm inkişaf etdikcə ayənin mənası daha da .genişlənə bilər

Quranın Hicr surəsinin ٢٢-ci ayəsində buludların toqquşmasına işarə vurması elmi .٣ möcüzə hesab oluna bilər. Çünki bu son illərə qədər bəşərə bəlli deyildi. Lakin bitkilərin tozlanmasına işarə vurması elmi möcüzə hesab oluna bilməz. Çünki hətta İslamdan .öncə belə bitkilərin tozlanması insanlara bəlli idi

## BİRİNCİ HİSSƏ: QURAN VƏ GİGİYENA

### GİRİŞ

Quranda bir çox məsələlərə toxunulmuşdur ki, gigiyenik baxımdan böyük əhəmiyyət daşıyır. Başqa sözlə desək, Quranda qeyd olunan bir çox dini hökmlər tibb və gigiyena baxımından çox faydalıdır. Zaman keçdikcə, təbabət inkişaf etdikcə, bu sirlər daha da aydınlaşır. Quranın önə çəkdiyi bu məsələlər İslamın erkən çağlarında adi ağılla, günün .təbabəti ilə düşünülə bilmirdi. Bu Quranın elmi ecazkarlığı deməkdir

Aşağıda qısa da olsa bəzi ayə və hökmləri, onların tibbi faydalarını diqqətinizə .çatdırırıq

### QİDALANMA GİGİYENASI: ١. TƏMİZ ƏRZAQ MƏHSULLARI

#### İŞARƏ

TƏYYİB= "طيب"

:Quranda oxuyuruq

١. يَا أَيُّهَا الَّذِينَ آمَنُواْ كُلُواْ مِن طَيِّبَاتِ مَا رَزَقْنَاكُمْ

(Ey iman gətirənlər! Sizə verdiyimiz rüzilərin (təmiz və) halalından yeyin!" (١"

səh:١٨٠

---

Bəqərə, ١٧٢. Bəqərə, ٧٥; Maidə, ٤-٥; Əraf, ١٥٧-١٦٠ və Muminin, ٥١ ayələri də [٣٨٩] -١ .həmin məzmundadır

۲. يَا أَيُّهَا النَّاسُ كُلُواْ مِمَّا فِى الأَرْضِ حَلاَلاً طَيِّباً

.(Ey insanlar! Yer üzündəki qidaların təmiz, halal olanlarını yeyin”(۱“

Ya Peyğəmbərim!) De: Allahın Öz bəndələri üçün yaratdığı zinəti və təmiz (halal)) .۳ (ruziləri kim haram buyurmuşdur?(۲

## QURANIN TƏKLİF ETDİYİ YEMƏK REJİMİ

Quranda bir sıra ayələr insana necə deyərlər, özünəməxsus yemək rejimi (yemək .pəhrizi) təklif edir. Bu Quran ayələrində bir neçə mərhələdə əks olunmuşdur

.Birinci: Təmiz (ürəyəyatan) yeməklər (ərzaq məhsulları) yeyin

.İkinci: Təmiz və halal yeməklər yeyin

Üçüncü: Təmiz yeməkləri özünüzə haram etməyin (təmiz yeməkləri özlərinə haram .(edənləri bu işdən çəkindirin

(.Dördüncü: Təmiz (ürəyəyatan) ərzaq məhsullarını tanıtdırır (ət, süd, bal və s

Beşinci: İyrənc (ikrah doğuran) qida məhsullarının insan üçün haram olduğunu .(bildirir(۳

Altıncı: İyrənc (ikrah doğuran) ərzaq məhsullarının (qan, leş və s.) adını çəkir və haram .olduğunu bildirir



---

.Bəqərə, ۱۶۸. Maidə, ۸ Ənfal, ۶۹; Nəhl, ۱۱۴ ayələri də həmin məzmundadır [۳۹۰] -۱
.Əraf, ۳۲. Maidə, ۸۷ də eyni məzmundadır [۳۹۱] -۲
.Ə`raf, ۱۵۷[۳۹۲] -۳

İnsan təbii olaraq bir çox ərzaq məhsullarını xoşlayır. İslam dini insanın fitrətinə uyğun olduğu üçün bizə təmiz (ürəyəyatan, ürəkoxşayan) yeməklərlə qidalanmağı əmr edir. Lakin bəzi cərəyanlar doğru yoldan sapındıqlarına görə bəzi təmiz (ürəyəyatan) qida .(məhsullarını yeməyə qadağa qoymuşlar(۱

## HÖKMLƏR

.İslamda insanın qidalanması ilə bağlı bir neçə başlıca hökm mövcuddur

.(Qida pak olmalıdır (yəni murdar olmamalıdır .۱

.(Qida təmiz olmalıdır (yəni iyrənc, ikrah doğuran olmamalıdır .۲

.(Yemək halal olmalıdır (yəni haram olmamalıdır .۳

:İki növ qida haramdır .۴

Birinci: Quranda və ya əhli-beytdən (ə) gələn rəvayətlərdə haram olduğu bildirilən qida .(.məhsulları (qan və s

İkinci: Şəriətdə göstərilən yollarla əldə olunmayan qida məhsulları (sahibi olmadığımız .(və ya istifadə iznimiz olmadığı qida məhsulları

## ELMİ SİRLƏR

Murdar ərzaq məhsullarının haram edilməsinin səbəbləri haqqında ətraflı söhbət .(.açacağıq (qan, leş və s

səh:۱۸۲

---

Budizim qəti olaraq öz tərəfdarlarına ət yeməyi qadağan etmişdir. Hindlilər [۳۹۳] -۱ (hindu) inəyi müqəddəs hesab etdiklərindən onun ətini yemirlər. Digər məzhəblər də mövcuddur ki, öz tərəfdarlarına ümumilikdə heyvan ətini və heyvandan alınan digər məmulatların (yumurta, süd, pendir və s.) yeyilməsini ildə ۴۰ və ya ۹۰ gün qadağan edir .((Doktor Əbd əl-Həmid, “Quranda təbabət”, səh. ۱۶۳

:Digər qadağalar haqqında elm adamlarının söyləmlərinə nəzər salaq

Quran bir tərəfdən insanı ziyanlı və iyrənc ərzaq məhsullarını yeməkdən çəkindirir, digər tərəfdən isə pak və faydalı qidalarla qidalanmağı tövsiyə edir. İslam insanın psixi dincliyini, ictimai saflığını da unutmur və “halal” prinsipinin önə çəkir. Çünki insan öz alın təri ilə, halal zəhməti ilə qidalanarkən xüsusi zövq alır və böyük xoşbəxtlik hissi .(keçirir(١

YEKUN

:Burada bir neçə məqama diqqət yetirmək zəruridir

Quranın təmiz və halal qida məhsulları haqqındakı tövsiyələri insanın cisim və . ١ .ruhunda gigiyenik iz buraxmışdır. Bu, Quranın bəşəriyyətə ən böyük xidmətidir

Təmiz və pak qida məhsullarına meyl insanın təbiətindən qaynaqlandığı üçün . ٢ İslamın bu növ hökmləri “bələdçilik” xarakteri daşıyır. Belə olan halda bunu elmi möcüzə hesab etmək olmaz. Əlbəttə, qida məhsullarının halal olması ilə bağlı bəzi .məsələlər var ki, ilahi bələdçilik olmadan insan ağılı onları mənimsəyə bilməz

Qida məhsullarının “təmiz” və ya “halal” olması ilə bağlı söylənilənlər məlum . ٣ hökmlərin səbəblərinin yalnız kiçik bir hissəsini aydınlaşdırır. Çox güman ki, bu .göstərişlərin arxasında digər səbəblər də dayanır



---

.Yenə orada [٣٩۴] -١

## QEYRİ–GİGİYENİK ƏRZAQ MƏHSULLARI .۲

### İŞARƏ

xəbis] dedikdə iyrənc, ikrah doğuran mənaları nəzərdə tutulur (yəni insan] "خبيث"
.(təbiətinə uymayan, qüsurlu, iyrənc şeylər

:Quranda oxuyuruq

O Peyğəmbər) onlara yaxşı işlər görməyi buyurar, pis işləri qadağan edər, təmiz)"
.((pak) ne'mətləri halal, murdar (napak) şeyləri haram edər"(۱)

Ayədə peyğəmbərlərin missiyalarından biri haqqında söhbət açılır və bildirilir ki, onlar pak, təmiz şeyləri halal, qüsurlu, iyrənc şeyləri isə haram etmək (haram olduğunu çatdırmaq) üçün göndərilmişlər. Pak, təmiz şeylərin halal, iyrənc şeylərin haram .edilməsi bütün ilahi dinlərdə mövcud olan fitri məsələlərdəndir

### QISA TARİX

İnsanda təbii olaraq bəzi qida məhsullarına qarşı nifrət var. İslam fitrət dini olduğundan bu növ qida məhsullarını haram etmişdir. İslamdan öncəki ilahi dinlərdə .də qan, leş və donuzun yeyilməsinə qadağa qoyulmuşdur

### HÖKMLƏR

Məlum ayəyə və Əhli-beytdən (ə) gələn hədislərə əsasən bəzi iyrənc (ürəyə yatmayan, qüsurlu) qida məhsulları haram olunmuşdur. Bu qəbildən olan haramlara .diqqət yetirək



---

.Əraf, ۱۵۷[۳۹۵] -۱

İyrənc qida məhsullarını (hansı ki, insan təbiəti onlara qarşı nifrət hissi bəsləyir, .١
.onlardan iyrənir - iylənmiş meyvə və s.) yemək haramdır

.Murdar şeyləri yemək haramdır .٢

.Burun suyunu (selikini) udmaq haramdır .٣

.Sinə bəlğəmini (tənəffüs yollarının ifraz etdiyi patoloji sekret) udmaq haramdır .۴

.Torpaq yemək (bir-iki istisna ilə) haramdır .۵

.Ölümlə nəticələnən şeyləri yemək haramdır .۶

.İnsana ümumilikdə ziyanı olan şeylərin yeyilməsi haramdır .٧

.İnsan ifrazatı ilə qidalanan heyvanın ət və südünü yemək haramdır .٨

Əti halal heyvanların bəzi hissələri (qan, ifrazat, erkək və dişi cinsi orqanları, sperma, .٩
.(.sidik kisəsi və s

Qan, leş, donuz əti və spirtli içki haramdır. Bunlar haqqında Quranda xüsusi .١٠-١٣
.ayələr mövcuddur

## ELMİ SİRLƏR

:Elm adamlarından biri yazır

xəbis] o şeylərə deyilir ki, insanlar ondan iyrənir (xoşagəlməz, iylənmiş, xarab] خبيث“
.(olmuş şeylər

Qidanın xarab olması, kiflənməsi və iylənməsinə səbəb onun üzərinə qonan mikrob və zəhərli göbələklərdir. Məlumdur ki, bu növ qida məhsullarında müxtəlif xəstəliklər mövcuddur. Qida insan orqanizmində canlı hüceyrəyə çevrilir. Çirkin, iylənmiş qidalar funksiyasını itirmiş hüceyrələrə çevrilir. Hüceyrələr az ömürlüdür. Bəzən yeddi gündən .(qırx günədək, bəzənsə yeddi ilə qədər orqanizmdə qala bilirlər”(١

YEKUN

Qeyri-gigiyenik ərzaq məhsullarının istifadəsinə qadağa qoyulması ilahi dinlərin . ١ bəşəriyyətə xidmətlərindəndir. Çünki hələ mikroblar kəşf olunmadığı, natəmiz qida məhsullarının törədə biləcəyi xəstəliklər aşkarlanmadığı bir dönəmdə bu növ qidalanmaya qadağa qoyulmuşdur. Bu həm də insanların sağlamlığına çox böyük .xidmətdir

Bu qadağalar Qurana məxsus deyil. Öncə də qeyd etdiyimiz kimi keçmiş dinlərdə də .٢ .bu qadağalara rast gəlirik

İnsanın iylənmiş, kiflənmiş və s. qida məhsullarına nifrəti təbii və daxili bir prosesdir. .٣ Elə buna görə də Quranın məlum hökmləri “bələdçilik” xarakteri daşıyır (“irşadi” .hökmdür) və ilahi dinlərin, yaxud da Quranın elmi möcüzəsi hesab olunmur

Bu növ qida məhsullarının gigiyenik ziyanları olduğu üçün haram olunması doğrudur. .۴ .Lakin bu, heç də tam səbəb deyil. Digər səbəblərin də mövcudluğu istisna olunmur

**QİDALANMADA İSRAFA QADAĞA QOYULMASI.٣**

**İŞARƏ**

İsraf hər bir şeyin həddini aşmasıdır. Qidalanmada isə israfdan məqsəd həddən artıq çox yemək, ifrata varmaqdır. Bu növ israf Quranda məzəmmət olunmuşdur :(pislənmişdir). Allah Quranda buyurur

(Yeyin-için, lakin israf etməyin, çünki (Allah) isral edənləri sevməz!"(١)"

İsraf çox geniş anlayışdır. Belə ki, hər növ ifratçılığı (kəmiyyətdə, keyfiyyətdə), vaxt itirməni və s. əhatə edir. Bu, Quranın özünəməxsus üslubudur. İlahi nemətlərdən istifadəyə səsləyərkən sui-istifadələrin qarşısını almaq üçün dərhal mötədilliyini tövsiyə edir(٢).

Bəzi təfsirçilər burada dörd termin haqqında söhbət açmışlar.

١. "Təqtir" (yaşam üçün zəruri şeylərdən istifadəyə etinasızlıq göstərmək. Bu Allahın qəzəbinə səbəb olan xüsusiyyətdir).

٢. "Təbzir" (öz malını ağıla müvafiq olmayan, şəriətə zidd məqsədlər uğrunda xərcləmək. Bu, haramdır).

٣. "İqtisad" və ya etidal (öz malını ağıla müvafiq və şəriətə uyğun məqsədlərə mötədil şəkildə xərcləmək. Bu, tərifəlayiqdir).

۴. "İsraf" (istifadədə ifratçılığa yol vermək). Quran ayələri israfçılığı məzəmmət etmişdir. "(Allah) israf edənləri sevməz!" ayəsi də bu qəbildəndir. Allahın sevgisinin yoxluğu Onun qəzəbi deməkdir(٣).

İnsan orqanizminin qida maddələrinə (kalori, zülallar (protein), yağlar (lipid), karbohidratlar, vitaminlər, mineral maddələri və s.) tələbatı (təbii ehtiyacı) yaşa, cinsə və fəaliyyət növünə (işinin xarekterinə) görə fərqlənir. İnsanın qidalanmada mötədilliyi aşması orqanizmin sağlamlığı üçün təhlükəlidir (yəni az və ya çox yemək hər ikisi ziyanlıdır)(۴).



---

١- [٣٩٧] Əraf, ٣١.

٢- [٣٩٨] "Təfsiri-nümunə", c. ۶, səh. ١۴٧.

٣- [٣٩٩] "Ətyəb əl-bəyan", c. ۵, səh. ٣٠۶.

۴- [۴٠٠] "İslam, dərmansız həkim", səh. ٣٠٧.

İsrafın müxtəlif nümunələri mövcuddur(۱).

Qeydlər:

۱. İsraf fərdlərə, zamana görə fərqlənir və müxtəlif şəkillərə düşür. Bəzən eyni anlayış müəyyən şəraitdə bir nəfər üçün israf hesab olunur, digəri üçün isə israf hesab olunmur.

۲. İsrafın mənfiliyini hamı fitri və əqli olaraq başa düşür. Deməli, şəriətin israfla bağlı hökmləri “bələdçilik” xarakteri daşıya bilər.

## HÖKMLƏR

۱. Yol gedərkən yemək məkruhdur.

۲. Çox yemək məkruhdur.

۳. Çox su içmək məkruhdur.

۴. Üç növ israf daim haramdır:

Birinci: Malı korlayıb yararsız hala salmaq.

İkinci: Maldan bədənə zərər vuracaq məqsədlər üçün istifadə etmək.

Üçüncü: Maldan şəriətdə qadağa qoyulan məqsədlər üçün istifadə etmək.

səh:۱۸۸

---

۱- [۴۰۱] Bəzi həkimlər (qidalanmada) israfın aşağıdakı nümunələrini qeyd etmişlər.۱.Həddən artıq yemək və ya içmək. ۲.Qidanı tam çeynəmədən udmaq. ۳.Bir növ yeməkdən çox yemək. ۴.Nəfsin bütün istəklərini həyata keçirmək. ۵.Halal qida məhsullarını aşıb haramlarla qidalanmaq (“Quranda təbabət”, səh. ۱۳۷).

Mötədillik hər bir işdə müsbətdir. Qidalanmada mötədillik isə xüsusi əhəmiyyətə malikdir. Quran ümumi şəkildə qidalanmada israfa qadağa qoyur. Müasir profilaktikada buna böyük dəyər verilir. Qida, insan orqanizminin təlabatını təmin edir. Hansı ki, insanın sağlamlığı onun nəticəsində gerçəkləşir. Lakin həmin qidadan istifadədə israfa yol verilərsə, orqanizmin sağlamlığı təhlükəyə düşər və müxtəlif .xəstəliklər əmələ gələr

.Bəziləri qidalanmada israfın acı nəticələrini aşağıdakı şəkildə sıralamışlar

.Həzm sisteminin pozulması və mədənin genişlənməsi .۱

Mədənin həddindən artıq böyüməsi (genəlməsi – bu, çox təhlükəli xəstəlikdir. Əgər .۲ .(vaxtında müalicə olunmazsa ölümlə nəticələnə bilər

.(Qastrit (mədənin selikli qişasının iltihabı .۳

.Ürək göynəməsilə müşayiət olunur .۴

Çox yemək xəstəlik törədici mikrob və virusların qida maddələri vasitəsi ilə mədə- .۵ bağırsaq yolunda bağırsaq divarından qana və limfaya (eləcə də digər hissələrə) sorulması nəticəsində vəba, qarın yatalağı və s. xəstəliklər törəyir. Çünki qidanın çoxluğu nəticəsində qəbul edilən (mədəyə yığılan) qida turş mədə şirəsi ilə qarışıb, şirəni özünə hopdura bilmədiyi üçün həzm prosesi düzgün getmir (adətən qidanın .(tərkibindəki virus və mikroblar mədə şirəsi vasitəsi ilə məhv edilir

.Mədənin zədələnməsi ehtimalı böyükdür .۶

Piylənmə ilə orqanizmdə artıq piy toxumasının yığılması müşayiət olunur . ۷ .((piylənmədə irsi amillərin də rolu böyükdür

.Dişin çürüməsi. Qənnadi məmulatlarından həddən artıq istifadə olunduqda baş verir .۸

.(Ateroskleroz (ürək-damar sistemində bərkimə xəstəliyi .۹

Podaqra (oynaq və toxuma xəstəliyi). Uzun müddət bir növ qida məhsullarından .۱۰ .(ətdən) istifadə nəticəsində yaranır

.(Nefrolitiaz (böyrəkdaşı və ya sidikdaşı xəstəliyi .۱۱

Həddən artıq çox yemək psixi pozuntularla da müşayiət olunur. Misal üçün iradənin .۱۲ zəifləməsi, yatağanlıq, son dərəcə tənbəllik, cinsi tələbatın insanı heyvana çevirməsi .və s

Ehtiras və tamahdan doğan çoxyemə məhrumiyyətdən qaynaqlanır. Bəzən sonsuz .۱۳ həzz almaq və ya digərlərini təqlid etmək hissindən də doğur. Qadınlarda isə bir çox hallarda instinktiv olaraq hamiləlik dövründə (ağız dadının azması - yerikləmək .(nəticəsində) baş verir(۱

:İfrat dərəcədə ət yemək aşağıdakı xəstəlikləri törədir .۱۴

Şəkər diabeti, apendisit, bağırsaq vərəmi, xərçəng, apopleksiya (beyinə qan sızması nəticəsində iflic), ateroskleroz (ürək-damar sistemində bərkimə xəstəliyi), qanın tərkibində xolesterinin çoxalması və nəticədə vaxtsız qocalma, podaqra (oynaq və .(toxuma xəstəliyi)(۲

:Bəzi təfsirçilər yazırlar

Fikrimizcə ayədə çox mühüm gigiyenik məsələyə toxunulmuşdur (“Yeyin-için, lakin“ israf etməyin”). Bu, ilk baxışdan sadə görünsə də bu gün artıq mühüm bir gigiyenik tədbir olduğu sübuta yetirilmişdir. Artıq, alimlərin tədqiqatları göstərir ki, bir çox xəstəliklər



---

.Quranda təbabət”, səh. ۱۳۷-۱۴۰“ [۴۰۲] -۱

Hökmlərin fəlsəfəsi”, səh. ۳۱۷“ [۴۰۳] -۲

.(orqanizmdə tam sorula bilməyən qida maddələrindən törəyir”(۱

Doktor Seyid əl-Cəmili Əraf surəsinin ۳۱-ci ayəsini qeyd edərək Quranın xərçəng :xəstəliyinin (konserin) müalicəsini və ya profilaktikasını verdiyini iddia edir. O, yazır

Gün ərzində ۳۵ və daha çox siqaret çəkmək ağ ciyər xərçəngi törədir. Halbuki Quran“ .(israfa qadağa qoymuşdur”(۲

Doktor Sadiq Əbd ər-Rza Əli də məlum ayəni izah edərkən qidalanmada israfdan .(yaranan xəstəliklər haqqında söhbət açmışdır(۳

Əbd ər-Rəzzaq Nofel məlum ayəni şərh edərkən bütün tibb elminin bu ayədə xülasə .(olduğunu bildirir(۴

YEKUN

Qidalanmada ümumi bir qanun göstərmək Quranın elmi məsələlərindən biridir və .۱ insanın sağlamlığında mühüm rola malikdir. Bu, eyni zamanda Quranın möcüzələrindən də hesab oluna bilər. Çünki Quran bu məsələni elə bir dönəmdə, elə bir şəraitdə açıqlamışdır ki, hamı acı nəticələrindən xəbərsiz halda çox yeməyə meyilli idi. Lakin tibb elmi inkişaf etdikcə bu hökmlərdə yatan elmi sirlərin üstü açılmağa .başladı

Qeyd olunan gigiyenik ziyanlar sözügedən hökmün tam səbəbi deyil. Hələ bizə bəlli .۲ .olmayan digər səbəblər də ola bilər



---

.Təfsiri-nümunə”, c. ۶, səh. ۱۵۲“ [۴۰۴] -۱

.Quranda tibbi ecazkarlıq”, səh. ۱۴۶“[۴۰۵] -۲

.Quran və yeni tibb”, səh. ۱۱۰-۱۱۵“ [۴۰۶] -۳

.Yenə orada[۴۰۷] -۴

Qeyd olunan bir çox xəstəliklərin (nefrolitiaz və.) tam səbəbi çox yemək deyil. Çox .۳ yemək sözügedən xəstəlikləri törədən amillərdən yalnız biridir. Bütün bu xəstəliklərin qidalanmada israfla əlaqələndirilməsi mübaliğədir.

### LEŞ ƏTİNİN (YEYİLMƏSİNİN) QADAĞAN OLUNMASI .۴

#### İŞARƏ

Leş insan və ya heyvan ölüsünə (cəsədinə) deyilir. Şəriətdə isə özü ölmüş, yaxud da şəri qaydalarla kəsilməyən heyvana deyilir.

إِنَّمَا حَرَّمَ عَلَيْكُمُ الْمَيْتَةَ

“O (Allah) sizə ölmüş heyvanı haram etmişdir”(۱).

Yuxarıdakı ayə dörd surədə təkrarlanmışdır. Bu bənzərsiz təkrarlanmanı müxtəlif səbəblərlə əlaqələndirmişlər:

۱. Mövzunun əhəmiyyəti (orqanizm üçün təhlükəsi).

۲. O dövrün insanlarının bu məsələyə aludə olmaları(۲).

#### QISA TARİX

Leşin iyrənc olduğu hələ İslamdan öncə Tövratda təsdiqlənmişdir.

Zərdüşt dinində də bu haqda qəti hökmlər mövcuddur.

#### HÖKMLƏR

İslam dinində leş haqqında bir neçə ayrıca hökm mövcuddur.



---

۱- [۴۰۸] Bəqərə, ۱۷۳; Maidə, ۳; Ənam, ۱۴۵; Nəhl, ۱۱۵.

Birinci: Leş yeyilməsi qadağan olunmuş qida məhsulları sırasındadır. Leş ətini yemək .haramdır və günah hesab olunur

.İkinci: Atıcı qanı olan heyvanın ölüsü (leşi) murdardır

Üçüncü: Müsəlmanın cəsədini dəfn etmək vacibdir. Hər bir müsəlmana onu iyi yayılmayacaq, heyvanların eşə bilməyəcəyi şəkildə dəfn etmək vacibdir. Əlbəttə, kafirlərin və ya iylənmiş hevanların ölüsünün basdırılması da zəruridir. Çünki ətraf .mühitin çirklənməsinə, xəstəliklərin törəməsinə gətirib çıxarır

Dördüncü: “Məss-meyyit” qüslü ölüyə (insan cəsədinə) əl vuranlara (müəyyən .şərtlərlə) vacibdir

.Beşinci: Müsəlman qəbrinin açılması (hətta uşaq, yaxud dəli belə olsa) haramdır

**ELMİ SİRLƏR**

Əhli-beytdən (ə) gələn bəzi rəvayətlərdə məlum ayədə mövcud olan sirlərə toxunulmuşdur. Bir çox təfsirçi və tibb mütəxəssisləri də ayə ilə bağlı elmi məqamları .qeyd etmişlər

Hədislər .١

İmam Sadiq (ə) bütün bu məsələlərin (hökmlərin) insanların xeyrinə olduğunu :vurğulayaraq buyurur

Leş yeyənin bədəni zəifləyir, gücü azalır, nəsli kəsilir. Bunu davam etdirən şəxs qəfil“ .(ölümlə (infarkt və s.) dünyadan köçür”(١)

:İmam Rza (ə) buyurur

Leş yemək bədəndə pis iy əmələ gətirir. Tündməcazlığa, əsəbiliyə, qəlbin“ daşlaşmasına və ülfətin

azalmasına səbəb olur. Leş yeyən şəxsin öz övladını, atasını, dostunu öldürməyəcəyini .(söyləmək çətindir”(١

:İmam Sadiqdən (ə) nəql olunan digər rəvayətdə oxuyuruq

.(Leşdən qan xaric olmur, qatılaşaraq (daxildə) qalır. Buna görə də leş əti ağırdır”(٢“

Qeyd: Rəvayətlərdə leş yeməyin orqanizm üçün törətdiyi fəsadlardan başqa mənəvi .zərərləri də açıqlanmışdır. Müasir tibdə də bu məsələlərə diqqət yetirilir

:Təfsiri-nümunə”də oxuyuruq“ .٢

Həzm sistemi leşi yararlı qana çevirə bilmir. Bundan başqa leş mikrob yığınıdır. Buna“ görə də İslam leş yeməyi haram etməklə yanaşı, onun murdar olduğunu da .(bildirmişdir ki, müsəlmanlar tam uzaqlaşsınlar”(٣

:Bəzi həkimlər yazırlar

Qan, tərkibinə nəzərən (ölümdən öncə bədənin ən yaxşı müdafiəçisi olmasına“ baxmayaraq) ölümdən sonra mikrobların inkişafı üçün əlverişli məkana çevrilir. Leşin qanı, öldükdən ١ saat sonra bədəninə hopur. ٣-۴ saatdan sonra əzələlər sıxılır və (fosfor, fermium və s.) turşularının mövcudluğu nəticəsində quruyur. Sonra orqanizm qələviləşir, quruluqdan çıxır və mikroblar fəaliyyətə başlayır. Nəticədə bədən parçalanır və iylənir. Qanın daxildə qalması mikrobların çoxalmasını sürətləndirir. Lakin heyvan şəriətdə göstərilən qaydada kəsildikdə (vena və arteriyanın kəsilməsi ilə) qan .”bədəndən tam çıxır. Kəsilən heyvanın çapalaması qanın tam çıxışına kömək edir



---

.Bihar əl-ənvar”, c. ۶۵, səh. ١۶۵“ [۴١١] -١

.Yenə orada , səh. ١۶٢[۴١٢] -٢

.Təfsiri-nümunə”, c.١, səh. ۵٨۵“ [۴١٣] -٣

:Elm adamlarından biri yazır

Leş hansı heyvana aid olmasına baxmayaraq, onda olan üzvi maddələr tez sıradan“ çıxır və iylənir. Hava nə qədər isti olsa, onun təsirli iyi və vəba vibrionları o qədər tez yayılır. Bədəndə olan mikroblar orqanizmin fəaliyyəti və mövcud antibakteriyaları (leykosit - ağ qan cisimciyi – kürəciyi) təsiri nəticəsində məhv edilir. Ölümdən sonra isə mikrobların fəaliyyəti başlayır və bütün bədəni əhatə edir. Buna görə də cəsəd .(murdardır və ona toxunduqda mütləq, qüsl verilməlidir”(۱

YEKUN

İlahi dinlərin bəşər mədəniyyətinə xidmətlərindən biri leş (ölü heyvanın) ətinin . ۱ yeyilməsi ilə mübarizə, meyidin dəfn olunması və ətraf mühitin çirklənməsinin qarşısı alınmasıdır. Bu, İslam dinində ağıla müvafiq şəkildə və mötədillik çərçivəsində .verilmişdir

Leşin (heyvan ölüsünün) yeyilməsini qadağan edən ayələr Quranın elmi möcüzəsi . ۲ deyil. Çünki hələ Qurandan öncə səmavi kitablar bu hökmə toxunmuşlar. Lakin bu məsələ (leşin yeyilməsinin gigiyenik fəsadlarının bəlli olmadığı bir dönəmdə qadağan .olunması) ilahi peyğəmbərlərin haqq olduğunu göstərən bir möcüzə hesab oluna bilər

Quranda sözügedən hökmlərin səbəbi açıqlanmadığından gigiyenik fəsadları . ۳ yeganə səbəb olaraq göstərmək olmaz. Bu yalnız hökmün ardında duran səbəblər silsiləsinin kiçik bir hissəsidir. Çox güman ki, leşin yeyilməsinin haram olması, murdarlığı, “məssi-meyyit” qüslu və ölünün dəfn olunması zərurətinin digər



---

.Hökmlərin fəlsəfəsi”, səh. ۱۵۱-۱۵۳“[۴۱۴]-۱

sirli səbəbləri də mövcuddur. Hansı ki, elm inkişaf etdikcə bu sirlərin də üstə açılacaq. .Buna misal olaraq, leşin yeyilməsinin psixi və mənəvi ziyanlarını göstərmək olar

Müsəlman cəsədinin dəfn olunmasında müsəlmana göstərilən hörmət də xüsusi qeyd .olunmalıdır. Bu məlum hökmlərin səbəblərinin yalnız gigiyenik olmadığını göstərir

Leş vəba vibrionları törətmir. O, xəstəlik törədici bakteriyaları, o cümlədən vəba .۴ .vibrionlarını inkişaf etdirir

## DONUZ ƏTİNİN (YEYİLMƏSİNİN) QADAĞAN OLUNMASI .۵

### İŞARƏ

Donuz, cütdırnaqlılar dəstəsindən gövşəməyən məməli heyvan fəsiləsidir. Ət və südündən məişətdə istifadə olunur. İslama görə qadağan olunmuş heyvanlar :sırasındadır. Allah Quranda buyurur

إِنَّمَا حَرَّمَ عَلَيْكُمُ الْمَيْتَةَ وَالدَّمَ وَلَحْمَ الْخِنزِيرِ

O (Allah) sizə ölmüş heyvanı, (axar) qanı, donuz ətini ...(yeməyi) qəti haram“ .(etmişdir”(۱

Qan və leş haqqında olduğu kimi burada da eyni məzmunlu ayə dörd dəfə təkrar .(olunmuşdur (İki dəfə Məkkədə, iki dəfə Mədinədə

Quranın bu məsələ haqqında xüsusi təkidlə çıxış etməsi nə qədər əhəmiyyət daşıdığını göstərir. Donuz ətinin orqanizmə və ruha vurduğu bənzərsiz ziyanlara baxmayaraq, .bir çox dünya ölkələrində hələ də rəsmi qida məhsulu kimi istifadə olunur

səh:۱۹۶

---

.Bəqərə, ۱۷۳; Maidə, ۳; Ənam, ۱۴۵; Nəhl, ۱۱۵[۴۱۵] -۱

## QISA TARİX

Donuz ətindən qida məhsulu kimi istifadə olunması neçə min il tarixə malikdir. Onun həzrət Musa (ə) şəriətində haram olunması dövrün yəhudiləri tərəfindən adi ərzaq məhsulu kimi istifadə olunduğundan xəbər verir. İncildə isə günahkarlar donuza bənzədilir və nəql olunan hadisələrdə donuz şeytan simvolu kimi verilir. İlahi dinlərin bu qədər təkid etməsinə (və bu növ qida məhsulunun törədə biləcəyi fəsadların aşkar .olduğuna) baxmayaraq, hələ də bir çox ölkələrdə geniş yayılmışdır

## HÖKMLƏR

:İslam şəriətində donuz haqqında bir neçə hökm mövcuddur

.Birinci: Donuz əti yemək haram və günahdır

.İkinci: Donuz südü içmək haramdır

.(Üçüncü: Quruda yaşayan donuz heç bir şəraitdə pak olmayacaq murdardır (napak

Dördüncü: Əgər donuz, qabdan maye halında olan bir şey içsə və ya qabı yalasa, .(həmin qab yeddi dəfə suya çəkilməlidir (yuyulmalıdır

.(Beşinici: Donuz alqı-satqısı icazəli deyil (tam murdar olduğu üçün

## ELMİ SİRLƏR

.Donuz ətinin haram və murdar olması haqqında iki baxımdan danışmaq olar

:Birinci: Psixi, mənəvi və əxlaqi təsirləri. Bəzi təfsirçilər yazırlar

Donuz, hətta Avropada belə qeyrətsizlik simvolu və çirkin heyvandır. O, cinsi“ münasibətlərə laqeyiddir. Donuz ətinin bu laqeyidliyi onu yeyən insana da təsir .(qoyur”(١

.İkinci: Gigiyenik səbəblər

:Donuz ətinin törətdiyi xəstəliklər iki yerə bölünür

;a) Törədici səbəblərindən biri donuz əti olan xəstəliklər

.(Dizenteriya (qanlı ishal)(٢ .١

.(Tarenximatoz sarılıq(٣ .٢

.(Amyöblü dizenteriya (Amyöbiaz)(۴ .٣

Ergpeloid .۴

Donuz ətinin tərkibində yağlılıq və sidik turşusu çox olduğundan bir çox xəstəliklərə .۵ yoluxmada mühüm rol oynayır. Belə xəstəliklərdən ateroskleroz (ürək-damar .sistemində bərkimə xəstəliyi), oynaq ağrıları, zəhərlənmə və s.-nin adını çəkmək olar

Donuz natəmiz və çirkli şeyləri, hətta öz nəcisini belə yeməkdən çəkinmir. Elə buna .۶ görə də onun mədəsi müxtəlif xəstəlik törədici mikrobların yuvasına çevrilir, oradan da .onun ətinə, qanına və südünə keçir

.b) Yalnız donuz ətinin törətdiyi xəstəliklər

Soliterlər (lentşəkilli qurdlar dəstəsi). Taenia solium növü insanın mədə- . ١ bağırsağında parazitlik edir. Uzunluğu



---

.Təfsiri-nümunə”, c. ١, səh. ۵٨۶“ [۴١۶] -١

Əsasən yoğun bağırsağın zədələnməsi ilə müşayiət olunan, residiv verən, [ ۴١٧] -٢ .kəskin, yaxud xronik yoluxucu xəstəlik

İnfeksiya, yaxud qaraciyər hüceyrələrinin toksiki zədələnmələrindən [ ۴۱۸] -۳
(bilirubinin əmələ gəlməsi və bağırsağa ifraz olunması pozulur) baş verir.
.Tarenximatoz sarılıq çox zaman Botik xəstəliyində müşayiət olunur

İnsanın yoğun bağırsağı və s. daxili orqanlarında dizenteriya amyöbünün [ ۴۱۹] -۴
.törətdiyi xəstəlik

m, bəzən ۸ m-ə çatır. İnsanlar yaxşı bişirilməmiş və ya qızardılmamış donuz əti ۲-۳ .(yedikdə yoluxurlar(۱

Trixin (trixinella) Trichinellidae fəsiləsindən parazit, həlqəvi qurd. Uzunluğu ۳-۵ mm- .۲ dir. Bişirilməmiş və ya yaxşı bişirilməmiş donuz əti yedikdə insan bədəninə daxil olur. Trixin qurdu insanda trixinellyoz (nematodozlar qrupuna daxildir) xəstəliyi törədir. ۱۰-۲۵ gündən sonra tempraturla keçən titrəmə, göz qapaqlarında və üzdə ödem, əzələlərdə ağrı, dəridə səpki, bağırsaq pozğunluğu və başağrısı olur. Bəzən xəstəlik .ağır keçir və ölümlə nəticələnir

Trixin qurdu mədəyə daxil olduqdan sonra heç bir antibakteriya onu məhv etməyə qadir deyil. Bir ayda ۱۵ min bala çıxarır. ۱ kq donuz ətində ۴۰۰ min trixin toxumu ola bilər. Sözügedən qurdlar hətta ət ən yüksək tempraturda bişirildikdə belə məhv .(olmurlar(۲

Donuz əti ağır həzm edilir və nəticədə mədə zədələnir. Donuz əti mədədə . ۳ .(özünəməxsus zəhərlənmə əmələ gətirir(۳

YEKUN

.Burada bir neçə məqama diqqət yetirmək zəruridir

İlahi dinlərin insanlara töhfələrindən biri də psixi və cismani xəstəliklərə qarşı . ۱ profilaktik tədbirlərdir. Donuz ətinin haram və murdar edilməsi ilahi dinlərin möcüzələrindən biridir. Çünki bu hökm verildiyi zaman



---

Cırtdan soliter (Hymenolepsnana) növü və exinokkok (Echinococcus [ ۴۲۰] -۱ granulosus) da insan üçün qorxulu parazit sayılır. Soliterin bütün növləri insanı (və .heyvanı) həddindən artıq arıqladır; bəzən ölümlə də nəticələnə bilir

.Quranda təbabət", səh. ۱۴۶-۱۴۷" [۴۲۱]-۲

.İslam, dərmansız həkim", səh. ۵۲-۵۳" [۴۲۲]-۳

.hələ bəşər donuz ətinin gigiyenik fəsadlarından xəbərsiz idi

Donuz ətinin haram olması Qurana məxsus elmi ecazkarlıq nümunəsi deyil. Bu, .٢ Qurandan öncə digər səmavi kitablarda da mövcud olduğu üçün ilahi peyğəmbərlərin .möcüzələrindən hesab olunur

Öncə də qeyd olunduğu kimi donuz ətinin haram olmasının səbəbləri qeyd olunan .٣ gigiyenik səbəblərlə bitmir. Quranda bu hökmün səbəbi açıqlanmadığı üçün konkret .olaraq bu və ya digər səbəbin üzərində dayanmaq doğru deyil

Donuz ətinin haram olmasının səbəbi kimi göstərilən gigiyenik fəsadlara irad oluna .۴ bilər. Çünki bir çox hallarda (donuz əti müxtəlif sanitar üsullarla qaynadıldıqda və s.) sözügedən xəstəlik törədici bakteriyalar məhv edilir və bu zaman məlum hökm üçün bir səbəb qalmır. Lakin trixinlərin heç bir şəraitdə məhv olunmadığı isbat olunarsa, .artıq bu irada da yer qalmaz

Donuz ətinin insana psixi təsirlər (qeyrətsizlik və s.) göstərməsi hələ elmi qaynaqlar .۵ tərəfindən təsdiqlənməmiş güclü ehtimaldır. (Çünki dəqiq təcrübi yollarla isbat .(olunmamışdır

Qeyd: Bütün bunlar göstərir ki, qeyd olunan əxlaqi və gigiyenik fəsadlar məlum .hökmün tam səbəbi deyil. Yeni elmi kəşflər hələ çox şeylər aşkara çıxaraq

**QANIN (YEYİLMƏSİNİN) HARAM OLMASI .۶**

**İŞARƏ**

:Allah-taala Quranda buyurur

إِنَّمَا حَرَّمَ عَلَيْكُمُ الْمَيْتَةَ وَالدَّمَ وَلَحْمَ الْخِنزِيرِ

O (Allah) sizə ölmüş heyvanı, (axar) qanı, donuz ətini ...(yeməyi) qəti haram“ .(etmişdir”(١)

Qanın yeyilməsinin haram olması Quranda dörd surədə müxtəlif ibarələrlə öz əksini tapmışdır. Üç surədə (Nəhl, Bəqərə və Maidə) tam oxşar ibarələrlə verilmişdir. Ənam :surəsində isə oxuyuruq

قُل لَّا أَجِدُ فِى مَا أُوْحِىَ إِلَىَّ مُحَرَّمًا عَلَى طَاعِمٍ يَطْعَمُهُ إِلَّا أَن يَكُونَ مَيْتَةً أَوْ دَمًا مَّسْفُوحًا أَوْ لَحْمَ خِنزِيرٍ فَإِنَّهُ رِجْسٌ

Ya Rəsulum!) De: Mənə gələn vəhylər içərisində murdar olduqları üçün ölü heyvan,) axar qan, donuz əti və ya Allahdan başqasının adı ilə (bismillah deyilmədən) günah olaraq kəsilmiş heyvanlar istisna olmaqla, hər hansı bir kəsin yediyi yeməklər .(içərisində haram buyurulan bir şey görmürəm”(٢)

axar qan) ifadəsi qeyd olunmuşdur. Bu, qanın kapillyarlarda qalan) ”دمامسحوفا“ Ayədə əvəzliyi üçüncü şəxsin təkinə məxsus ”ه“ ibarəsindəki ”فـانه رجس“ .hissəsini istisna edir olmasına baxmayaraq, hər üçünə (yəni yalnız donuza deyil, ölü heyvan və qana da) aid olur. Bir çox təfsirçilərə görə bu ayənin ilkin mənasına uyğundur. Belə ki, ayədən hər .üçünün natəmiz, insan təbiətinə zidd olduğu anlaşılır

Nəhl və Ən`am surələri Məkkədə, Bəqərə və Maidə surələri isə Mədinədə nazil olmuşdur. Qanın haram olduğunu bildirən ayələrin dəfələrlə təkrar olunması onun



---

١- [٤٢٣] Nəhl, ١١٥; Bəqərə, ١٧٣; Maidə, ٣.

٢- [٤٢٤] Ən`am, ١٤٥.

insan orqanizmi üçün təhlükəli olduğunu və cahillik dönəmində qanın yeyilməsinin .(geniş yayıldığını göstərir(١

## QISA TARİX

Qanın yeyilməsi dünya xalqları arasında çox qədim tarixə malikdir. Belə ki, bəzi antik qaynaqlarda ləzzətbəxş qida məhsulu kimi göstərilir. Qədimdə Şimali Amerikada qanla qidalanırmışar(٢). Cahillik dönəmində də insanlar qanla qidalanır və onu rəsmi qida .(məhsulu kimi qiymətləndirirdilər(٣

.Yəhudilikdə də qandan qida məhsulu kimi yararlanmaq haram edilmişdir

## HÖKMLƏR

.İslam şəriətində qanla bağlı bir neçə hökm mövcuddur

Birinci: Qan qadağan edilmiş qida məhsulları sırasındandır. Onu yemək (içmək) .haramdır və günah hesab olunur



---

Qan insanın, bütün onurğalı heyvanların və bəzi onurğasızların (məsələn, [ ٤٢٥] -١ həlqəvi qurdlar, nemertiklər) qapalı qan dövranı sistemində axan duru toxumadır. Qan duru hissədən – plazmadan və formalı elementlərdən – qan hüceyrələrindən ibarətdir. Formalı elementlər qanın ٤٠-٥٠٪-ni, plazma isə ٥٥-٦٠ ٪-ni təşkil edir. Plazmanın tərkibində zülallar (albumin, qlobulin, A١, A٢, B, Y, fibrinogen), onların lipidlərlə və karbohidratlarla kompleksləri, fermentlər, hormonlar, vitaminlər, mineral maddələr, maddələr mübadiləsinin aralıq və son məhsulları (sidik cövhəri, sidik turşusu, kreatin və kreatinin, purin əsasları və s.) olur. Qanın miqdarı insanlarda bədənin orta çəkisinin ١/١١ – ١/١٣ hissəsini (təqr. ٧٪), onurğalı heyvanlarda ٢-١٠٪, onurğasız heyvanlarda isə ٢٠-٦٠٪-ini təşkil edir. İnsanın ١ mm٣ qanında ٤,٥-٥,٥ miln. eritrosit (qırmızı qan cisimciyi) .olur

.İslam sivilizasiyası", səh. ١٨٥"[٤٢٦] -٢

.İkinci: İnsan və atıcı qanı olan hər bir heyvanın qanı murdardır

Üçüncü: Tam murdarların alqı-satqısı yalnız onlardan faydalı istifadə mümkün olduğu zaman icazəlidir. Qan tam murdardır; lakin buna baxmayaraq alqı-satqısı icazəlidir. Çünki ondan halal, faydalı və ağıla müvafiq istifadə (xəstələrə, yaralılara qan .köçürülməsi və s.) mümkündür

## ELMİ SİRLƏR

Qanın haram və murdar olması haqqında tibb elmləri mütəxəssisləri tərəfindən müxtəlif ehtimallar irəli sürülmüşdür. Mövzu ilə bağlı çoxsaylı rəvayətlər də nəql .olunmuşdur

.Rəvayətlər .١

Bir kişi İmam Sadiqdən (ə) soruşdu: Nə üçün Allah-taala qanı yeməyi haram etmişdir? İmam (ə) buyurdu: "Çünki qan yemək qəlbi daşlaşdırır, sevgini, mərhəməti aradan .(aparır. Qan yemək bədəndə pis iy yaradır, rəngini dəyişir"(١

Digər rəvayətdə oxuyuruq: "Qan yeyənlər öz valideynlərini, övladlarını öldürə biləcək .(dərəcədə daşürəkli olurlar"(٢

:Doktor Əbd əl-Həmid və başqaları yazırlar .٢

Qan insan üçün faydalı qida məhsulu deyil. Çünki plazma tərkibindəki zülallar" (albumin, qlobulin, fibrinogen) olduqca azdır (təqr. ۶-٨ mq). Qanın tərkibi gec həzm olur .və ya bağırsağa böyük çətinliklə sovrulur

Qanın əsas vəzifələrindən biri maddələr mübadiləsinin lazımsız (aralıq və son) məhsullarını (sidik cövhəri, sidik



---

.Bihar əl-ənvar", c. ۶۵, səh. ١۶٢" [۴٢٨] -١
.Vəsail əş-şiə", c. ١۶, səh. ٣١٠" [۴٢٩] -٢

turşusu, kreatin və kreatinin, purin əsasları və s.) toxumalardan çıxarmaqdır. Qan yedikdə həmin lazımsız maddələr insan orqanizminə daxil olur. Qan mikrobların inkişafı üçün əlverişli vasitədir. Mikroblar kəsici alətlər, əllər, hava, milçək və qan tökülən qab vasitəsilə yayılır. Xüsusilə xəstəliyə yoluxmuş heyvanın qanı daha .(təhlükəlidir (yoluxucu xəstəliklər xüsusi qeyd olunmalıdır

Qan yedikdə zülalların (protein) parçalanması nəticəsində sidik cövhərinin miqdarı .artır və insanın komaya düşməsi ehtimalı çoxalır

Bəzilərinin fikrincə qan, tərkibində dəmir olduğu üçün yeyilməsi faydalıdır. Lakin bu yanlış fikirdir. Çünki qanın tərkibində olan dəmir üzvi dəmirdir və qeyri-üzvi dəmirə .nisbətdə çox böyük çətinliklə həzm olunur

Şəriətə görə halal heyvanların qaraciyər və dalağını yemək icazəlidir(۱). Çünki insan orqanizminə lazımi dəmir ötürə bilər. Tibbi baxımdan da bu iki hissənin yeyilməsi maneəsizdir. Elmdə sübut olunmuşdur ki, bu iki üzv bir çox qida maddələri ehtiva .(etdiyindən olduqca faydalıdır (xüsusi qlikogen, protein və vitaminlər

.(Bütün bunlar tibb elmlərinin şəriət hökmlərini tam təsdiq etdiyini aşkara çıxarır"(۲

:Doktor Paknijad yazır .۳

Qan yeməyin cisimdən çox ruha ziyanı var. Çobanlar daim itlərinin quduzlaşması,"
.(şiddət göstərməsi üçün ona qan içirdirlər"(۳

:Bəzi təfsirçilər yazırlar

səh:۲۰۴

---

.Şiə fiqhində dalaq yemək haramdır. Müəllif əhli-sünnə fiqhinə əsaslanmışdır [۴۳۰] -۱
.Quranda təbabət", səh. ۱۴۴-۱۴۵"[۴۳۱] -۲
.İlk universitet, son peyğəmbər", c. ۸, səh. ۲۰۸"[۴۳۲] -۳

Bu gün artıq elm sübut etmişdir ki, qida məhsulları vəzilərə (endokrin, yaxud“ sekresiya vəzilərinə) təsir göstərir, nəticədə hormonlar (inkretlər) hasil olur və bu .(özünü insanın davranışında göstərir”(١)

YEKUN

.Burada bir neçə məqama diqqət yetirməyi zəruri hesab edirik

İlahi dinlərin vəhyə dayanaraq xəstəliklərin qaynağı olan bu hökmü verməsi fəxr .١ ediləsi bir faktdır. İlahi dinlərin qan yeməyi insanaməxsus qida məhsulları cərgəsindən .çıxarması peyğəmbərlərin bəşər sivilizasiyasına göstərdiyi ən böyük xidmətlərdəndir

.Qan yeməyin haram olması ilahi peyğəmbərlərin (ə) möcüzələri sırasındadır .٢

Qan yeməyin haram olmasının səbəbi kimi göstərilən gigiyenik fəsadlar həmin .٣ .səbəblərin yalnız bir hissəsidir

Qanla bağlı bir çox məsələlər qaranlıq olaraq qalır və gələcək tədqiqatlar üçün gözəl .۴ haram və murdar, orqanizmdə qalan (دماء مسحوفا) mövzudur. Misal üçün, axar qanın qanın isə pak olmasının səbəbləri, qan yeməyin psixi təsirləri (daşürəklilik və s.) aydın .deyil. Sırf ehtimal və ya çobanların itləri quduzlaşdırma metodu elmi əsas ola bilməz

### SPİRTLİ İÇKİLƏRİN QADAĞAN OLUNMASI .٧

#### İŞARƏ

xəmr] örtmək mənasını ifadə edir. Bir termin kimi isə] ”خمر“ ?xəmr] nədir] ”خمر“ .kefləndirici içkilərə deyilir

səh:٢٠۵

---

.Təfsiri-nümunə”, c.١ , səh. ٢“[۴٣٣] -١

Bu heç də təsadüfi deyil. Çünki spirtli içkilər insan ağlının üstünü örtür və yaxşını pisdən .ayırmağa imkan vermir

## QURANIN ALKOQOLİZMƏ QARŞI MƏRHƏLƏLİ MÜBARİZƏSİ

.Allah-taala Quranda şərab məsələsinə dörd mərhələdə toxunmuşdur

:Birinci mərhələdə buyurur

Siz xurma ağaclarının meyvəsindən və üzümlərdən şərab və gözəl ruzi (kişmiş,“ .(mövüc, bəhməz, quru xurma və s.) düzəldirsiniz”(١)

Bu mərhələdə üzüm və xurmadan halal və düzgün istifadədən söhbət açılır və faydalı .istifadə yolu göstərilir. Bu tərbiyə üslunun ilk mərhələsidir

:İkinci mərhələ

Səndən içki və qumar haqqında sual edənlərə söylə: Onlarda həm böyük günah, həm“ .(də insanlar üçün mənfəət (dünya mənfəəti) vardır”(٢)

.Bu mərhələdə bir neçə məsələyə diqqət yetirmək lazımdır

Birinci: Quran şərabın haram olduğunu bildirmək istəyərkən ötəri şəkildə onun günah .olduğunu önə çəkir

İkinci: Quranın tərbiyə üsulu çox maraqlıdır. Çünki iki çirkin əmələ qarşı mübarizəni .sərt şəkildə başlamır

:Üçüncü mərhələ

Ey iman gətirənlər! Sərxoş ikən nə dediyinizi anlamayana qədər və cunub (murdar)“ - olduğunuz zaman



---

.Nəhl, ۶٧[۴٣۴] -١

yol ötən müsafirlər müstəsnadır - qüsl edənədək namaza (və ya namaz qılınan yerə) .(yaxınlaşmayın”(١)

.Bu ayə haqqında təfsirçilər arasında bir neçə baxış mövcuddur

Ayədən məqsəd budur ki, müsəlmanlar şərab içdikdən sonra kefləşdikdə (sərxoş .١ :vəziyyətdə) namaza yaxın durmasınlar. Bunun iki faydası var

a) Allahla münacat etmək nə dediyini başa düşməkdən, dərk etməkdən asılıdır. Kefli .ikən Allahın qarşısında dayanmaq həm ədəbsizlik, həm də faydasızdır

b) Beş namazın vaxtlarının bir-birinə yaxın olması spirtli içki içməyə mane olurdu. Bu .(bir növ alkoqolizmlə mübarizə idi(٢

Bəzi şiə və əhli-sünnə təfsirçilərinə görə məlum ayə yuxu ilə bağlıdır. Yəni yuxulu .٢ .(ikən namaza yaxın durmayın. Bu bir çox rəvayətlərdə də öz əksini tapmışdır(٣

Digər təfsirçilər isə bu baxışı rədd edir və bildirirlər ki, ayədə məqsəd ümumiyyətlə tam oyaq olmaqdır. “Nə dediyinizi biləsiniz deyə” ifadəsindən aydın olur ki, insanın tam oyaq olmadan (istər yuxudan, istərsə də spirtli içkilərin təsirindən) namaz qılması .(doğru deyil(٤

səlat] sözündən məqsəd namaz qılınan məkan, yəni məsciddir. Buna] ”صلوه“ Ayədə .٣ ibarəsidir. Deməli, ayə kefli halda məscidə yaxın getməyi qadağan ”الاعابری سبیل“ dəlil .(edir(٥

:Dördüncü mərhələ

səh:٢٠٧

---

.Nisa, ۴٢[۴٣۶] -١

.Təfsiri-nümunə”, c. ٣, səh. ٣٩۵-٣٩۶“[۴٣٧] -٢

.Nur əs-siqləyn”, c. ١, səh. ۴٨٣“[۴٣٨] -٣

.Təfsiri-nümunə”, c, ٣. səh. ۵٠“[۴٣٩] -۴

.Məcmə əl-bəyan”, c. ٢, səh. ۵٠“[۴۴٠] -۵

Ey iman gətirənlər! Şərab da, qumar da, bütlər də, fal oxları da Şeytan əməlindən olan“ murdar bir şeydir. Bunlardan çəkinin ki, bəlkə, nicat tapasınız! Şübhəsiz ki, Şeytan içki və qumarla aranıza ədavət və kin salmaqdan və namaz qılmaqdan ayırmaq istər. Artıq (bu işə son qoyacaqsınızmı?”(١)

.Ayədə bir neçə məqamın üzərində dayanmaq lazımdır

Birincisi: Ayə şərabın hökmünü qəti olaraq açıqlamışdır. Lakin bu öncəki üç mərhələdə yaranmış hazırlıqdan sonra idi. Belə ki, ayə nazil olduqdan sonra (cahillik dövrünün artıq içməyəcəyik”“ انتهينـا .... انتهينـا şərab içənlərindən olan) Ömər ibn Xəttabın cavabı .(sözləri oldu(٢)

Bu ayə nazil olduqda əlində şərab camı olanlar, camları sındırdılar. Camlar küçələrə töküldü. Cəmiyyət yekdilliklə şəriət hökmünə boyun əydi. Bu, Quranın heyrətləndirici .tərbiyə üsulunun təsiri idi

.İkinci: Bu ayədə şəraba qadağa qoyulmaqla yanaşı onun fəsadları da açıqlanmışdır

## QISA TARİX

.İslamdan öncə spirtli içkilərin içilməsi gündəlik adi həyatın bir hissəsini təşkil edirdi

Çünki insanlar onun törədə biləcəyi xəstəliklərdən xəbərsiz idilər. Tədqiqatımızın nəticəsinə görə şərab ilk dəfə İslamda qadağan olunmuşdur. Belə ki, bu qadağadan sonra İslama doğru etiraz səsləri ucalmağa başladı. Bu hökm bir çoxlarına qəribə gəldi və səbəblərini araşdırmağa başladılar



---

.Maidə, ٩٠-٩١[۴۴١]-١

.Quranda təbabət”, səh. ١۶١; “Təfsiri-nümunə”, c. ۵, səh. ۶٨“[۴۴٢]-٢

:Fransa tarixçisi Rhenan yazır

İslam dini öz ardıcıllarını bir çox təhlükədən, o cümlədən donuz, itin artığı və şərabdan“ .”xilas etmişdir

## HÖKMLƏR

Quranda və əhli-beytdən (ə) gələn rəvayətlərdə spirtli içkilərlə mübarizə məqsədi .daşıyan bir neçə hökm var

.Hər növ spirtli içkini içmək haramdır .١

.(Maye halında olan keflәndirici maddələr murdardır (texniki spirt istisnadır .٢

Spirtli içkilərlə murdar olmuş qab az su ilə (bəzi müctehidlərə görə kürr və axar su ilə .٣ .(də) ٣ dəfə yuyulmalıdır (٧ dəfə yuyulması isə müstəhəbdir - daha yaxşıdır

.Spirtli içki içdiyi sübut olunan şəxsə məhkəmə tərəfindən ٨٠ qamçı kəsilir .۴

## ELMİ SİRLƏR

Spirtli içkilərin haram və murdar olmasına bir neçə baxımdan yanaşmaq olar. Əhli-beytdən (ə) gələn rəvayətlərdə, tibb elmləri üzrə mütəxəssislərin açıqlamalarında spirtli içkilərin mənəvi, ictimai və gigiyenik zərərləri haqqında maraqlı faktlar var. .Aşağıda bu faktları diqqətinizə çatdırırıq

.a) Rəvayətlərdə şərabın mənfi təsirləri

:Peyğəmbərdən (s) nəql olunan bir hədisdə deyilir

.(Şərab çirkinliklərin, cinayət və səviyyəcə alçaq işlərin törədicisidir”(١“

:İmam Baqir (ə) buyurur

Daim şərab içən (alkoqolik) bütpərəst kimidir. Şərab insanda bədənin əsməsinə“ gətirib çıxarır. Onun kişiliyini, insafını məhv edir. Şərab, ona qurşanmış insanı yaxınlarına qəsd etməyə, yaxın qohumları ilə intim münasibətə sürükləyir. Sərxoş insan öz məhrəmləri ilə zina etməyə belə cəsarət edir. O, sərxoş vəziyyətdə nə etdiyini .(bilmir. Şərab onu istənilən təhlükəli işə vadar edir”(١

.b) Mənəvi və ictimai təsirləri

.Spirtli içkilər insanlığı əldən alır .١

.Spirtli içkilər insanların ağılını əlindən alır. Onlar sərxoş vəziyyətdə təhlükəli hal alırlar

.Alkoqolizmin ictimai ziyanları .٢

Şərab içmək şeytani əməllərdəndir. Şeytan bu yolla insanların arasında düşmənçilik salır. “Şübhəsiz ki, Şeytan içki və qumarla aranıza ədavət və kin salmaqdan və namaz .(qılmaqdan ayırmaq istər” (Maidə, ٩٠-٩١

Alkoqoliklər onlarda yaranan (sərxoş ikən) yırtıcılıq əhval-ruhiyyəsinin təsiri ilə hər bir cinayəti törətməyə hazır olurlar(٢). Statistik məlumatlara görə alkoqoliklərin ictimai .(cinayətləri olduqca çoxdur(٣

.Alkoqolizmin iqtisadi ziyanları .٣

:Alimlərdən biri yazır

Əgər hakimiyyət dairələri meyxanaların yarısının bağlanacağına zəmanət versələr,“ xəstəxana və



---

.Bihar əl-ənvar”, c. ٦٥, səh. ١٦٤“ [٤٤٤] -١

Amerkada h.q. ١٣٦٣- cü ildə təqribən ١٠ min alkoqolik var idi. Habelə ٢٥٠٠٠ ölümlə [٤٤٥] -٢ nəticələnən yol qəza hadisəsi, ١٥٠٠٠ qətl və intihar, eləcə də ٢٥٠٠٠٠٠ polis saxlamaları .alkoqolizmin nəticəsi olmuşdur

Qətl ٥٠٪, ağır travmalarla nəticələnən münaqişələr ٧٧, ٨ ٪, alkoqoliklərin[٤٤٦] -٣

.(törətdikləri oğurluqlar ٨٨, ٥ ٪, namusa təcavuz ٨٨, ٨ ٪ (“Təfsiri-nümunə”, c. ٢, səh. ٧٥

.(dəlixanaların yarısına ehtiyac olmayacağına zəmanət veririk"(۱

Deməli, spirtli içkilərin dövlətə keçəri xeyiri (şərabçılardan alınan vergi və s.) olsa belə, .(ziyanı daha çoxdur. Bu, Quranın əsrlər öncə xəbər verdiyi həqiqətdir (Bəqərə, ۲۱۹

.Alkoqolizmin mənəvi ziyanları .۴

Spirtli içkilər ümumilikdə insanı dindən çıxarır. Quran xüsusi olaraq onun Allahı .(xatırlamağa, namaz qılmağa mane olduğunu bildirir (Maidə, ۹۰-۹۱

Spirtli içkilərin mühüm ziyanlarından biri də özünü ictimai davranış qaydalarında, etik normalarda göstərir. Alkoqolikin ailəyə, övlada qayğısı, sevgisi son həddə enir. Bir çox hallarda bu katiqoriyalı insanların öz övladlarına belə qəsd etdikləri müşahidə .(olunmuşdur(۲

.c) Alkoqolizmin tibbi ziyanları

İçilmiş alkoqol (ağız, mədə və ağciyər selikli toxumaları vasitəsi ilə) asanlıqla qana sorularaq mərkəzi sinir sistemində bir sıra pozğunluqlar törədir. Əgər hamilə qadın alkoqol içərsə, içilən alkoqolun müəyyən hissəsi bətndəki uşağa ötürülür və birbaşa .beyin hüceyrələrinə təsir göstərir

.Spirtli içkilərin törətdiyi xəstəlikləri əsasən iki hissəyə ayırmaq olar

.Birinci: Narkotik sərxoşluq

Böyük dozada alkoqol içənlərdə baş qaldırır. Sərxoş şəxs dərin yuxuya gedir, onun vətər, dəri və başqa refleksləri zəifləyir, hətta ürək fəaliyyəti və tənəffüsü həyat üçün .qorxu törədəcək dərəcədə pozula bilər

səh:۲۱۱

---

.Təfsiri-nümunə", c. ۲, səh. ۷۶" [۴۴۷] -۱

.Təfsiri-nümunə", c. ۲, səh. ۷۵" [۴۴۸] -۲

Əgər müntəzəm şəkildə alkoqol içilərsə, bu xroniki alkoqolizmə səbəb olur. Nəticədə xəstənin əmək qabiliyyəti pozulur və ya itir, iradəsi zəifləyir. Onlar özlərini normal idarə edə bilmir. Xroniki alkoqolizm qan-damar sistemində distrofik dəyişikliklərə, hipertoniya xəstəliyinin sürətlənməsinə, qaraciyər və böyrəklərin funksiyasının pozulmasına, ağır psixi və somatik pozğunluqlara və s. səbəb olur. Xroniki alkoqolizm .ağıl zəifliyi, alkoqol epilepsiyası, bəzi hallarda alkoqol psixozları ilə nəticələnə bilər

Bəziləri etiraz edirlər ki, az miqdarda spirtli içkinin qəbul olunması xəstəliyə səbəb olmur. Bu etiraza cavab olaraq bildirmək lazımdır ki, "Sərxoşluq" adlanan xəstəlik (içkinin az və ya çox qəbul olunmasından asılı olmayaraq) baş verir və kəskin ağıl .pozğunluğu ilə müşyiət olunur

.(İkinci: Kəskin alkoqol intoksikasiyası (spirtli içkilərin alkoqolu ilə zəhərlənmə

Bu xəstəlik əsas sinir proseslərini, ilk növbədə, insanın düzgün davranışına, təfəkkür və danışığına həlledici təsir göstərən tormozlanmanı gücləndirir. Alkoqol sərxoşluğun ilk mərhələsində sanki adama qüvvət gəlir, iş qabiliyyəti artır. Halbuki müəyyən edilmişdir ki, hətta cüzi miqdarda alkoqol belə, insanın fiziki və zehni iş qabiliyyətini xeyli azaldır. Sərxoş adam ilk anlar qayğısızlaşır, kefi durulur, şənlik edir və s. Sərxoşluq gücləndikcə bütün bunlar əsəbilik, ədəbsizlik və kobudluqla əvəz olunur. Sərxoş adam cəmiyyətdə davranış qaydalarına riayət edə bilmir. Ailədə narazılıq .törədir və uşaqların tərbiyəsinə mənfi təsir göstərir

## ALKOQOL PSİXOZLARI

(Xronik alkoqolizm nəticəsində baş verən psixi xəstəliklər qrupu)

.(Alkoqol delirisi (Kəskin alkoqol psixozlarının ən çox təsadüf olunan forması .۱

Alkoqol delirisi, adətən ۳ – ۷ gün davam edir. Xəstəlikdən ۲ – ۳ gün əvvəl ümumi narahatlıq başlayır, xəstə səbəbsiz vahimələnir, yuxusu pozulur, daha sonra hallüsinasiya müşahidə edilir (gözünə bədheybət adamlar, qorxunc heyvanlar, həşərat və s. görünür). Alkoqol delirisi, bəzən ürək fəaliyyətinin pozulmasından ölümlə .nəticələnir

.(Alkoqol hallüsinozu (alkoqol qarabasması .۲

Alkoqol hallüsinozu da kəskin və xronik olur. Ən çox eşitmə hallüsinasiyasına təsadüf edilir. Bu zaman xəstəyə elə gəlir ki, üstünə qışqırırlar, hərəkətlərini pisləyirlər, onu hədələyirlər, ləkələmək, yaxud nahaq yerə cəzalandırmaq istəyirlər. Xəstənin ağlı .özündə olsa da onda hallüsinasiya qalır

.Qısqanclıq sayıqlaması .۳

Qısqanclıq sayıqlaması xronik alkoqol psixozlarının ən xarakterik formasıdır. Bu zaman xəstədə əsassız qısqanclıq hissi baş qaldırır, onu heç vəchlə bu fikirdən daşındırmaq olmur. O, hətta şübhələndiyi adamın, eləcə də yaxın tanışlarının həyatına qəsd edə .bilər

.Korsakov psixozu .۴

Korsakov psixozu alkoqol psixozlarının beynin alkoqolla zəhərlənməsi nəticəsində baş verən xüsusi formasıdır. Səciyyəvi əlamətləri: xəstənin yaddaşı və oriyentasiyası kəskin pozulur, gün ərzində baş verən hadisələri, hətta yeyib-yemədiyini xatırlaya .bilmir və s

.(Dipsomaniya (yun. dipsa – həvəs + mania – ağılsızlıq .۵

Dipsomaniya alkoqolizm nəticəsində baş verən xüsusi xəstəlik formasıdır. Belə hallarda xəstə yalnız xəstəlik tutması zamanı sərxoşluq edir. Tutmalar arasındakı müddətdə isə spirtli içkiyə həvəsi olmur, hətta ondan ikrah edir. Tipik hallarda, xəstə bədbinlikdən şikayətlənərək içməyə başlayır. Sonralar isə içkiyə aludəlik xəstənin onsuz da pozulmuş iradəsinə hakim kəsilir. O, iş qabiliyyətini itirir, hərəkətlərinə .nəzarət edə bilmir

Qeyd: Bundan başqa spirtli içkilərin istifadəsindən törənən bir çox xəstəliklər də var ki, ixtisas üzrə yazılmış kitablarda öz əksini tapmışdır. Bu xəstəlikləri aşağıdakı şəkildə :sıralamaq olar

.Əsəb xəstəlikləri

Həzm xəstəlikləri (buraya ağız-boğaz selikli qişalarının zədələnməsi, qida borusu iltihabı, ağır qanqusma, qida borusu xərçəngi, kəskin mədə iltihabı, xronik mədə iltihabı, mədə xərçəngi, mədə yarası, mədəaltı vəzi iltihabı, qaraciyər xəstəlikləri və s. .(daxildir

(.Ürək xəstəlikləri (ürək əzələlərinin zəifliyi və s

.Yoluxucu xəstəliklər

.(Qan çatışmazlığı (qanda dəmir, B۱۲ vitamini və s. azalır

.Xərçəng xəstəlikləri

YEKUN

Spirtli içkilərə qadağa qoyulması Quranın elmi möcüzələrindən biridir. Bu hökm . ۱ açıqlandıqda bəşəriyyət çox böyük iştahla bu növ içkiləri içir və onun gigiyenik .fəsadlarından xəbərsiz idi

səh:۲۱۴

Bəzi yazıçılara görə Quranın ecazkarlıq nümunələrindən biri cahillik dönəminin ərəb .۲ .(cəmiyyətində apardığı qısamüddətli dəyişiklikdir(۱

.Şərabın mərhələli şəkildə qadağan olunması bunun ən bariz nümunəsidir

.Şərabın haram və murdar olunmasının səbəbləri qeyd olunanlarla bitmir .۳

Sonda qeyd olunan xəstəliklər haqqında iki məqamı nəzərdən qaçırmaq lazım deyil. Birincisi, bu xəstəliklər ümumi xarakter daşımır. Yəni bütün alkoqoliklər bu xəstəliklərə yoluxmur. Çünki insanların orqanizminin dayanıqlılığı müxtəlifdir. İkincisi, sonda qeyd olunan xəstəliklərin bir çox amilləri mövcuddur ki, onlardan yalnız biri spirtli içkilərdir. .Yəni heç şərab içməyənlər belə bu xəstəliklərə yoluxa bilərlər

## ŞƏXSİ SAĞLAMLIQ

### DƏSTƏMAZ

Dəstəmaz, üzü, iki əli yumaq, başa və ayaqlara məsh çəkməyə deyilir. Müəyyən .şəraitdə ibadət sayılır

İslamda vacib edilən bir çox ibadət və dini ayinlər iki cəhətdən böyük əhəmiyyət daşıyır. Birinci cəhət onun insanı Allaha yaxınlaşdırması, mənəvi yetkinliyi, ikinci cəhət isə ictimai mühitə və ya insanın öz sağlamlığını təmin etməsidir. Namaz, oruc, .dəstəmaz, qüsl və s. bu qəbildəndir

:Quranda dəstəmaz haqqında oxuyuruq



---

.Məhəmməd Baqir Həkim, “Quranşünaslıq”, səh. ۱۲۹[۴۴۹] -۱

“Ey iman gətirənlər! Namaza durduğunuz zaman üzünüzü və dirsəklərlə birlikdə əllərinizi yuyun... Allah sizi çətinliyə salmaq istəməz, lakin O sizi pak, təmiz etmək və sizə olan ne’mətini tamamlamaq (artırmaq) istər ki, bəlkə, şükür edəsiniz!”(١)

## ELMİ SİRLƏR

Dəstəmazın elmi və mənəvi faydaları haqqında hədislərdə və bir çox elmi əsərlərdə mühüm məqamlara toxunulmuşdur.

١. Rəvayətlər.

İmam Rzadan (ə) nəql olunan bir hədisdə deyilir:

“Dəstəmaz bunun üçündür ki, bəndə Allah qarşısında pak, danışmağa hazır olsun. Mövlasının əmrinə tabe olub çirkinliklərdən, murdarlardan təmizlənsin. Əzginliyi aradan getsin. Yuxusu qaçsın...”(٢).

٢. Şəxsi təmizliyi nizama salmaq.

Bəzi həkimlər yazırlar:

“Bir çoxlarının fikrincə təmizlik zövqə, fərdin iqtisadi durumuna bağlıdır. Quranda isə müntəzəm surətdə təmizlik işi aparmaq bir dini zərurət olaraq göstərilmişdir”(٣).

٣. Dəstəmazın insan sağlamlığında rolu.

Bəzi həkimlər yazırlar:

“Əgər dərinin sağlamlığı haqqında son elmi nailiyyətlərə nəzər salsaq, o zaman dəstəmazın əhəmiyyəti anlaşılacaq. Dərinin sağlamlığı ilk növbədə bədənin, xüsusilə açıq yerlərin yuyulmasından, təmiz



---

١- [۴۵٠] Maidə, ۶.
٢- [۴۵١] “Eləl əş-şərai”, səh. ٢٧٩-٢٨١.

saxlanılmasından aslıdır. Dərinin davamlı olaraq yuyulması tər vəzilərin tər ifrazını .(asanlaşdırır”(۱

:Dəstəmazın gigiyenik faydaları haqqında yazırlar

Dəstəmaz əllərin çirklənməsindən törəyən bir çox həzm xəstəliklərinin qarşısını alır.“ Bu xəstəliklərin ən təhlükəlisi yolxucu xəstəliklərdir (vəba, qarın yatalağı, mədə iltihabları, qida məhsullarından zəhərlənmələr və s.). Bundan başqa, qan dövranına və .(s. müsbət təsir göstərir”(۲

:Alimlərdən biri yazır

İslamda göstərilən dəstəmaz eynilə masaj (isveç masajı) xarakterinə malikdir. Çünki“ bədənə soyuq su dəydikdə, həmin üzv soyuyur. Qan soyuyan üzvə doğru sürətlə hərəkət edir və bədənin itirilən təbii hərəkətini qorumağa çalışır. Qan dövranını .(sürətləndirir, nəticədə insan gümrah və sağlam olur”(۳

Dəstəmazın hansı su ilə (soyuq, pak və s.) alınması, burunu, ağzı yaxalamaq, . ۴ dəstəmazdan öncə dişləri yumaq və s. bu kimi məsələlər haqqında hədislərdə maraqlı .(gigiyenik məqamlara toxunulmuşdur ki, ixtisar məqsədi ilə burada qeyd etmirik(۴

## YEKUN

Dəstəmaz hökmünün zəruri dini ayin olaraq vacib olunması səmavi dinlərin . ۱ insanlara təmizliklə yanaşı, daxili nurluluğu, səciyyəvi mənəviyyatı da özündə .cəmləşdirən ərməğanıdır

Öncə də qeyd olunduğu kimi əlləri və üzü yumaq insanların gündəlik proqramlarında .۲ mövcud olmuş, bəzi



---

.Yenə orada, səh. ۱۳۰ [۴۵۳]-۱

.Yenə orada, səh. ۱۲۸-۱۲۹ [۴۵۴]-۲

.Hökmlərin fəlsəfəsi”, səh. ۲۳۲-۲۳۵“ [۴۵۵]-۳

dinlər tərəfindən isə dəstəmaz olaraq vacib edilmişdir. Deməli, bunu Quranın elmi möcüzəsi hesab etmək olmaz (Qeyd etmək lazımdır ki, İslamda göstərilən dəstəmaz, digər dinlərdə göstərilən dəstəmazla müəyyən baxımlardan fərqlidir).

٣. Dəstəmaz bir dini ibadətdir. Onu sadə masaj və ya yuyunma həddinə düşürmək yolverilməzdir. Doğrudur, onun gigiyenik xüsusiyyətlərinə göz yummaq olmaz. Lakin bu dəstəmaza bir tərəfli yanaşmaya səbəb olmamalıdır.

٤. Dəstəmazın elmi sirləri onun vacib olunması səbəblərindən ola bilər. Lakin bu heç də tam səbəb deyil. Burada digər səbəblərin (xüsusilə mənəvi səbəblərin) mövcudluğu da ehtimal olunur.

## QÜSL

Qüsl İslamda bir ibadət olaraq göstərilmişdir. Öncə də qeyd olunduğu kimi bu növ ibadətlərin iki mühüm cəhəti spesifikdir; ibadət və sağlamlıq. Quranın bir çox ayələrində pak insanlar mədh olunur və Allahın istəklisi kimi göstərilir. Qüsl "təharət" (paklıq) deyə anılır. Quranda bir neçə vəziyyətdə qüsl etməyin zəruri olduğu bildirilir.

Birinci: Cənabətli olduqda (cinsi əlaqə və ya istənilən şəkildə məni xaric olduqda).

"Ey iman gətirənlər! Namaza durduğunuz zaman... Əgər cünub olmusunuzsa, qüsl edin (bədəninizi başdan ayağa qədər yuyub təmizləyin)... Allah sizi çətinliyə salmaq istəməz, lakin O sizi pak, təmiz etmək və sizə olan

(ne’mətini tamamlamaq (artırmaq) istər ki, bəlkə, şükür edəsiniz!”(۱)

Yuxarıda qeyd olunan ayə bir daha göstərir ki, ilahi göstərişlər insanların mənafeyinə xidmət edir. Allah bu göstərişlərlə insanların mənəvi və cismani paklığını təmin edir.

İkinci: Heyz (qadınların aybaşı adəti – menstruasiya) olan qadınlar.

“Səndən heyz (aybaşı) barəsində sual edənlərə söylə: Heyz əziyyətli bir haldır. Heyz zamanı qadınlardan kənar olun, (heyzdən) təmizlənməyənə qədər onlarla yaxınlıq etməyin, təmizləndikdən sonra isə Allahın sizə əmr etdiyi yerdən (buyurduğu qayda üzrə) onlara yaxınlaşın! Allah (günahından) tövbə edənləri, (təmiz və) pak olanları sevər!”(۲)

Bu haqda növbəti bəhslərdə (heyz haqqında olan qadınlarla cinsi əlaqənin yasaq olunmasının səbəbləri bəhsində) ətraflı söhbət açacağıq.

Qeyd: Əlbəttə, İslamda digər qüsllər də mövcuddur (Buraya Nifas (doğuş qanı görən qadınlar üçün), İstihazə (müəyyən şəraitdə qan görmələr zamanı) vacib, cümə, bayram və s. müstəhəb qüsllər daxildir).

## ELMİ SİRLƏR

۱. Qüslün səbəbləri hədislərdə.

İmam Rza (ə) Məhəmməd ibn Sənanın sualının cavabı olaraq buyurur:

“Cənabət qüslündən məqsəd təmizlikdir. İnsan qüsl zamanı özünü çirkdən təmizləyir, bədəni paklayır. Çünki

səh:۲۱۹

---

۱- [۴۵۷] Maidə, ۶.

۲- [۴۵۸] Bəqərə, ۲۲۲.

."məni bütün bədəndən xaric olur. Buna görə də bütün bədəni təmizləmək lazımdır

.Qeyd: Hədisin elmi izahı haqqında növbəti səhifələrdə söhbət açacağıq

.Qüslün mənəvi rolu .۲

Qüsl insanın daxilən nurluluğuna səbəb olur. Onda mənəvi əhval-ruhiyyə yaradır. .Ruha paklıq bəxş edir

Qüslün gigiyenik faydaları .۳

:Bəzi həkimlər qüslün gigiyenik faydaları haqqında yazırlar

Spermanın orqanizmdən xaric olması (sidik və s. kimi) yalnız bir üzvlə bağlı deyil. O,“ .bütün orqanizmə təsir göstərir. Bütün hüceyrələr sperma xaric olduqda süstləşir

Alimlərin tədqiqatına görə insan orqanizmində mövcud olan veketativ sinir sistemi – simpatik və parasimpatik olmaqla iki hissəyyə bölünür. Simpatik sinir sisteminin funksiyasi orqanizmin fəalliyətini sürətləndirmək, çoxaltmaq, parasimpatik sinir sisteminin funksiyası isə tam əksinə orqanizmin fəaliyyətini ləngitməkdir. Veketativ sinir sisteminin bu iki hissəsi orqanizmdə tarazlığı qoruyur. Bəzən orqanizmdə baş verən fəaliyyət nəticəsində məlum tarazlıq pozulur. Bu tarazlığı pozan amillərdən biri də orqazm aktıdır. Bu zaman parasimpatik sinir sistemi simpatik sinir sistemini üstələyir və məlum tarazalıq mənfi şəkildə pozulur. Sübuta yetirilmişdir ki, simpatik sinir sistemini işə salan və itirilmiş tarazlığı bərpa edən amillərdən biri də bədənin suya toxunmasıdır. Orqazm zamanı simpatik və parasimpatik sinir sistemlərinin tarazlığı pozulduğu üçün cinsi əlaqədən və ya məni xaric olduqdan sonra su ilə yuyunmaq (qüsl .(etmək) vacib edilmişdir"(۱)



---

.Təfsiri-nümunə", c. ۴, səh. ۲۸۴" [۴۵۹] -۱

:Elm adamlarından biri yazır

İnsan bədəninin xarici örtüyündə ۲ milyona yaxın məsamə mövcuddur. Dəri bu“ məsamələr vasitəsilə xarici aləmlə qaz mübadiləsinə girir. Yəni oksigenin orqanizmə daxil olmasını təmin edir (Orqanizmin tənəffüsünün ۷٪-i bu yolla baş verir). Tər və zəhərli qazlar da bu məsamələrdən xaric olur. Bədəndən xaric olan tərin davamlı buxarlanması nəticəsində qazlı maddələr buxara çevrilir, zəhərli, mineral maddələr isə dərinin üzərində qalır. Bu oturumlar (çöküntülər) məsamələri tutur və parazitlərin inkişafı üçün əlverişli şərait yaradır. Cinsi əlaqə zamanı insan daha çox tərləyir. Nəticədə məsamələrin üzərində daha çox çöküntü oturur (İnsan hər ۲۴ saatda orta hesabla ۱ litr tərləyir. Əgər məsamələr bu və ya digər vasitələrlə tutularsa, çox keçmədən ölümlə nəticələnər). Buna görə də şəriətdə cənabət qüslü vacib edilmişdir .ki, bədənin üzərində parazit yuvacıqları məhv edilsin

Qabaqlar məninin yalnız müəyyən bir üzvdən xaric olduğu zənn olunurdu. Yalnız .(zaman keçdikcə məninin bütün bədəndən xaric olması isbat olundu”(۱

.Qüslün ictimai rolu .۴

:Bəzi alimlər həkimlərə istinad edərək yazırlar

Bilməliyik ki, (cinsi əlaqədən sonra) bədən tam yuyulmazsa, insanın tündməzac“ olmasına gətirib çıxarır. Bundan başqa, ünsiyyət, sevgi azalır, onlardan pis iy gəlir, iy .(bilmə hisləri azalır”(۲

.Məss-meyyit” qüslünün faydaları“ .۵

:Bəzi yazıçılar “məssi-meyyit qüslü haqqında yazırlar



---

.Hökmlərin fəlsəfəsi”, səh. ۲۵۲-۲۵۹“ [۴۶۰] -۱

.Hökmlərin fəlsəfəsi”, səh. ۲۵۲-۲۵۹“ [۴۶۱] -۲

Xəstənin dəri örtüyündə çoxlu miqdarda mikrob olur (təqr. hər santikvadratda ۴۰,۰۰۰).“ Bəzi mikroblar xəstə öldükdən sonra güclənərək artır. Bu zaman dəri örtüyü yoluxucu xəstəliklərin yayıcısına çevrilir. İslamda meyit yuyulmazdan öncə çirkin hesab olunur .(və ona toxunanların xəstəliyə yoluxmamaları üçün qüsl etməyi tövsiyə edilir”(۱)

YEKUN

.Burada bir neçə məqama toxunmağı zəruri hesab edirik

Qüsl ayini ilahi dinlərin insana töhfələrindəndir. Hansı ki, onun mənəvi və cismani .۱ sağlamlığına yol açır. İlahi dinlər bu növ məsələlərdə insana düzgün həyat yolunu göstərmişlər. Lakin bunun təbii bu instinktiv kökləri öncədən insanda mövcud olduğu üçün səmavi kitabların elmi möcüzəsi hesab oluna bilməz. Bu, sadəcə insanın təbii .əməlinin təsdiqidir

Qüsl namaza giriş üçün bir ibadətdir. Onu sırf gigiyenik tədbir səviyyəsinə endirmək .۲ .doğru deyil. Təbii ki, onun gigiyenik faydaları da danılmazdır

Bir çox elm adamlarının fikrincə cənabət qüslünün vacib olmasının səbəbi gigiyenik .۳ məsələlərdir. Halbuki cənabət qüslü özlüyündə müstəhəbdir. Lakin namazın müqəddiməsi olduğu üçün vacib olur. Deməli, gigiyenik səbəbləri bu növ hökmlərin .tam səbəbi kimi göstərmək doğru deyil

Qeyd olunan gigiyenik faydalar bədənin adi qaydada yuyulması zamanı da özünü .۴ .göstərir. Bu bir daha məlum faydaları İslamın əsl məqsədi olmadığını aşkara çıxarır



---

.Hökmlərin fəlsəfəsi”, səh. ۲۵۲-۲۵۹“[۴۶۲] -۱

### GEYİMİN PAK OLMASI

Geyimin pak və təmiz olması insanın təbii istəklərindən biridir ki, İslamda da buna .böyük yer verilmişdir

:Quran Peyğəmbərə (s) müraciət edərək buyurur

Ey (libasına) bürünüb sarınan (Peyğəmbər)! Qalx (qövmünü Allahın əzabı ilə) qorxut!“ (Öz Rəbbini uca tut! Libasını təmizlə!”(۱)

.Ayədə geyimin paklığından məqsədin nə olduğu haqqında ۶ versiya irəli sürülmüşdür

.Ayədə məqsəd onun ilkin zahiri mənası, yəni geyimin murdarlardan paklanmasıdır .۱

.İnsan əməllərinin islah olunması. Çünki əməl nəfsin geyimi misalındadır .۲

.Nəfsin saflaşdırılması .۳

.Geyimi güdəltmək. Çünki yerdəki murdarların geyimə toxunmasının qarşısını alır .۴

Həyat yoldaşlarını küfr və günahdan pak etmək. Çünki (digər ayələrdə) qadın . ۵ .geyimə bənzədilmişdir

.Əxlaqi sərvətlərə yiyələnmək .۶

.(Əllamə Təbatəbai birinci və ikinci versiyaları məqsədə uyğun hesab edir(۲

### HÖKMLƏR

.İslamda geyimin pak olması haqqında çoxlu sayda hökm və tövsiyələr mövcuddur

Namaz qılarkən paltar pak olmalıdır (burada xüsusi şəraitdə istisna mövcuddur). Əks .۱ .təqdirdə namaz batildir



---

.Müddəssir, ۴ [۴۶۳] -۱

.Əl-Mizan”, c. ۲ səh. ۱۶۰-۱۶۱“ [۴۶۴] -۲

.Geyimin pak olması bəzi həcc əməllərində (təvaf və s.) zəruri şərtdir .٢

Namaz qılarkən, ziyarət edərkən, dini yığıncaqlarda və s. iştirak edərkən təmiz .٣ .(geyinmək müstəhəbdir. Bu haqda çoxlu hədislər mövcuddur(١

## ELMİ SİRLƏR

:Bəzi həkimlər yazırlar .١

İslamda geyimin pak olması ibadətin düzgünlüyünün şərtlərindəndir. Bu, müsəlmanı“ geyiminin təmizliyinə xüsusi əhəmiyyət verməyə vadar edir. Bu məsələnin əhəmiyyəti .(heç kimə sirr deyil”(٢

Namaz zamanı geyimin pak olması şərti müsəlmanın ən azı gündə beş dəfə .٢ geyiminin təmizliyi, paklığı haqqında düşünməyə vadar edir. Beləcə bir çox gigiyenik .tədbirlər də həyata keçirilmiş olur

YEKUN

.Burada bir neçə məqama diqqət yetirmək zəruridir

İlahi dinlərin geyimin paklığına əhəmiyyət verməsi dinin bəşəriyyətə gigiyenik .١ xidmətlərindəndir. Lakin geyimin paklığı, təmizliyi insanın təbii və instinktiv meylləri sırasında olduğundan Quranın elmi möcüzəsi hesab oluna bilməz. İslamın bu göstərişi .insanın instinktiv meyllərinin təsdiqi olub bələdçilik məqsədi daşıyır

göstərişi fərdi hökmdür. Bu, ”ثيابک فطهر“ Quranın şəxsən Peyğəmbərə (s) ünvanlanan .٢ bir çoxlarında ayənin digərlərinə aid olmadığı təsəvvürünü yarada bilər. Lakin



---

.Furu əl-kafi” c. ۶, səh. ۴۴۱-۴۴۴; “Mizan əl-hikmə”, c. ۱۰, səh. ۹۲-۹۴“ [۴۶۵] -۱

.Quranda təbabət”, səh. ۱۳۰-۱۳۱“ [۴۶۶] -۲

.bu heç də belə deyil. Çünki ayəni bir neçə yolla ümumiləşdirmək olar

Birinci: Əhzab surəsinin ۲۱-ci ayəsində (Həqiqətən, Allahın Rəsulu Allaha, qiyamət gününə ümid bəsləyənlər və Allahı çox zikr edənlər üçün gözəl örnəkdir!) qeyd olunduğu kimi Peyğəmbər (s) hamıya örnəkdir. Deməli, hamı ilk ayədə Peyğəmbərə (s) .aid olunan hökmə əməl edərək ikinci ayəyə (Əhzab, ۲۱) sadiq qalmalıdır

İkinci: Ayədə Peyğəmbərə (s) müraciət olunsa da geyimin paklığının yalnız .Peyğəmbərə (s) aid ola biləcək heç bir cəhəti yoxdur

Üçüncü: Geyimin paklığı haqqında nəql olunan rəvayətlər göstərir ki, bu hökm yalnız .(Peyğəmbərə (s) aid deyil (fərdi hökm deyil, ümumi hökmdür

Ayə haqqında irəli sürülən ۶ ehtimaldan yalnız biri geyimin pak olmasıdır. Buna görə .۳ .də qəti olaraq ayənin məlum mövzuya aidiyyətını iddia etmək olmaz

Namaz qılanın şərtlərindən olan geyimin paklığının gigiyenik faydaları bu hökmün .۴ yalnız spesifik səbəbi ola bilər. Bunun tam səbəb olduğunu hesab etmək yanlışdır. .Ehtimal ki, bu hökmə səbəb olan digər mənəvi, ictimai və s. amillər də mövcuddur

### ƏTRAF MÜHİTİN (ÇİRKLƏNMƏDƏN) MÜHAFİZƏSİ

Ətraf mühitin təmiz, pak olması (şəxsi mənzil, küçələr, prospektlər, ictimai obyektlər, bizi əhatə edən hava, su və s.) insanın sağlamlığında mühüm rol oynayır. Quranda :oxuyuruq

وَطَهِّرْ بَيْتِىَ لِلطَّائِفِينَ وَالْقَائِمِينَ وَالرُّكَّعِ السُّجُودِ

Yadına sal ki, bir zaman İbrahimə Kə’bənin yerini bildirib belə buyurmuşduq: Mənə heç bir şeyi şərik qoşma, evimi təvaf edənlər, namaza duranlar, rüku edən və səcdəyə (qapananlar (namaz qılanlar) üçün (bütlərdən) təmizlə!(١)

Məlum ayə həzrət İbrahim (ə) haqqındadır. Kəbə ibadət üçün təyin edildikdən sonra ona belə vəhy olundu:“Evimi təvaf edənlər, namaza duranlar, rüku edən və səcdəyə ”!qapananlar (namaz qılanlar) üçün təmizlə

.təhhir] ifadəsi haqqında iki ehtimal mövcuddur] ” طهر“ Ayədə sözü keçən

Birinci ehtimal: Allahın evini pak etməkdən məqsəd oranı mənəvi napaklıqdan qorumaqdır. Yəni bu ev Allaha ibadətə məxsusdur, şirk və bütpərəstlikdən uzaq .olmalıdır

İkinci ehtimal: Allahın evini pak etməkdən məqsəd, onu mənəvi və maddi çirkinlikdən .(uzaq tutmaqdır. Əllamə Təbatəbai birinci mənaya üstünlük verir(٢)

.İkinci ehtimalı qəbul edəriksə, ayə məscidlərin pak saxlanılmasına da aid olur

### ELMİ SİRLƏR

.İslamda məscidlərlə bağlı xüsusi hökmlər mövcuddur .١

.A) Məscidi murdarlamaq icazəli deyil

.B) Məscid murdarlanarsa, onu təmizləmək (paklamaq) hamıya vacibdir

.İbadət məkanının paklanması ibadət edənlərin mənəviyyatında çox mühüm iz buraxır

.Ətraf mühitin paklanması .٢



---

.Həcc, ٢۶ [۴۶٧] -١

.Əl-Mizan”, c. ١۴, səh. ٣۶٨“ [۴۶٨] -٢

:Bəzi həkimlər yazırlar

Bu ayə ətraf mühitin, xüsusilə məscidin pak saxlanılmasına aiddir. Namazın“ .(düzgünlüyünün şərtlərindən biri onun pak yerdə qılınmasıdır”(١

.Mənzil və ictimai obyektlərin təmizliyi .٣

Bəzi elm adamları rəvayətlərə əsaslanaraq ayəni daha geniş mənada izah etməyə .çalışırlar

Adab əş-şəriə” kitabında mənzillərlə bağlı ۴٧ hökm qeyd olunmuşdur ki, onun ٧ hökmü“ bu mövzuya aiddir. Həmin ٧ hökm açıqca insanın yaşadığı mühitin təmiz, pak olmalı .olduğunun zərurətini göstərir. Məlum ٧ hökm aşağıdakılardır

.Evdə namaz üçün ayrıca yer ayırın .١

.Evin döşənəcəyi pak olmalıdır .٢

.Evdə it saxlamaq olmaz .٣

.Ev (vaxtlı-vaxtında) süpürülməlidir .۴

.Evə qapı qoyulmalı və pərdələnməlidir .۵

.Yemək qablarının ağzını açıq qoymaq olmaz .۶

.Evdə axar və ya kürr su olmalıdır .٧

Peyğəmbərdən (s) nəql olunan bir rəvayətdə deyilir: “Zibili evdə, yaşadığınız mühitdə .”saxlamayın. Çünki şeytan (mikrob) yığnaqıdır

:Digər rəvayətdə isə oxuyuruq

.(Toz qaldırmayın; çünki tənəffüsü ağırlaşdırır”(٢“

:Qeydlər

.a) ١ q toza mikroskopla baxdıqda ٧۵٠ ٠٠٠ – ٢ ١٠٠ ٠٠٠ mikrob görmək olar

b) Rəvayətlərdə mikrob şeytan deyə yad edilmiş və ziyanları xatırladılmışdır. Öncə də qeyd etdiyimiz kimi İslamda hər bir çirkin, xəbis varlığa şeytan deyilir(۳).

səh:۲۲۷

---

۱- _ftnref۴۶۹

۲- [۴۷۰] “Hökmlərin fəlsəfəsi”, səh. ۲۲۳.

۳- [۴۷۱] Yenə orada, ۲۲۶.

YEKUN

.Burada bir neçə məqama toxunmaq lazımdır

İlahi dinlərin, xüsusilə İslam və Quranın paklıq məsələsinə diqqəti dinin bəşəriyyətə .١ elmi xidmətlərindən biridir.

Təharət və paklıq məsələsi (insanın instinktiv meyli olmaqla yanaşı) öncəki dinlərdə .٢ də diqqət mərkəzində olduğu üçün Quranın elmi möcüzəsi sayıla bilməz.

Ayənin həzrət İbrahimə (ə) Kəbənin paklanması ilə bağlı xüsusi hökmdən ibarət .٣ olduğunu və qeyd olunan iki ehtimalın mövcudluğunu nəzərə alsaq, qəti olaraq ətraf mühitin (çirklənmədən) qorunması ilə bağlı olduğunu deyə bilmərik.

## CİNSİ SAĞLAMLIQ

### MENSTRUASİYA HALINDA CİNSİ ƏLAQƏNİN YASAQ OLUNMASI

Menstruasiya (heyz, aybaşı) qadınlarda hər ٢١-٣٠ gündən bir uşaqlıqdan qan gəlməsi ilə müşayiət edilən mürəkkəb fizioloji prosesdir. İslama görə qadınlar aybaşı adətləri keçirdikləri zaman onlarla intim münasibət yasaqdır. Quranda bu haqda oxuyuruq:

Səndən heyz (aybaşı) barəsində sual edənlərə söylə: Heyz əziyyətli bir haldır. Heyz zamanı qadınlardan kənar olun, (heyzdən) təmizlənməyənə qədər onlarla yaxınlıq etməyin, təmizləndikdən sonra isə Allahın sizə əmr etdiyi yerdən (buyurduğu qayda üzrə) onlara yaxınlaşın!(١)

səh:٢٢٨

---

١- [٤٧٢] Bəqərə, ٢٢٢.

Bugünkü yəhudilik və xristianlıqda bu növ qadınlarla intim münasibət qurulması haqqında ziddiyyətli hökmlər mövcuddur. Bir çox yəhudilərə görə bu cür qadınlarla hər hansı bir ünsiyyət haramdır. Bu fikirdə olanlara cavab olaraq bəzi xristianlar qeyd edirlər ki, qadının aybaşı adətində olub-olmaması arasında heç bir fərq yoxdur. Onlarla istənilən növ ünsiyyət, hətta cinsi əlaqə belə maneəsizdir. Ərəb müşrikləri, xüsusilə Mədinədə yaşayanlar yəhudilərdən təsirlənərək heyz halında olan qadınlarla onlar kimi davranırdılar. Bəzi müsəlmanlar Peyğəmbərdən (s) bu haqda soruşdular. .(Onlara cavab olaraq sözügedən ayə nazil oldu(١)

Qadınlar heyz halında olduqları zaman cinsi əlaqəyə qarşı ikrah hissi duyduqlarından Quran kişilərə müraciət edir. Onlarla öz istəklərini qadınlara təhmil etməmələrini və bu .vəziyyətdə qadınlardan uzaq olmağı tapşırır

## QISA TARİX

Heyz halında qadınlardan uzaq durmaq bəşər həyatında qədim tarixi keçmişə malikdir. Qədim iranlılar aybaşı adəti zamanı qadınla cinsi əlaqəni yasaq edirdilər(٢). .Bugünkü Tövratda həmin məsələ daha ifrat şəkildə qoyulmuşdur

Bu gün heyz halında olan qadınlarla cinsi əlaqənin gigiyenik zərərləri bəlli olduğu bir halda bu hökmə riayət olunmur. Hətta xristianların bunu icazəli hesab etdikləri .söylənilir



---

Təfsiri-nümunə", c. ٢, səh. ٩١-٩٢" [۴٧٣] -١

.Şəhid Mütəhhəri, "Hicab məsələsi", səh. ٣۵[۴٧۴] -٢

## HÖKMLƏR

İslam dinində heyz halında olan qadınlar haqqında bir neçə fiqhi hökm mövcuddur.

۱. Cinsi əlaqə haramdır (hər iki tərəf üçün).

۲. Dəstəmaz, qüsl və təyəmmümlə həyata keçirilən ibadətlər heyz halında olan qadına haramdır.

۳. Cənabətli fərdə haram olan bütün şeylər heyz halında olan qadına da haramdır.

۴. Qadını heyz halında ikən boşamaq (talaq vermək) talaqı batil edir.

۵. Heyz halında olan qadınla intim münasibət quran şəxsə kəffarə (günaha qarşılıq nağd ödənc) vacib olur.

۶. Heyz dövrü bitdikdən sonra namaz və s. ibadətlər üçün qüsl verilməlidir.

Qeyd: Bu hökmlərin bəzisi Quran ayəsindən, bəzisi isə Əhli-beytdən (ə) gələn rəvayətlərdən çıxarılmışdır.

## ELMİ SİRLƏR

Heyz halında olan qadınlarla cinsi əlaqədə olmaq haqqında rəvayətlərdə bir çox məqamlara toxunulmuş və bu bəzi xəstəliklərin törədicisi kimi göstərilmişdir. Bir çox həkim və mütəxəssislər də bu haqda söhbət açmışlar. Onların fikirləri ilə tanış olaq.

۱. Bu hökm bir tərəfdən kişilərlə bağlıdır, yəni onları səbrə, cinsi münasibətdə israfdan çəkinməyə dəvət edir. Digər tərəfdən isə qadınlarla bağlıdır, yəni aybaşı adəti zamanı qadınlar gərgin anlar keçirirlər. Cinsi əlaqə isə onların bu gərginliyini, narahatlığını daha da şiddətləndirir.

۲. Qadınlarla bağlı mötədil mövqe.

Bəzi təfsirçilər məlum ayəni izah edərkən yazırlar:

İslam hər yerdə mötədil mövqedən çıxış edir. Burada da həmin prinsipə sadiq qalaraq“ bu halda qadınlarla cinsi əlaqə xaricində istənilən növ ünsiyyəti icazəli hesab edir (Bu yəhudilərin ifrat, xristianların isə çox mülayim mövqeyinin yanlışlığını aşkara çıxarır). Beləcə qadına qarşı bu və ya digər hörmətsizliyə, təhqirə yol vermədən onun .(sağlamlığını da təmin etmiş olur(١

Bu hökmün hikmətlərindən biri qadın və kişinin xəstəliklərdən amanda qalmasıdır. .٣ :Həkimlərdən biri bu haqda yazır

Adi halda qadının uşaqlıq yolu ifrazat vasitəsilə yumşalır və qorunur. Süd turşusu“ xasiyyətli bu ifrazat uşaqlıq yolunu mikroblardan qoruyur. Uşaqlıq yolunda qan olduqda isə vəziyyət dəyişir. Aybaşı adəti zamanı cinsi əlaqəyə girmək çirklənməni çoxaldır, qadın və kişinin sağlamlığını şübhə altına salır. Cinsi əlaqə zamanı iltihablaşmış uşaqlıq yolunda sıyrıntı əmələ gəlir (səth təbəqəsi – funksional qat – qopmuş) uşaqlığın selikli qişası mikrobların təsiri altına düşür. Nəticədə uşaqlıqda şiddətli ağrılar baş verir. Qadında yorğunluq, süstlük, qızdırma müşahidə olunur. İltihab ağır olduqda digər hissələrə də keçib, qadında sonsuzluq yaradır. Bu halda cinsi əlaqədə olmaq qan axmanı çoxaldır. Kişinin də xəstəliyə yoluxma ehtimalı çoxalır. Sidik kanalında iltihab yaradır. Bəzən bu iltihab digər hissələrə, xüsusilə xayalara da .(keçir”(٢

Bəzi təfsirçilər “Səndən heyz (aybaşı) barəsində sual edənlərə söylə: Heyz əziyyətli bir :haldır” ayəsini qeyd edərək yazırlar

Əslində bu cümlə sonrakı cümlənin – heyz halında olan qadınlarla cinsi əlaqənin yasaq“ olunmasının – səbəbini



---

.Təfsiri-nümunə”, c. ٢, səh. ٩٣-٩۴“ [۴٧۵] -١

.Quranda təbabət”, səh. ۵٠-۵١“ [۴٧۶] -٢

açıqlayır. Çünki bu vəziyyətdə qadınlarla yaxınlıq etmək ikrah hissi oyatmaqla yanaşı çoxlu ziyanlar da törədir. Bu gün artıq onun ziyanları sübuta yetirilmişdir. Buna misal olaraq, kişi və qadının sonsuzluq (nəsil vermə qabiliyyətinin itirilməsi), sifilis, süzənək və s. zöhrəvi xəstəliklərin törəməsi orqanizmin mikrob yığnağı olan heyz qanının kişi cinsiyyət orqanına daxil olması və s. göstərmək olar. Buna görə də həkimlər heyz halında cinsi əlaqəyə icazə vermirlər"(۱).

Alimlərdən biri yazır:

"Heyz və eləcə də doğum qanında orqanizmdə olan digər qanlarda olmayan mikroblar da mövcuddur. Prinsipcə kişi nütfəsi (yaxud nütfə tərkibindəki spermatozoidlər) və ya qadının yumurtalığı çox təmiz və mikrobsuz olur. Orada yeni bir varlıq formalaşacağı üçün Allah oranı təmiz yaratmışdır. Əgər təsadüfən yumurtalığa bir mikrob düşərsə spermatozoid özü onu məhv edərək sıradan çıxarır. Lakin heyz zamanı qan vasitəsi ilə çoxlu sayda mikrob yumurtalığa keçir ki, onları sıradan çıxarmaq spermatozoidlərin qüdrəti xaricindədir. Beləcə mikroblar böyük qalibiyyət qazanır və nəticədə döl nöqsanlı olur"(۲).

۴. Qadınların heyzdən sonra qüsl verməl追ərinin hikməti.

Bəzi elm adamları bu haqda yazırlar:

a)Qadın aybaşı adətləri zamanı həyat yoldaşı (və digər ünsiyyətdə olduğu insanlarda) ikrah hissi doğurur (iyrənc vəziyyət alır). Buna görə də heyz dövrü bitdikdən, qan kəsildikdən sonra qüsl - bədəni tam yumaq ona vacib olur ki, yaranmış ikrah hissi aradan getsin və qadın tam ürəyəyatan vəziyyətə düşsün.



---

۱- [۴۷۷] "Təfsiri-nümunə", c. ۲, səh. ۹۲-۹۳.

۲- [۴۷۸] "Hökmlərin fəlsəfəsi", səh. ۲۵۸, ۲۸۰.

b)Nisbətən uzun çəkən heyz dövründə dəri məsamələrinin üzərini tərdən yaranan çöküntülər tutur. Qüsl zahiri təmizliklə yanaşı məsamələrin üstünü açır və parazitlərin .yuva salmasını əngəlləyir

c)Heyz dövründə qanda mövcud olan mikrobların bədənin digər hissələrinə də sirayət .(etməsi ehtimalı böyükdür. Buna görə də qüsl verərək tam təmizlənmək zəruridir(١

**TƏDQİQ**

Heyz halında qadınlarla yaxınlıq etməyin yasaq, eləcə də heyz dövrü bitdikdən sonra .١ .qüsl etməyin vacib edilməsi ilahi dinlərin bəşəriyyətə xidmətlərindəndir

Öncə də qeyd olunduğu kimi bu göstəriş İslamdan qabaq da mövcud olmuşdur. Elə .٢ .buna görə də Quranın elmi möcüzəsi hesab oluna bilməz

Qeyd olunan hikmətlər spesifik səbəblərdir. Bunları tam səbəb kimi qiymətləndirmək .٣ .doğru deyil

Səbir və cinsi əlaqələrdə israfa yol verilməməsinin bu hökmün səbəbi kimi . ۴ göstərilməsi düzgün deyil. Çünki İslam heyz dövründəki boşluğu doldurmaq üçün digər yollar təklif etmişdir. Misal üçün, bir kişinin bir neçə qadınla daimi ailə qurması və .s

**ZİNANIN YASAQ OLUNMASI**

fahişə] (çirkin] فاحشه Zina kişi və qadının qeyri-qanuni əlaqəsidir. Bu növ əlaqə Quranda əməl) kimi yad edilmiş və qarşısını almaq üçün ailə qurmaq, qadınların hicaba riayət etməsi və s. yollar göstərilmişdir. Zina



---

.Hökmlərin fəlsəfəsi”, səh. ٢۵٧-٢۵٨“ [۴٧٩] -١

.Quranda bir neçə mərhələdə məzəmmət olunaraq (pislənərək) qadağan olunmuşdur

:Birinci mərhələ

(Zinaya da yaxın düşməyin. Çünki o, çox çirkin bir əməl və pis bir yoldur!”(۱“

Bu ayədə zina “çirkin əməl” və bəyənilməz yol kimi göstərilərək məzəmmət .olunmuşdur

:Bəzi təfsirçilərə görə bu ayədə üç məqama toxunulmuşdur

a) Ayədəki yasaq “zina etmək” deyil, zinaya yaxın düşmək şəklində verilmişdir. Bu səbəbsiz deyil. Çünki zina bir çox hallarda nikahdan yayınmaq, naməhrəmə baxmaq .və s. müqəddimələrdən doğur. Ayə çox incə şəkildə bunlara da toxunmuşdur

kanə]] ”كان“ innə] təkid ədatı] ”إن“ .ibarəsi üç təkidlə müşayiət olunur ”انه كان فاحشه“ (b .fahişə] ifadəsi] ”فاحشه“ keçmiş zaman köməkçi feli və

.(ibarəsi zinanın cəmiyyətdə digər pozğunluqalara da yol açdığını göstərir(۲ ”ساء سبيلا“ (c

:İkinci mərhələ: Quran Allah bəndələrinin özəlliklərini açıqlayarkən buyurur

Onlar Allahla yanaşı başqa bir tanrıya ibadət etməz, Allahın haram buyurduğu cana“ .(nahaq yerə qıymaz (onu öldürməz), zina etməzlər”(۳

Burada namusluluq Allahın xüsusi bəndələrinin səciyyəvi xüsusiyyətlərindən biri kimi .göstərilmiş və bu çirkin əmələ qurşananları ilahi əzab gözlədiyini bildirmişdir

səh:۲۳۴

---

.İsra, ۳۲ [۴۸۰] -۱

.Təfsiri-nümunə”, c. ۱۲, səh. ۱۰۲“ [۴۸۱] -۲

.Furqan, ۶۸ [۴۸۲] -۳

Üçüncü mərhələ: Məkkənin fəthindən sonra qadınlar Peyğəmbərə (s) beyət etdikdə :sazişdə göstərilən bəndlərdən biri zina ilə bağlı idi. Quran bu haqda buyurur

Ya Peyğəmbər! Mö’min qadınlar Allaha heç bir şərik qoşmayacaqları, oğurluq və zina “ etməyəcəkləri, övladlarını öldürməyəcəkləri (qız uşaqlarını diri-diri torpağa gömməyəcəklərini), özgə kişilərdən olan uşaqlarını yalandan ərlərinə isnad etməyəcəkləri və heç bir yaxşı (bəyənilən) işdə sənin əleyhinə çıxmayacaqları barədə sənə bey’ət etmək üçün yanına gəldikləri zaman onların bey’ətini qəbul et və Allahdan (onların bağışlanmasını dilə. Həqiqətən, Allah bağışlayandır, rəhm edəndir!”(١)

:Dördüncü mərhələ: Allah-taala Nur surəsində buyurur

Zinakar kişiyə və zinakar qadına yüz çubuq vurun. Allaha və axirət gününə“ inanırsınızsa, Allahın dini barəsində (bu işin icrasında) ürəyiniz onlara yumşalmasın və mö’minlərdən bir dəstə də onların əzabına şahid olsun. (Bu, subay kişiyə və ərsiz qadına aiddir. Evli kişi və qadın zina etdikdə isə onların cəzası daşqalaq edilməkdir). Zinakar kişi ancaq zinakar, yaxud müşrik bir qadınla evlənə bilər. Zinakar qadın da yalnız zinakar, yaxud müşrik bir kişiyə ərə gedə bilər. Bu (belə bir evlənmə), (mö’minlərə haram edilmişdir”.(٢)

Bu, zinakarlara qarşı tutulan son mövqedir. Çünki Quran öncəki ayələrdə müsəlmanları son mərhələdə göstəriləcək ağır hökmü eşitmək üçün hazırladı. Bu Ayə



---

.Mumtəhinə, ١٢ [۴٨٣] -١

.Nur, ٢-٣[۴٨۴] -٢

.Mədinədə, İslam dövləti yarandıqdan sonra nazil olmuşdur

Qeyd: Quranın bu mərhələli mövqeyi tərbiyəvi baxımdan çox maraqlıdır və ictimai .məsələlərlə qarşılaşdıqda bu metoddan istifadə etmək məqsədəuyğundur

**QISA TARİX**

Qadınlarla qeyri-qanuni əlaqə bəşər tarixində və öncəki ilahi dinlərdə də mənfi hal kimi qiymətləndirilmişdir. Yəhudilikdə də bu əməl yasaq edilmişdir. Bugünkü Tövratda da .öz əksini tapmış "on göstəriş"dən biri zina etməklə bağlıdır

İncildə də zina çirkin əməl kimi qiymətləndirilmişdir. Hansı ki, İncildə talaqın qadağan .olmasına baxmayaraq, zina səbəbi ilə talaq verməyə icazə verilmir

**HÖKMLƏR**

.İslamda zina ilə bağlı çox ağır hökmlər var

.Zina etmək böyük günahlardandır .١

Zinakar üçün müəyyən cəza tədbirləri təyin edilmişdir. Misal üçün, məhrəmləri ilə .٢ zina edənin cəzası qətldir. Ailəli zinakarın cəzası daşqalaqdır. Subay zinakarın cəzası yüz qamçı zərbəsidir və s. Bu haqda ətraflı məlumat geniş izahlı fiqh kitablarında .verilmişdir

**ELMİ SİRLƏR**

Hər bir insanın qarşı cinslə qeyri-qanuni cinsi əlaqəsi, mənəvi, ictimai və gigiyenik fəsadlarla nəticələnir. Əhli-beytdən (ə) gələn rəvayətlərdə, təbabətlə bağlı elmi

Hər bir insanın qarşı cinslə qeyri-qanuni cinsi əlaqəsi, mənəvi, ictimai və gigiyenik fəsadlarla nəticələnir. Əhli-beytdən (ə) gələn rəvayətlərdə, təbabətlə bağlı elmi .əsərlərdə bu məsələlərə toxunulmuşdur. Aşağıda bunlardan bir neçəsinə nəzər salaq

.Rəvayətlər .١

Rəvayətlərdə zinakarın imanın hüdudlarından kənara çıxdığı bildirilir. Nümunə üçün .aşağıdakı hədisə nəzər salaq

Zinakar şəxs bu çirkin əmələ qurşandığı zaman mömin deyil. Oğurluq edən də eyni" katiqoriyaya aiddir. Çünki o, bu əməli həyata keçirdiyi zaman köynək əynindən çıxan .(kimi iman da ondan xaric olur (imanını itirir

.Mənəvi fəsadları .٢

İnsan öz həyat fəaliyyətini ağıl, düşüncə və din çərçivəsində proqramlaşdıran varlıqdır. Zina isə iki insanın qeyri-qanuni cinsi münasibətidir, hansı ki, bir çox hallarda kobud cinsi təcavüzlə müşayiət olunur. Fərd zina edərkən insanlıq hüdudlarını aşaraq heyvan şəklini alır. Buna görə də zina insanlığa sığmayan əməldir. Ehtimal ki, Quranın bu əməli .adlandırmasına səbəb də budur "فاحشه" və "ساء سبيلا"

.Zinanın ictimai fəsadları .٣

:Bəzi təfsirçilər zinanın yasaq olunmasının fəlsəfəsi haqqında yazırlar

Ailə qurluşunda hərc-mərclik yaranması, ata və övladlar arasında soyuq münasibət .١ .yaranması

.Bu rüsvayçı əməl fərdi və ictimai zəmində dava-dalaşa, düşmənçiliyə yol açır .٢

.(Təcrübə göstərir ki, bu əməl müxtəlif xəstəliklər törədir (elm də sübut etmişdir .٣

.Bu əməl adətən uşağın abort olunmasına və s. bais olur .۴

Ailə qurmaqda məqsəd yalnız cinsi tələbatın ödənilməsi deyil. Burada müştərək .۵ ,yaşam, ruhi təskinlik

övlad yetişdirmək və s. amillər də mövcuddur. Bütün bunlar yalnız sağlam, möhkəm .(ailə mühitində gerçəkləşir(۱

.Zöhrəvi xəstəliklərin yayılması .۴

?Zöhrəvi xəstəliklər hansılardır

Zöhrəvi xəstəliklər ən mühüm veneroloji xəstəliklər sayılan olduqca təhlükəli və .yolxucu xəstəliklərdir

:Zöhrəvi xəstəliklər dedikdə aşağıdakılar nəzərdə tutulur

(Sifilis (Syphilis .۱

(Süzənək (Gonorrhea .۲

(Yumşaq şankr (Chancroid .۳

(Qasıq limfoqranulmatozu (Donovania granulomatis .۴

:Bəzi həkimlər zöhrəvi xəstəliklərin yayılması haqqında yazırlar

."Zöhrəvi xəstəliklərin yayılmasının başlıca səbəbi təsadüfi yaxınlıqlardır"

:John Bisston bu haqda yazır

Araşdırmalar göstərir ki, əksər zöhrəvi xəstəliklər qanuni nikah xaricində baş verən" .(cinsi yaxınlıqlar vasitəsi ilə yoluxur"(۲



---

.Təfsiri-nümunə", c. ۱۲, səh. ۱۰۲" [۴۸۵] -۱

Son ۲۰ ildə Penisillin preparatının kəşf olunmasına və zöhrəvi xəstəliklərin [ ۴۸۶] -۲ azalmasına baxmayaraq, alimlər bəşəriyyətin qarşılaşdığı bu böyük təhlükəni hiss etdilər. Buna görə də ۱۹۶۴-cü ildə Amerikada ۵۰ ölkədən ۱۵۰۰ mütəxəssisin iştirakı ilə zöhrəvi xəstəliklər mövzusunda qlobal seminar keçirildi. Seminarda oxunan məqalələr ayrıca kitab şəkilində çap olundu. Seminarda təqdim olunan statistikaya görə ۱۹۵۰ -

۱۹۶۰-cı illərdə araşdırılan ۱۰۵ ölkədən ۷۱-də bu növ xəstəliklər artmışdır. Bu ölkələr arasında Avropa ölkələri çoxluq təşkil edir. Yəni ۲۰ Avropa ölkəsindən ۱۹-da zöhrəvi xəstəliklər artmışdır. Ən az artım müşahidə olunan isə Şərq ölkələridir. Burada ۱۲ ölkədən yalnız ۶-da artım qeydə alınmışdır.Həmin seminarda məlum oldu ki, ۱۹۵۷-ci ildə Amerikada siflisə yoluxanların sayı ۷۶۰۰ nəfər olmuşdur. Bu rəqəm ۱۹۶۱-ci ildə ۲۰۸۰۰-ə yüksəlmişdir. Yəni ۴ ildə ۳ dəfə artmışdır. Süzənək xəstəliyinə yoluxanların sayı yalnız Amerikada ildə ۱ mln. nəfərə çatır. Dünyada siflisə yoluxanların sayı isə ۱۹۵۳-cü ildə ۲۰ mln.–a çatırdı ("Quranda təbabət", səh. ۱۸۱-۱۸۲).

### .QİÇS(۱) xəstəliyinin yayılması .۵

QİÇS (Qazanılmış İmmun Çatışmazlığı Sindromu) əsasən cinsi əlaqə yolu ilə yayılan xəstəliklərdəndir. Bu xəstəlik son on ildə dünyada xüsusilə, Amerika və Avropada ciddi şəkildə yayılmışdır. Müsəlman ölkələrində isə çox yayılmamışdır. Ehtimal ki, bu .müsəlman ölkələrində təsadüfi cinsi əlaqələrin nisbi azlığının nəticəsidir

## İSLAMIN ZÖHRƏVİ XƏSTƏLİKLƏRİN QARŞISININ ALINMASINDA GÖSTƏRDİYİ DAHİYANƏ METOD

Nə üçün müsəlman ölkələrində (gigiyenik tədbirlərin nisbətən zəif olmasına baxmayaraq) zöhrəvi xəstəliklərə yoluxma halları az inkişaf etmiş ölkələrdə isə daha ?çoxdur

Bu sualın cavabını İslamın bu məsələyə münasibətində axtarmaq lazımdır. Quran zinanın müqəddimələrindən başlayaraq onları yasaq etmişdir. Sonra zinanı mərhələli .şəkildə (۴ mərhələdə) qadağan etmişdir

səh:۲۳۹

---

Qazanılmış İmmun Çatışmazlığı Sindromu (QİÇS, ing:Acquid Immune [ ۴۸۷] -۱ Deficiency Syndrom) İİV (İnsanda İmmun çatışmazlığı Virusu) infeksiyası fonunda inkişaf edən və CD۴+ limfositlərinin (leykosit növü) azalması ilə xarakterizə olunan, mahiyyəti etibarilə İİV infesksiyasının son mərhələsidir. QİÇS-in təzahür formaları özlərini çoxsaylı opportunistik yoluxucu və qeyri-yoluxucu xəstəliklərlə büruzə verir. Sadə şəkildə desək, bu virusa yoluxmuş insanların immun-müdafiə sistemi kəskin zəifləyir və onlar bir çox xəstəliklərə asanlıqla tutulurlar. Bu xəstəliklər ölümlə .nəticələnir

:Bəzi həkimlər bu haqda yazırlar

Bu təhlükəli xəstəliklərin kontrol olunmasına səbəb olan metod hansıdır? Axı bütün“ yollar təcrübədən keçirilmişdir. Onlar Penisillin preparatını sınaqdan keçirdilər; lakin uğursuzluqla qarşılaşdılar. Əxlaqsızlıq yuvalarını nəzarət altına aldılar; lakin bunun da faydası olmadı. Düzgün cinsi əlaqə mədəniyyətini təbliğ etdilər; lakin bu da yaralarını sağaltmadı. Bütün bu metodlar təcrübə olundu; lakin heç bir nəticə vermədi. İslamın .(göstərdiyi mübarizə üsulu isə sınaqdan uğurla keçməsinə baxmayaraq, unuduldu”(١

YEKUN

١. Təsadüfi, qeyri-qanuni cinsi əlaqənin yasaq olunması ilahi dinlərin bəşərə xidmətlərindən biridir. Bu hökmün elmi sirləri qədim dövrlərdə insanlara məlum .olmadığı üçün onu ilahi dinlərin elmi möcüzəsi hesab etmək olar

٢. Zina yəhudilikdə də qadağan olunduğu üçün bunu Qurana məxsus elmi möcüzə .hesab etmək olmaz

٣. Zinanın gigiyenik və ictimai fəsadları onun yasaq olunmasına spesifik səbəb ola bilər. .Çünki hələ bu hökmün bütün sirləri açılmamışdır

٤. Zöhrəvi xəstəliklərin yayılmasının müxtəlif səbəbləri var. Onlardan yalnız biri təsadüfi cinsi əlaqədir. Hər zinada xəstəlik axtarmaq doğru deyil. Bir çox hallarda gigiyenik tədbirlər nəticəsində təsadüfi cinsi əlaqə zamanı belə xəstəliklərin qarşısı .alınır

Deməli, zinanın yasaq olunmasının tam səbəbini göstərmək olmaz. Bu yalnız gigiyenik .səbəblərlə izah edilməməlidir



---

١- [۴٨٨] “Quranda təbabət”, səh. ١٨٨-١٩٠.

## LİVATIN YASAQ OLUNMASI

(۱)

Livat cinsi təmin olunmanın qeyri-adi üsulla yerinə yetirilməsidir. Bu, insan təbiətinə, instinktiv meylinə ziddir. Ilahi peyğəmbərlər (ə) bu çirkin adətə qarşı mübarizə aparmışlar. Quran bir neçə ayədə Lut peyğəmbərin (ə) qövmü haqqında söhbət açır və bu qeyri-adi cinsi təmin olunmanı pisləyərək qadağan edir.

Birinci:

“Doğrudanmı siz bəşər övladından yalnız erkəklərlə yaxınlıq edirsiniz? Və Rəbbinizin sizin üçün yaratdığı qadınlarınızı tərk edirsiniz? Siz (günah etməklə) həddi aşan bir camaatsınız!(۲)

İkinci:

Bir zaman o öz tayfasına demişdi: Sizdən əvvəl bəşər əhlindən heç kəsin etmədiyi həyasızlığı (kişilər arasında olan cinsi əlaqəni) sizmi edəcəksiniz? Siz qadınları atıb şəhvətlə kişilərin üstünə gəlirsiniz. Siz, doğrudan da, həddi aşmış bir tayfasınız!(۳)

Birinci ayədə bu əməlin rüsvayçı, çirkin əməl olmasını qeyd etməklə yanaşı, buna öncəki ümmətlərdə təsadüf edilmədiyini vurğulayır. Bu məlum əməlin çirkinliyini daha da artırır. Çünki bu gün əsası qoyulan pis adət sabah gələcək nəsillərə örnək olacaq(۴).

Üçüncü:



---

۱- [۴۸۹] İslama görə bütövlükdə homoseksualizm və eləcə də cinsiyyət pozğunluğunun digər növləri (sadizm, mazohizm, pedofiliya və s.) qəti şəkildə yasaqdır.

۲- [۴۹۰] Şüəra, ۱۶۵-۱۶۶.

۳- [۴۹۱] Əraf, ۸۰-۸۱.

۴- [۴۹۲] “Təfsiri-nümunə”, c. ۶, səh. ۲۴۲.

Lutu da (yad et)! Bir zaman o öz qövmünə demişdi: Doğrudanmı siz özünüzdən əvvəl aləmlərdən (bəşər əhlindən, ins və cindən) heç kəsin etmədiyi iyrənc bir işi (görürsünüz?(١)

:Dördüncü

Lutu da (peyğəmbər göndərdik). O zaman (Lut) öz tayfasına demişdi: Gözünüz görə-“ görə çirkin işləmi məşğul olursunuz? (Etdiyiniz əməlin qəbahətini, günahını başa düşə-düşə hələ də ona davam edirsiniz!) Siz qadınları qoyub şəhvətlə erkəklərin yanınamı (üstünəmi) gedirsiniz? Həqiqətən, siz cahil bir tayfasınız! (Lut) tayfasının cavabı yalnız: Lutun ailəsini yurdunuzdan qovub çıxardın. Çünki onlar (bizim gördüyümüz işlərdən) .(təmiz qalmaq istəyən insanlardır! - deməkləri olmuşdu”(٢)

.fahişə] qəbahətli olduğu aydın olan işlərə deyilir. Burada məqsəd livatdır] ”فاحشه“

:Beşinci

Elçilərimiz (mələklər) Lutun yanına gəldikləri zaman (tayfası bu gözəl qonaqlara bir pislik yetirər deyə) əndişəyə düşdü, ürəyi sıxıldı və: Bu, çox çətin (başabəlalı) bir gündür! - dedi. (Qonaq gəldiyini bilən) tayfası tələsik (Lutun) yanına gəldi. Onlar (Lutun yanına gəlməzdən və mələkləri görməzdən) əvvəl də pis işlər görürdülər. (Lut onlara) dedi: Ey qövmüm! Bunlar (balalarım və ya ümmətimin qadınları) mənim qızlarımdır (onlardan şəriətə müvafiq surətdə istifadə edin). Onlar (nikah baxımından) sizin üçün daha təmizdirlər. Allahdan



---

.Ənkəbut, ٢٨[٤٩٣] -١

.Nəml, ٥٤-٥٦ [٤٩٤] -٢

qorxun və (yaramaz əməllərinizlə) məni qonaqların yanında rüsvay etməyin. Məgər aranızda (sizə yaxşı işlər görməyi əmr edən, pis işləri yasaq edən) ağlı başında bir adam yoxdur? Onlar dedilər: Sənin qızlarına heç bir rəğbətimiz (və ya ehtiyacımız) olmadığını, şübhəsiz, bilirsən. Nə istədiyimizi də, yəqin ki, bilirsən!(۱)

Hədislərdə bu hadisə belə anılır. Həzrət Lut (ə) tarlada işlədiyi zaman yaraşıqlı gənclərin ona doğru gəldiklərini, qonağı olmaq istədiklərini gördü. O, bir tərəfdən qonaqpərvərlik hislərinin çağırışına səs vermək istəyir, digər tərəfdən də yaraşıqlı gənclərin cinsi pozğunluğa aludə olan şəhərə girməsinin hansı rüsvayçılıqlara səbəb ola biləcəyini düşünürdü.

Altıncı: Qəmər (۳۴) və Zariyat (۳۲-۳۷) surələrində də Lutun (ə) qövmünün məruz qalacağı əzabdan söhbət açılır.

## QISA TARİX

Qurana görə bu çirkin əməl ilk olaraq həzrət Lutun (ə) qövmü tərəfindən həyata keçirilmişdir. İslam bu cinsi pozğunluğa qarşı çıxmış və ona qurşananlara edam cəzası kəsmişdir.

İslamdan öncə Tövratda da Lutun (ə) qövmü haqqında ətraflı məlumat verilir.

O zamandan uzun əsrlər keçməsinə baxmayaraq, dünyanın bir çox ölkələrində cinsi pozğunluğun bu növü hələ də müşahidə olunmaqdadır. Bir çox Avropa ölkələrində isə seksual azlıqlar rəsmi fəaliyyət göstərirlər. Statistik məlumatlara görə təkcə İngiltərədə ۴۰ min uşaq bu yolla pul qazanır(۲).



---

۱- [۴۹۵] Hud, ۷۷-۷۹.
۲- [۴۹۶] "Quranda təbabət", səh. ۱۹۱-۱۹۲.

## HÖKMLƏR

.İslamda bu çirkin əməllə bağlı bir neçə hökm mövcuddur

.haram və böyük günahdır لواط .١

.Bu əməli həyata keçirən hər iki tərəf müəyyən şəraitdə edam olunmalıdır ٢

Fərd cinsi əlaqədə olduğu partnyorunun ana, nənə, bacı, qız və oğul nəvəsi ilə ailə .٣ .qura bilməz

## ELMİ SİRLƏR

Bu çirkin əməl insanın instinktiv meyllərinə ziddir. Onun mənəvi düşgünlüyünə, . ١ insanlıq hüdudlarından kənarlaşmasına yol açır. Quranda da bu məsələyə .toxunulmuşdur

.Livatın gigiyenik zərərləri .٢

Anal yaxınlıq, tərəf müqabilinin kişi və ya qadın olmasından asılı olmayaraq davamlı :olduqda xroniki hal alır. Bundan doğan fəsadlara aşağıdakıları misal göstərmək olar

.(.Bütün zöhrəvi xəstəliklər bu yolla yayılır (sifilis, süzənək, yumşaq şankr və s .١

Anus dəliyinin əzələlərinin funksiyası pozulur və ifrazat (ekskpement) kontroldan . ٢ .çıxır

Cinsi əlaqəyə məruz qalmış kişi psixi sarsıntı keçirir və kişi olmadığını təsəvvür edir. .٣ Bu, özünü onun davranışında göstərir və onda sadizm, mazohizm və s. psixi xəstəliklər .yaradır

Kişinin öz həyat yoldaşına meyl göstərməməsi nəticəsində nikah pozulması ilə . ۴ .müşayiət olunur

.Qadın və kişi arasında psixi gərginliklər yaranır .۵

.QİÇS xəstəliyinin yaranması və inkişafına yol açır .۶

YEKUN

.Burada bir neçə məqama nəzər salmaq zəruridir

Livatın psixi və gigiyenik fəsadlarına nəzərən yasaq olunması ilahi dinlərin . ١ .bəşəriyyətə xidmətlərindən biridir

Bu Quranın elmi möcüzəsi sayıla bilməz. Çünki Qurandan öncə Tövratda da bu . ٢ .məsələyə toxunulmuşdur

.Livatın gigiyenik fəsadları onun yasaq edilməsinin spesifik səbəbidir .٣

## ONANİZMİNYASAQ OLUNMASI

(١)

Onanizm (kəfləmə) orqazm yaratmaq məqsədi ilə erogen nahiyələrin (çox vaxt cinsi orqanların) süni qıcıqlandırılması prosesinə deyilir. Bu əməl İslamda haram və yasaq :olunmuşdur. Quranda bu haqda oxuyuruq

O kəslər ki, ayıb yerlərini (zinadan) qoruyub saxlayarlar; Ancaq zövcələri və cariyələri" istisna olmaqla. Onlar (zövcələri və cariyələri ilə görəcəkləri bu işdən ötrü) qınanmazlar. Bundan artığını isyəyənlər (halaldan harama addayaraq) həddi .(aşanlardır (Allahın əmrini pozanlardır)"(٢

Bu ayələr Quranda iki dəfə təkrar olunmuşdur. Nəql olunduğuna görə İmam Sadiqdən :(ə) bu əməl haqqında soruşulduqda həzrət (ə) buyurdu

Çox böyük günahdır. Bu işi görən özü ilə izdivac etmişə bənzəyir. Kimsənin bu işi" gördüyünü bilsəm onunla bir süfrə arxasında əyləşmərəm". Rəvayətçi soruşdu: Quranda bu haqda ayə varmı? Həzrət bu ayələri oxudu: "O kəslər ki, ayıb yerlərini ;(zinadan) qoruyub saxlayarlar



---

.İslama görə bütövlükdə masturbasiya qəti yasaq olunmuşdur [۴٩٧] -١

Ancaq zövcələri və cariyələri istisna olmaqla. Onlar (zövcələri və cariyələri ilə görəcəkləri bu işdən ötrü) qınanmazlar. Bundan artığını isyəyənlər (halaldan harama addayaraq) həddi aşanlardır (Allahın əmrini pozanlardır.”

Qeyd: Sözügedən ayə ümumi bir hökm açıqlayır. Yəni cinsi tələbatını qeyri-adi üsulla təmin edənləri təcavüzkar adlandırır. Diqqətinizə çatdırılan rəvayətdə isə İmam (ə) bu təcavüzkarlığın nümunələrindən biri haqda söhbət açmışdır. Başqa sözlə desək, ayədə konkret onanizm deyə qeyd vurulmamışdır.

### HÖKMLƏR

١. Onanizm haram olmaqla yanaşı böyük günahlardandır.

٢. Oruc olduğu halda süni qıcıqlanma yolu ilə orqazm yaranarsa oruc batil olar.

٣. Onanizmlə məşğul olduğu isbat olunan fərd hakim tərəfindən cəzalandırıla bilər.

### ELMİ SİRLƏR

Tibb elmləri üzrə mütəxəssis alimlər Onanizmin böyük fəsadlar törətdiyini bildirmişlər ki, aşağıda diqqətinizə çatdırırıq.

١. Psixi və etik fəsadları.

Bəzi yazıçılar onanizmin törətdiyi zərərlər haqqında yazırlar:

“İnsanın əxlaqı təsəvvür olunmaz dərəcədə mənfiyə doğru dəyişir. Paxıllıq (dargözlük), qəm-qüssə, malxülya

səbəbsiz ruh düşkünlüyü) və guşənişinlik cinsi pozğunluğun bu növünə qurşanmağın) acı nəticəsidir”(۱).

۲. İctimai fəsadları.

Bəzi alimlər “Cinsi zəiflik” kitabından sitat gətirərək yazırlar:

“Onanizm cinsi aktın qeyri-normal keçməsinə - cinsi zəifliyə (impontesiyaya) səbəb olur. Fərdi qorxaq, süst edir, cəsarətini əlindən alır. Bəzən cinsi yetginlik dövründə davamlı Onanizmlə məşğul olmaq fərdi narkotik maddələrin belə bacarmadığı şəkildə zəiflədir”(۲).

۳. Fiziki (cismani) ziyanları.

Doktor Hobin-in müşahidələri sübuta yetirmişdir ki, cinsiyyət orqanı ilə bağlı bütün xəstəliklər masturbasiya nəticəsində meydana gəlir. Bundan başqa gözün tor qişasında, eləcə də xovlu qişasında xəstəlik törədir. Bu iyrənc əməl davamlı olduqda üz öz rəngini itirir və solğun görünür. Çöhrədə tutqun hal yaranır. Göz yaşıl halqa ilə əhatə olunur. Bundan sonra müxtəlif üzvlərdə süstlük, əzginlik müşahidə olunur. Hafizə zəifləyir, iştah azalır, həzm çətinləşir, nəfəs təngiyir.

Cinsi pozğunluğun məlum növünün digər əlamətləri isə qan azlığı, baş gicəllənmə, arıqlama süstləşmə və s.-dır”(۳).

Alimlərdən biri yazır:

“Onanizm gənclik təravətini, yaraşığı azaldır. Davamlı olduqda isə impatensiya ilə nəticələnir. Saçlara dən salır, vaxtsız qocalığa yol açır. Orqazmın tezləşməsi onanizmin acı nəticələrindəndir(۴).



---

۱- [۴۹۹] “İslam, dərmansız həkim”, səh. ۶۳-۶۴.

۲- [۵۰۰] “Böyük günahlar”, c. ۲, səh.۳۱۲-۳۱۳.

۳- [۵۰۱] “İslam dərmansız həkim”, səh. ۶۳-۶۴.

YEKUN

.Bir neçə məqama aydınlıq gətirək

Onanizmin yasaq olunması dinin bəşəriyyətə, xüsusilə gənclərə xidmətlərindəndir. .١ Bəşər hələ onanizmin ziyanları haqqında hər hansı bir məlumata malik olmadığı bir dönəmdə İslam bu iyrənc əməli haram etdiyini elan etmişdir. Bu, həm də İslam .hökmlərinin müasir elmi nailiyyətlərlə üst-üstə düşdüyünün göstəricisidir

Quranda açıqca onanizmdən söhbət açılmamışdır. Öncə də qeyd etdiyimiz kimi, .٢ ayədə ümumi bir hökm (cinsi tələbatın qeyri-adi üsulla təmin olunmasının yasaq olunması) verilmişdir. Onanizm isə bu ümumi hökmün nümunələrindən biridir. Elə buna .görə də Quranın elmi möcüzəsi hesab oluna bilməz

Onanizmin törətdiyi ziyanlar məlum yasaq hökmünün tam səbəbi deyil. Ehtimal ki, ٣ .İslama görə bu yasaqın arxasında digər sirlər də mövcuddur

Qeyd olunan xəstəliklərin səbəblərindən yalnız biri onanizmdir. Çünki sözügedən .۴ .xəstəliklərin (qan çatışmazlığı və s.) digər törədici səbəbləri də var

## QURAN VƏ İNSANIN PSİXİ SAĞLAMLIĞI

Bir çox Quran ayələrinin ehtiva etdiyi ideoloji, etik göstərişlər insanın psixi təskinliyinə, ruhi tarazlığının qorunmasına müsbət təsir göstərir və nəticədə insanın psixi sağlamlığını təmin edir. Bu mövzuya üç cəhətdən yanaşmaq olar. Birincisi, Quranın özünü "şəfa" adlandırması. Ikincisi, Quranın tarixi baxımdan şəfavericiliyi (tarixi .faktlar). Üçüncüsü, tibb elmlərinin bu şəfavericiliyi təsdiq etməsi

.Quranın şəfavericiliyi ilə bağlı ayələr

.Bu məsələ ilə bağlı bir neçə ayəyə istinad edilmişdir

Biz Qur’andan mö’minlər üçün şəfa və mərhəmət olan ayələr nazil edirik. O,“ .١
.(zalımların (kafirlərin) ancaq ziyanını artırır”(١)

Ey insanlar!) Sizə Rəbbinizdən bir öyüd-nəsihət, ürəklərə bir şəfa, mö’minlərə)“ .٢
(hidayət və mərhəmət (Qur’an) gəlmişdir!”(٢)

.(De: O, iman gətirənlərə hidayətdir və şəfadır”(٣) .٣

şifa] sözü xəstəliklərə, eyb və nöqsanlara qarşılıq olaraq işlənir. Deməli, Quran] ”شفاء“ .١ rəhmət] sözü] ”رحمه“ .ilk növbədə insanı əxlaqi xəstəliklərdən, qüsurlardan sağaldır .əxlaqi sərvətlərlə zinətlənməyə, Quranın nəzarəti altında tərbiyə olunmağa işarədir

:Bəzi təfsirçilər “Quran necə şəfa verir?” sualına cavab olaraq yazırlar .٢

Şübhəsiz, əxlaqi xəstəliklər bir çox cəhətdən fiziki xəstəliklərə bənzəyir. Hər iki“ xəstəlik dağıdıcıdır, hər ikisinin təbibə, müalicəyə ehtiyacı var, hər ikisi bəzən yolxucudur. Çox maraqlı və mənalı bənzətmədir. Bəli, Quran cəhalətə, qürura, həsədə, nifaqa qarşı mübarizəyə qalxmaq istəyənlər üçün həyatverici nüsxədir. Quran dünyanın dörd bir yanında alovlanan müharibə odunu söndürə biləcək yeganə .”doktrinadır

.Bir çox hədislərdə Quranın şəfavericiliyi öz əksini tapmışdır .٣

?Nə üçün Quran zülümkarlara mənfi təsir göstərir .۴

Bu suala cavab olaraq bildirmək lazımdır ki, Quran saf, təmiz yağış suyunu xatırladır. Hansı ki, bağda lalə, şoranlıqda tikan bitirir. Quran vitamin dolu qida



---

١- [۵٠٣] .İsra, ٨٢
٢- [۵٠۴] .Yunus, ۵٧
٣- [۵٠۵] .Fussilət, ۴۴

məhsuluna bənzəyir. Alim daddıqda təlim-tərbiyə üçün güc alır. Zülümkar daddıqda isə daha da həddini aşır”[١].

## (QURANIN ŞƏFAVERİCİLİYİ TARİXİN GÖZÜ İLƏ (TARİXİ FAKTLAR

Quranın şəfavericiliyinin ən yaxşı göstəricisi cahiliyyət dövrü ərəblərinin İslam tərbiyəsi görmüşlərlə müqayisəsidir. İslam günəşi doğmazdan öncə Ərəbistan yarımadasında cəhalət hökm sürürdü. Müxtəlif ictimai, əxlaqi xəstəliklər baş alıb gedirdi. Lakin İslamdan sonra nəinki şəfa tapdılar, hətta dünyanın böyük qüdrətlərini (super güclərini) diz çökdürdülər[٢].

Quranın nazil olmasından ٢٠٠ il keçməmiş sivilizasiyalı cəmiyyət quruldu. Təfriqələr, qarətçiliklər ali hakimiyyətlə əvəz olundu. Kölə vəziyyətində yaşayan, diri ikən gömülən, ən adi hüquqlardan belə məhrum olan qadınlar xilas oldular. Belə ki, valideynlərindən qalan irsdən onlara da pay ayrılır, ictimai fəaliyyət göstərirdilər. Çox az sayda insanın yazıb-oxumaq bildiyi Ərəbistan yarımadası əsrlər boyu dünyanın elmi mərkəzinə çevrildi.

## QURANIN ŞƏFAVERİCİLİYİ VƏ TİBB ELMLƏRİ

Bir çox psixoloq və sosioloqlar Quran ayələrinin məzmununu incələmiş, onun insan psixikasına təsirindən söhbət açmış və bunu təcrübi elmlərlə isbat etmişlər. Bu tədqiqatçılar öz araşdırmalarını iki əsas xətt üzrə açıqlamışlar:



---

١- [٥٠۶] “Təfsiri-nümunə”, c. ١٢, səh. ٢٣٧-٢٣٨.

٢- [٥٠٧] “Təfsiri-nümunə”, c.١٢ , səh. ٢۴١.

;a)Quran oxumağın ağrıların, iztirab və solğunluğun azalmasında rolu

Bu yöndə çoxsaylı tədqiqatlar aparılmış və maraqlı nəticələr əldə olunmuşdur ki, .aşağıda diqqətinizə çatdırırıq

Əlirza Nikbəxt Nəsrabadi öz dissertasiyasını "Quran avazının qarın nahiyəsində .١ cərrahi müdaxilədən (operasiya) sonra baş verən ağrıların azalmasındakı rolu" mövzusuna həsr etmiş və sübuta yetirmişdir ki, Quran səsi qarın nahiyəsindən cərrahi müdaxilə üsulu ilə müalicə olunan xəstələrin operasiya sonrası ağrılarının azalmasında .böyük rol oynayır

Tehranda "İztirab testi" üsulu ilə aparılan tədqiqat göstərir ki, ۶۰ orta məktəb .٢ şagirdindən ۶ ayda minimum yarım saat Quran oxuyan qız uşaqlarında iztirab, .solğunluq, ruh düşgünlüyü, digərlərinə nisbətdə olduqca azdır

Digər statistik araşdırma isə davamlı Quran oxumağın stresin (gözlənilməz gərgin .٣ şəraitin törətdiyi emosional vəziyyət) aradan qaldırılmasında mühüm rol oynadığını aşkara çıxarmışdır. Əlbəttə, Quranın düşünülməsi də bu baxımdan böyük əhəmiyyət .daşıyır

.b)Quran təlimlərinin fərdi və ictimai psixikanın sağlamlığında rolu

Bir çox mütəxəssislər bu haqda araşdırmalar aparmış və Quran təlimlərinin (göstərişi və tövsiyələrinin) fərdi-ictimai psixikanın sağlamlığındakı rolunu incələmişlər. Burada .bu tədqiqatların nəticələrini diqqətinizə çatdırırıq

.Şəxsiyyətin səbatı və onun tövhidlə əlaqəsi .١

:Alimlərdən biri bu haqda yazır

İnsanın psixi sağlamlığı haqqında araşdırmalar göstərir ki, sağlam şəxsiyyətdə" başlıca rolu psixi bütövlük

tarazlıq) və dini öhdəçilik oynayır. Dəyərlər sisteminə sədaqət həyata məna verir.) Insan şəxsiyyətinə səbat bəxş etmək iqtidarında olan dəyərlər sistemi yalnız dindir. İslam dini tövhid, səbatlılıq, bütövlük, bölünməzlik üzərində qurulmuşdur. Tövhidin .(bariz nümunəsi və təzahürü müqəddəs yaradandır(١

Quranda optimizmin aşılanması, pessimizmə yasaq qoyulmasının insanın . ٢ .solğunluğunun azalmasında rolu

:Quranda oxuyuruq

Oğullarım! Gedin Yusifdən və qardaşından bir xəbər bilin. Allahın mərhəmətindən“ (ümidinizi kəsməyin. Allahın mərhəmətindən yalnız kafirlər ümidini üzər! (٢

Dini kitablar, xüsusilə Quran insana Allaha təvəkkül, Onun rəhmətindən naümid olmamaq aşılayır, ümidsizliyi, bədbinliyi pisləyir. Ümidsizlik İslamda ən böyük günahlardan hesab olunur. Buna görə də möminlər özlərini daim şən, gümrah hiss edir .və nikbin olurlar

:Alimlərdən biri bu haqda yazır

Araşdırmalar göstərir ki, dini etiqadı güclü olan, dini ayinləri icra edən xəstələr“ .(sağlamlıqlarına daha tez qovuşurlar”(٣

Quranın insanları səbrə(۴) dəvət etməsi və onun psixi gərginliklərin aradan . ٣ .qaldırılmasında rolu

Quranın insanları Allaha təvəkkül etməyə(۵) dəvət etməsi və bunun problemlərin . ۴ .həllində, ruhi təskinlikdə rolu



---

١- [۵٠٨] “Dinin psixi sağlamlıqda rolu” məqaləsindən.

٢- [۵٠٩] Yusuf, ٨٧

٣- [۵١٠] “Psixiatriya və kliniki psixologiya” jurnalından.

۴- [۵١١] Bəqərə, ١۵٣, ١۵۴; Ali-İmran, ٢٠٠.

۵. Allahı yad etməyin iztirab və gərginliyin aradan qaldırılmasındakı rolu(۱).

۶. Dində intiharın yasaq olunması və bunun müsəlman cəmiyyətlərində intihar sayının sıfra enməsində rolu.

Gartner və həmkarları tərəfindən aparılan çoxsaylı araşdırmalar dini etiqadla intihar arasında mənfi əlaqə olduğu aşkar edilmişdir.

Stock"nə üçün dindarlar intihar etmirlər?" sualına cavab olaraq müxtəlif dəlillər göstərir. Bu dəlillər sırasında izzəti-nəfs, əxlaqi məsuliyyət, Allahın rəhmətinə ümid və s. amillər böyük əhəmiyyət daşıyır(۲).

۷. Valideynlərə sevgi göstərmək və onun sağlam ailə mühitində təsiri.

۸. Hicab və qadınların psixi sağlamlığı.

۹. Axirətə inam və psixi sağlamlıq.

۱۰. Namazın ruhi təskinlikdə rolu.

۱۱. Ailə qurmaq və onun fərdi-ictimai təskinliyə təsiri və s.

YEKUN

Burada bir neçə məqama aydınlıq gətirmək faydalıdır.

۱. Quranın qeyd olunan şəfavericiliyi hələ nazil olduğu dönəmdə müşahidə olunur və ilahi kitab olduğunu isbatlayırdı. Psixoloji biliklər inkişaf etdikcə bu motivlər daha aydın olacaq.

۲. Unutmaq lazım deyil ki, Quranın göstərişlərinin hikməti psixi sağlamlığa göstərdiyi müsbət təsirlərlə



---

۱- [۵۱۳] Bəqərə, ۱۵۵.

۲- [۵۱۴] "Düşüncə və davranış" jurnalından.

bitmir. Burada digər (mənəvi) amillər də mövcuddur. Bir çox amillər isə hələ də aşkar .olunmamışdır

Quranın şəfavericiliyi, psixi sağlamlığa müsbət təsiri onun elmi ecazkarlığını sübuta .۳ .yetirmir. Çünki bu təsirlər iki cürdür

Birinci: Quranın ehtiva etdiyi dəyərlərin təsiri. Bu dəyərlər öncəki dinlərdə də mövcud .olmuşdur və buna görə də möcüzə ola bilməz

İkinci: Qeyd edilən təsirlər Quranın avazı ilə bağlıdır. Yəni Quran oxuyanın xüsusi avazı və ya Quranın özünə məxsus musiqisi xəstələrin müalicəsinə müsbət təsir göstərir və onların ağrılarını azaldır. Fikrimizcə bu Quranın əzəmətini göstərsə də onun ecazkarlığına sübut ola bilməz. Çünki bu növ müsbət təsirlər hər bir musiqidə müşahidə olunur. Lakin Quranın bu növ təsirinin (mənəviyyatla birgə olduğu üçün) daha çox olduğu iddia olunarsa, bunun ətraflı və dəqiq araşdırmalara ehtiyacı .olduğunu bildirərik

Quranın fərdi-ictimai psixikaya göstərdiyi müsbət təsirlərin aşkar olunması bizə .۴ Quranı daha yaxşı tanımaqda, psixi xəstələrin müalicəsində istifadə etməkdə kömək edir. Başqa sözlə desək, bu istiqamətdə aparılan tədqiqatlar mənəvi keyfiyyətləri təcrübi kəmiyyət olaraq insanların ixtiyarına verir və ilahi vəhydən istifadə etmək üçün yeni qapılar açır. Ümidvarıq ki, bu yeni başlanmış tədqiqatlar davam etdiriləcək, .insanlar mənəviyyata daha çox maraq göstərəcəklər

## İŞARƏ

;A) Quran və psixi xəstəliklərin müalicəsi

Öncə də qeyd etdiyimiz kimi Qurana görə xəstəliklər fiziki xəstəliklərlə bitmir. Bəzən insanın ruhu xəstə olur. Belə hallarda Quran mahir bir təbib kimi insanı xəstəlikdən .xilas edir. Allah Quranı şəfa olaraq təqdim edir

Biz Qur’andan mö’minlər üçün şəfa və mərhəmət olan ayələr nazil edirik. O,“ (zalımların (kafirlərin) ancaq ziyanını artırır”(١

.B) Quran və fiziki (cismani) xəstəliklərin müalicəsi

## BAL

Bal, (işçi) arıların bal verən bitkilərin çiçək nektarından hazırladığı və yem ehtiyacı kimi istifadə etdiyi şəkərli mayedir. Quranda bir çox qida məhsullarının adı çəkilmiş, lakin .şifa] sözü yalnız bala aid edilmişdir] ”شفاء“

Rəbbin bal arısına belə vəhy (təlqin) etdi: Dağlarda, ağaclarda və (insanların)“ qurduqları çardaqlarda (evlərin damında, üzümlüklərdə) özünə evlər tik (pətəklər sal). Sonra bütün meyvələrdən ye və Rəbbinin sənə göstərdiyi yolla rahat (asanlıqla) get! (Və ya: Rəbbinin yollarını itaətlə tut!) (O arıların) qarınlarından insanlar üçün şəfa



---

.İsra, ٨٢[۵١۵] -١

olan müxtəlif rəngli (ağ, sarı, qırmızı) bal çıxar. Şühəsiz ki, bunda düşünüb dərk edənlər (üçün bir ibrət vardır!"(١)

**QISA TARİX**

Bal qədim dövrlərdən başlayaraq diqqət mərkəzində olmuşdur. Ondan hələ Hipokrat dövründə qida məhsulu olmaqla yanaşı dəri xəstəliklərinin və yaraların sağaldılmasında antibakteriya kimi istifadə olunurdu. Tövratda da bal haqqında .söhbət açılmışdır

**ELMİ SİRLƏR**

Bir çox həkim və mütəxəssislər balın qiymətli qida məhsulu olmaqla yanaşı müalicəvi əhəmiyyətindən söhbət açmışlar. Burada bal haqqında aparılan ən əhatəli .tədqiqatlardan birini diqqətinizə çatdırırıq

dünya alimlərinin, xüsusilə Rusiya قرقوز Doktor Əbd əl-Həmid Diyab və doktor Əhməd və Amerika mütəxəssislərinin tədqiqatlarının nəticəsini aşağıdakı şəkildə toplayaraq :elmi ictimaiyyətin diqqətinə çatdırmışlar

.Birinci: Balın (kimyəvi) tərkibi

.Bal ٧٠ müxtəlif maddədən ibarətdir

Bal təbii şəkər maddələrinin ən mühüm qaynağıdır. İndiyə qədər balın tərkibində ١٥ .١ növ şəkər aşkar olunmuşdur (Araşdırmalar göstərir ki, balın tərkibində ٨٠٪-dən artıq karbohidrat, əsasən qlükoza və fruktoza; bundan başqa saxaroza, maltoza və s. .(mövcuddur

Balın tərkibində çoxsaylı vitaminlər (B, B٢, B٥, B٦, C, K, E, A vitaminləri) mövcuddur. .٢ Bu vitaminlər bal



---

.Nəhl, ٦٨-٦٩[٥١٦] -١

tərkibinin az miqdarını təşkil etməsinə baxmayaraq olduqca faydalıdır.

۳. Balın tərkibində müxtəlif zülallar, üzvi turşular (qlükon və s.), fermentlər (amilaza, katalaza, invertaza və s.) mövcuddur.

۴. Balın tərkibində fermentlər (enzimlər) olduğu üçün maddələr mübadiləsi və qidanın asanlıqla həzm olunmasına kömək edir.

۵. Balın tərkibində sodium, maqnezium, potasium, kalsium, natrium-xlor, fosfor, dəmir, kükürd və s. kimi aromatik və mineral maddələr də mövcuddur (٠/٠٠٢٪).

Bunlardan başqa balın tərkibində alkaloidlər və boyayıcı maddələr də mövcuddur.

۶. Bir çox tədqiqatçılara görə bal antibakterial və antienflamatuar xüsusiyyətlərə malikdir. Bundan başqa balın tərkibində bitki hormonları, eləcə də bir növ cinsiyyət hormonu (estrogen bölmələrindən) olduğu bildirilir. Qeyd etmək lazımdır ki, balın kimyəvi tərkibi bitkinin növünə və hava şəraitinə görə dəyişir.

İkinci: Balın antibakterial xüsusiyyəti. Alimlər bildirirlər ki, insan orqanizmində xəstəlik törədən mikroblar balın tərkibinə daxil olduqda funksiyalarını itirirlər.

Üçüncü: Bal və uşaq xəstəlikləri.Bal uşaq üçün həm əlverişli qida məhsulu, həm də onları xəstəlikdən qoruyan dəyərli dərmandır.

Dördüncü: Bal və xərçəng xəstəliklərinin profilaktikası.

Beşinci: Balın müalicəvi əhəmiyyəti. Balın müalicəvi əhəmiyyəti فيه شفاء للناس (Onda insanlar üçün şəfa var) ayəsindən aydın başa düşülür. Bu ilahi dərmanın bir çox xəstəliklərin, xüsusilə hələ elmin təsirli dərmanını tapa

bilmədiyi xəstəliklərin müalicəsində oynadığı məharətli rol insanı heyrətləndirməyə bilmir. Balı digər dərman və pereparatlardan ayıran onun müalicəvi funksiyası ilə yanaşı mənfi təsirinin olmamasıdır. Balın müalicəsində xeyirli olduğu xəstəlikləri .nəzərdən keçirək

Bal və dəri xəstəlikləri (dermatologiya). Hələ Hipokrat dönəmində dəri xəstəliklərinin .١ müalicəsində baldan istifadə olunurdu. Günümüzdə də həkimlər aparılan təcrübələr nəticəsində balın bu qəbildən olan xəstəliklərin müalicəsindəki əhəmiyyətini isbat .(etmişlər(١

Bal və həzm xəstəlikləri.Balın tərkibində mövcud olan çoxsaylı kimyəvi elementlər .٢ .(həzm xəstəliklərinə müsbət təsir göstərir(٢

Bal və tənəffüslə bağlı xəstəliklər. Bal tuprekulyoz (vərəm), qara öskürək, boğaz .٣ iltihabı, ağ ciyər iltihabı, astma (təngənəfəslik) və pnevmaniya (sətəlcəm) .xəstəliklərinin müalicəsində çox faydalıdır

Bal və göz xəstəlikləri. Hələ qədim dövrlərdən göz xəstəliklərinin müalicəsində .۴ .baldan istifadə edilərək müsbət nəticələr əldə olunmuşdur

.Balın qadın və doğuş xəstəliklərinin müalicəsindəki misilsiz rolu .۵

.Balın qulaq, boğaz və burun xəstəliklərinin müalicəsindəki bənzərsiz rolu .۶

.Balın ürək xəstəliklərinin müalicəsindəki rolu .٧

.Bal və böyrək xəstəlikləri .٨

.Bal və sinir sistemi .٩



---

Ətraflı məlumat üçün bax: Doktor Ədnan əş-Şərif, “Quran təbabətindən”, səh. [۵١٧] -١ .٢١٩

.Ətraflı məlumat üçün bax: “Quranda təbabət”, səh. ٢٠۵-٢٠۶ [۵١٨] -٢

Bal və qan çatışmazlığı. Bal eritrositləri (qırmızı qan kürəciyi) artırır və orqanizmdə K .١٠ .vitamini çatışmazlığını aradan qaldırır

Sonda qeyd etmək lazımdır ki, bu möcüzəli nemətdən müalicəvi istifadə həkim .nəzarəti ilə aparılmalıdır. Əks təqdirdə gözlənilən nəticə əldə olunmaya bilər

YEKUN

فيه شفاء للناس Balın müalicəvi əhəmiyyəti şübhəsizdir. Bu Quranda da öz əksini tapmışdır .١ .(Onda insanlar üçün şəfa var)

Hələ erkən təbabətdə balın müalicəvi əhəmiyyətinin dərk olunmasını, hətta . ٢ Tövratda da yad edilməsini nəzərə alsaq, bunun Quranın elmi möcüzəsi olmadığı anlaşılar. Quranda verilən bu ibarə (Onda insanlar üçün şəfa var) sadəcə bal haqqında .mövcud olan fikirlərin təsdiqidir

Balın kimyəvi tərkibi bitkinin növündən və hava şəraitindən asılıdır. Elə buna görə də .٣ qeyd olunan xüsusiyyətlər (balın mədə-bağırsaq, qaraciyər, öd yolu, böyrək, ürək-damar, sinir və s. xəstəliklərin müalicəsindəki rolu) hər balda olmaya bilər.

**ORUC**

Oruc, obaşdandan ilk axşam saatlarınadək qidalanmadan çəkinməyə deyilir. Bu əməl insan orqanizminə, eləcə də onun psixoloji durumuna olduqca müsbət təsirlər .göstərir. Quranda bu əməl haqqında bir neçə mərhələdə söhbət açılmışdır

.İlk mərhələdə oruc tutanlara böyük mükafat vəd edilir

Həqiqətən, Allah məhz müsəlman kişilər və qadınlar, mö’min kişilər və qadınlar,“ (Allaha) müt’i kişilər və qadınlar, doğru danışan kişilər və qadınlar, səbirli kişilər və qadınlar, təvazökar (yalnız Allah qarşısında kiçilən) kişilər və qadınlar, sədəqə verən, oruc tutan kişilər və qadınlar, ayıb (övrət) yerlərini (zinadan) qoruyub saxlayan kişilər və qadınlar və Allahı çox zikr edən kişilər və qadınlar üçün (axirətdə) məğfirət ((bağışlanma) və böyük bir mükafat (Cənnət) hazırlamışdır!”(١

.Növbəti mərhələdə oruc müsəlmanlara vacib edilmişdir

Ey iman gətirənlər! Oruc tutmaq sizdən əvvəlki ümmətlərə vacib edildiyi kimi, sizə də“ vacib edildi ki, (bunun vasitəsilə) siz pis əməllərdən çəkinəsiniz! (Oruc tutmaq) sayı müəyyən olan (bir ay) günlərdir. (Bu günlərdə) sizdən xəstə və ya səfərdə olanlar tutmadığı günlər qədər başqa günlərdə oruc tutmalıdırlar. Oruc tutmağa taqəti olmayanlar isə (hər günün əvəzində) bir yoxsulu doyuracaq qədər fidyə verməlidirlər. Hər kəs könüllü xeyir iş görərsə (həm oruc tutub, həm də fidyə verərsə), bu onun üçün daha yaxşı olar. Bilsəniz oruc tutmaq sizin üçün nə qədər xeyirlidir! İnsanlara doğru yolu göstərən, bu yolu açıq dəlilləri ilə aydınlaşdıran və (haqqı batildən) ayıran (Qur’an) ramazan ayında nazil edilmişdir. Aya (ramazan ayına) yetişən şəxslər (bu ayı) oruc tutmalıdırlar; xəstə və ya səfərdə olanlar isə tutmadığı günlərin sayı qədər başqa günlərdə tutsunlar. Allah sizin üçün ağırlıq deyil, yüngüllük istər ki, fövtə gedən günlərin orucunu tamamlayasınız və sizi düz yola



---

.Əhzab, ٣۵ [۵١٩] -١

.(yönəltməsinə görə Ona (Allahu əkbər deməklə) tə’zim və şükür edəsiniz”(١

**QISA TARİX**

Oruc İslama qədərki dinlərdə müəyyən şəkildə (sükut orucu və s.) mövcud olmuşdur. Quran orucun tarixi haqqında iki ayədə söhbət açır. İlk dəfə orucu vacib edərkən :buyurur

Ey iman gətirənlər! Oruc tutmaq sizdən əvvəlki ümmətlərə vacib edildiyi kimi, sizə də“ (vacib edildi ki, (bunun vasitəsilə) siz pis əməllərdən çəkinəsiniz!”(٢

:Digər bir ayədə isə həzrət Məryəmin (ə) orucuna işarə vuraraq buyurur

Əgər (səndən bu uşaq barəsində soruşan) bir adam görəcək olsan, belə de: Mən Rəhman yolunda oruc (sükut orucu) tutmağı nəzir eləmişəm, ona görə də bu gün heç (kəslə danışmayacağam!(٣

Müqəddəs kitabda da yəhudi və xristianlara oruc tutmaq tövsiyə olunur və həzrət Musanın, eləcə də İsanın (ə) oruc tutması yad edilir. “Musa (ə), İliya və İsanın (ə) qırx gün oruc tutması möcüzəli şəkildə olmuşdur”(٤).Həzrət İsa (ə) şagirdlərinə onun vəfatından sonra oruc tutmalarını tapşırardı(٥). O həzrətin həvariləri lazım gəldikdə .(oruc tutardılar. Lakin bu onlara vacib olunmamışdı(۶



---

.Bəqərə, ١٨٣-١٨٥ [٥٢٠] -١

.Bəqərə, ١٨٣ [٥٢١] -٢

Məryəm, ٢۶. Həzrət Məryəm sükut orucu tutmuşdu. Ayədən anlaşılır ki, orucun [٥٢٢] -٣ bu növü dövrün cəmiyyəti tərəfindən qəbul edilirmiş. İslamda isə bu növ oruc yoxdur .((“Təfsiri-nümunə”, c. ١٣, səh. ۴۵

.Samuil, ٧/۶; Hakimlər, ١٩/٨ [٥٢٣] -۴

.Luka, ٥/٣۴, ٣٥[٥٢۴] -٥

.Matfey, ۶/١۶, ١٨ [٥٢٥] -۶

Orucun elmi sirləri, bəzi xəstəliklərin profilaktika və müalicəsindəki rolu haqqında bir çox həkimlər, elm adamları fikir söyləmiş, əsər yazmışlar. Əhli-beytdən gələn .rəvayətlərdə də bu haqda söhbət açılmışdır ki, aşağıda diqqətinizə çatdırırıq

.Rəvayətlər .١

Bir çox hədislərdə orucun faydaları, xüsusilə mənəvi faydası haqqında söhbət .açılmışdır. Burada bir hədisi qeyd etməklə kifayətlənirik

.(Oruc tutun ki, sağlam olasınız”(١“ صوموا تصحوا :Peyğəmbər (s) buyurmuşdur

.Oruc insanın iradəsini gücləndirir .٢

:Bəzi həkimlər bu haqda yazırlar

Oruc cismani faydaları ilə yanaşı insanın ruhuna, psixikasına da müsbət təsir göstərir.“ Belə ki, onda emosionallıq, xeyirxahlıq, təmkin müşahidə olunur. Oruc tutan .(transsendental ruha, fövqəladə zəkaya malik olduğunu hiss edir”(٢

Bundan başqa oruc insana cinsi meyllərini cilovlamaqda da böyük dayaqdır. O, günahdan çəkinməyin ən uğurlu metodlarından biridir. Peyğəmbər (s) ailə qurmaqdan :boyun qaçıran gənclərə müraciətlə buyurur

Ey gənclər! Ev tədarükü olanlarınız ailə qursun. Buna gücü çatmayanlar isə oruc“ .”tutsun. Oruc onun üçün günahlara qarşı sipərdir

.Orucun xəstəliklərə müsbət təsiri .٣

:Bəzi həkimlər yazırlar



---

.Bihar əl-ənvar”, c. ٩۶, səh. ٢۵۵“ [۵٢۶] -١

.Quranda təbabət”, səh. ٢١٣“ [۵٢٧] -٢

Günümüzdə artıq orucun bir çox xəstəliklərə müsbət təsiri sübuta yetirilmişdir. Bu“ :xəstəliklərə aşağıdakıları misal göstərmək olar

Həzm sistemi ilə bağlı xəstəliklər. Xüsusilə kəskin mədə iltihabı, piylənmə, ateroskleroz, qan təzyiqi, inaq, xroniki böyrək iltihabı, astma, etik və psixi anomaliya .(və s(١

.Orucun profilaktik faydaları .۴

:Bəzi həkimlər yazırlar

Oruc insan yaşamının müxtəlif tərəflərini nizamlayan dövri ayindir. Burada insan ildə“ bir dəfə bu ayinə əməl etməyi zəruri hesab edir və bu onun ruhunda, orqanizmində .dərin iz buraxır

Oruc pəhriz rejimi, müalicə üsuludur. Çox güman ki, ondan ən çox yararlanan həzm sistemidir. Çünki qidalanma prossi qidanı udmaqla bitmir. Əslində bu qidalanmada ilkin mərhələdir. Qida udulduqda bütün orqanizm onu ən yaxşı şəkildə həzm etmək, sovurmaq üçün fəaliyyətə keçir. Buna görə də orqanizmdə ən işlək sistem həzm sistemidir. Digər orqanların istirahəti zəruri olduğu kimi həzm sistemi üçün də istirahət həyati əhəmiyyət daşıyır. Bu istirahətin bir ay sabit pəhriz rejimi çərçivəsində baş .verməsi bir çox müsbət nəticələr verir. Bunlar aşağıdakılardır

Orqanizmdə yığılıb qalmış artıq piylərin əriməsi (əks təqdirdə piylənmə xəstəliyi .(törədir

.Orqanizmdə mövcud olan zəhərli artıq maddələrin aradan getməsi

Orqanizmdə mövcud hüceyrə və vəzilərə funksiyalarını ən yaxşı şəkildə həyata .keçirmə fürsəti verir

.Böyrək və sidik kisəsinin nisbi istirahəti



---

.Quranda təbabət”, səh. ۲۱۴“ [۵۲۸] -۱

.Arteriyalarda piy yığıntılarının azalması və aterosklerozun profilaktikası

Aclıq oruc müddəti bitdikdən sonra orqanizmin reaksiyasına səbəb olur. Bu reaksiya özünü qidalanmaya meyl, gümrahlıq, aktivlik şəklində göstərir. Halbuki bundan öncə qidalanma yorucu vəziyyət almışdı. Oruc şəriətdə göstərildiyi qaydada həyata keçirilsə, ən yaxşı müalicə metoduna çevrilər. Hansı ki, bu gün Avropa alimləri müəyyən şəraitdə ac qalmağı müalicə üsulu kimi dəyərləndirirlər. Avstraliyalı həkim :Barselius yazır

Aclığın müalicəvi funksiyası pereparatlardan istifadəni üstələyir”. Helba adlı digər“ həkim isə ona müraciət edən xəstələri bir neçə gün ac saxlayar, sonra yüngül qida .”məhsullarından istifadə etməyə icazə verərdi

Oruc funksiyasını itirmiş toxumalara yeni həyat bəxş edir. Elə buna görə də doktor .Bachwitn “Oruc gəncliyi geri qaytara bilər” deyə bildirir

YEKUN

.Bir neçə məqama nəzər salaq

Orucluq ayini və orucun vacib edilməsi peyğəmbərlərin (ə) bəşərə təqdim etdiyi ilahi .١ .hədiyyədir

Orucun müalicəvi və profilaktik əhəmiyyəti tam aydındır. Bu elmi məslədir və ilahi dinlərdə də mövcud olmuşdur. O dönəmdə insanların orucun elmi hikmətini bilmədikləri halda icbari şəkildə tutmalarını nəzərə alsaq, bunun ilahi dinlərin elmi möcüzəsi hesab etmək olar. Əlbəttə, belə bir ehtimal da mövcuddur ki, qidalanma ilə bağlı pəhriz rejimi daim müalicəvi üsul kimi həyata keçirilmişdir. Oruc isə bu tibbi metodun təsdiqi kimi göstərilmişdir. Lakin bu ehtimal yanlışdır. Çünki ilahi dinlərə görə oruc sağlam insanlara vacibdir. Xəstələr isə

.bu hökmdən istisnadır. Halbuki pəhriz rejimi tibdə xəstələrə tətbiq olunur

Oruc Qurana məxsus elmi möcüzə deyil. Çünki qeyd etdiyimiz kimi İslamdan öncə də .۲ .mövcud olmuşdur

Orucun adı çəkilən bir çox xəstəliklərə müsbət təsiri həkim nəzarətindən asılıdır. Ola .۳ bilər ki, oruc həkim məsləhətlərinə görə bir çoxlarına ziyan olsun. Belə olduqda oruc haramdır. Deməli, orucun qeyd olunan xəstəliklərə müsbət təsiri yalnız bəzi hallarda .özünü göstərir

səh:۲۶۵

## ÜÇÜNCÜ HİSSƏ: QURAN VƏ İNSANIN YARADILIŞININ SİRLƏRİ

### GİRİŞ

Quran nazil olduğu dönəmdə tibb elmi ilkin addımlarını atırdı. Həkimlər orqanizmin daxili orqanlarından, onların funksiyalarından xəbərsiz idilər. Yunan və İran təbabətinin elmi dairələrə hakim olmasına baxmayaraq, hələ lazımi inkişaf yolunu keçməmişdi. İnsanın bütünlükdə orqanizmini, habelə onu təşkil edən ayrı-ayrı sistem və orqanların forması və quruluşu haqqında biliklər son yüz ildə ciddi şəkildə inkişaf etmiş və anatomiyanın müstəqil antropotomiya bölməsi (insan anatomiyası) .yaradılmışdır

Cahiliyyə dönəmində, ərəb cəmiyyətinin tibb haqqında heç bir anlayışı olmadığı bir halda Quran insan orqanizminin yaradılışına üstüörtülü işarələr vurmuşdur. Bu .ayələrdən bir neçəsinə nəzər salaq

### İNSANIN YARADILIŞ MƏRHƏLƏLƏRİ QURANIN ELMİ MÖCÜZƏSİ KİMİ

Quranda insanın yaradılışı və bu yaradılışın hansı mərhələlərdən keçdiyi haqqında bir çox ayələr mövcuddur. Bu ayələrin hidayət məqsədi daşıması ilə yanaşı elmi məsələlərə də toxunması tibb mütəxəssislərinin təəccübünə səbəb olmuşdur. Belə ki, onların nəinki elmi möcüzə, hətta bədii sintaksisin ecazkar nümunəsi hesab .(etmişlər(١

səh:٢۶۶

---

١- [۵٢٩] “Quranda təbabət”, səh. ٨۴.

Quran ayələrinə əsasən insanın yaradılışının mərhələlərini başlanğıcdan dünyaya gələnədək (və dünyadan köçənədək) aşağıdakı şəkildə sıralamaq olar.

١. Torpaq mərhələsi (تراب، طين).

٢. Su mərhələsi (ماء، ماء دافق، ماء مهين).

٣. Nütfə mərhələsi (نطفه من منى).

۴. Qarışıq nütfə mərhələsi (نطفه أمشاج).

۵. Laxtalanmış qan mərhələsi (علقه).

۶. Bir parça ət mərhələsi (مضغه).

٧. Şəkilə salma, formalaşdırma mərhələsi (تسويه، تصوير).

٨. Sümüklərin formalaşması mərhələsi (عظاما).

٩. Sümüklərin ətlə örtülməsi mərhələsi (فكسونا العظام لحما).

١٠. Cinsiyyətin təyin olunma mərhələsi (مذكر و مؤنث).

١١. Ruh verilməsi mərhələsi (خلقـا آخر). Qulaq və gözün yaranması haqqında da bəzi məsələlərə toxunulmuşdur.

١٢. Uşağın dünyaya gəlməsi (نخرجكم طفلا).

١٣. Həddi-büluğ (yetkinlik) dövrü.

١۴. Yaşlılıq dövrü.

١۵. Həyatın sonu (ölüm).

Qeyd etmək lazımdır ki, bəzi həkimlər Quran ayələrini başqa şəkildə sıralamış və Qurana görə yaradılışın yeddi mərhələsi olduğunu bildirmişlər(١).

Doktor Maurice Bucaille yazır:

Quranın bu halda buyurduqlarını nəzərdən keçirdikdə görürük ki, elm bu (elmi)“ məsələləri yalnız XIX əsrdə kəşf edə bilmişdir. Quran nazil olduğu dönəmdə isə .insanlar bu növ elmi məsələlərdən uzaq idilər

YEKUN



---

.Təfsiri-nümunə”, c. ۲۰, səh. ۱۶۵; c. ۱۴, səh. ۲۳“ [۵۳۰] -۱

Biz insanın yaradılış prosesini ۱۴ mərhələyə böldük. Təcrübi elmlərin də təsdiq etdiyi bu ۱۵ mərhələnin hər biri ayrı-ayrılıqda Quranın əzəmətinin göstəricisidir. Lakin onların .heç biri təklikdə Quranın elmi möcüzəsinə sübut ola bilməz

Burada belə bir sualla qarşılaşırıq. Qeyd olunan ۱۵ mərhələ bütövlükdə Quranın ELMİ ?möcüzəsi ola bilərmi

Fikrimizcə, Quranın qeyd olunan mərhələli yaradılışla bağlı ayələri (xüsusilə Həcc, ۱۲; Muminun, ۱۲-۱۴; Ğafir, ۷۶) nazil olduğu dönəmdə insanlar onun bənzərini gətirməkdə aciz idilər. Deməli, məlum ayələri bütövlükdə Quranın elmi möcüzəsi hesab etmək .olar

## Haqqında mərkəzi

Allahın adı ilə

Rəhman və Rəhimli olan Allahın adı ilə.Və bütün həmdlər aləmlərin rəbbi olan Allaha .məxsusdur

.Varlıq aləminin Kövsəri olan Həzrəti Fatiməyi Zəhraya (a) təqdim olunur

(Bilən kimsələrlə (alimlər) bilməyənlər (cahillər) eynidirlərmi? (Zümər surəsi, ayə ۹

:Ön söz

İsfahan Qaimiyyə kompüter araşdırmalar müəssisəsi ۲۰۰۶-cı ildən Mərhum Ayətullah Seyyid Həsən Fəqih İmaminin nəzarəti altında,elmi mərkəzlərdə tanınan görkəmli tələbələrin vasitəsi ilə məzhəb,mədəniyyət və elmi sahələrdə öz fəaliyyətinə .başlamışdır

:Məramnamə

İsfahan Qaimiyyə kompüter araşdırmalar müəssisəsi təhqiqatçıların dini biliklərə rahət və tez bir zamanda yiyələnmələri üçün hər bir xidməti onların ixtiyarında qərar vermişdir.Və bu sahədə təəssübkeşlikdən,ictimai,siyasi,fərdi cəryanlardan uzaq duraraq yalnız və yalnız elmi sahədə ixlasla öz xidmətini həyata keçirməkdədir.Bu səbəbdən adı çəkilən müəssisə layihəsini həyata keçirmiş.Və tədqiqat üçün nəzərdə tutulmuş kitabları,məqalələri mütəxəssislər və müxtəlif təbəqələrdən olan insanlar üçün,bir neçə dillərdə və formalarda hazırlayaraq,heç bir məbləğ tələb etmədən sosial .medyada istifadəçilərin ixtiyarında qoymuşdur

:Hədəflər

Quran və Əhli beyt mədəniyyətini və maarifini yaymaq.۱

İnsanları,xüsusən gəncləri tam dəqiq şəkildə dini məsələləri araşdırmağa.۲ sövqləndirmək

Telefon,tablet və kompüterlərdə olan faydasız,yararsız mövzuların yerini .۳ faydalı,mənəviyyatlı mövzularla doldurmaq

.Təhqiqatla məşğul olan tələbələrə xidmət etmək.۴

.Kitab və elmi əsərlər oxumaq mədəniyyətini yaymaq.۵

.Müəlliflərin öz elmi əsərlərini digital formada yaymaq üçün onlara şərait yaratmaq.۶

:İcraçılıq

.Qanunla icazəli olan lisenziyaya malik əsərlərin yayımı.۱

.Bu mərkəz kimi xidmət göstərən oxşar mərkəzlərlə əlaqə.۲

.(Paralel xidmətlərdən çəkinmək (başqalarının etdiklərini təkrarlamamaq.۳

.Yalnız və yalnız elmi məsələləri yaymaq.۴

.Nəşriyyatın mənbələrini qeyd etmək.۵

.Qeyd:Kitabda olanlara görə məsüliyyət o kitabı yazan müəllifin öhdəsindədir

:Müəssisənin fəaliyyəti

.Kitabların çapı və nəşri.۱

.Kitab oxumaq müsabiqələrinin təşkili.۲

.Məcazi sərgilərin istehsalı.۳

.Kompüter oyunlarının istehsalı.۴

Qaimiyyə internet saytının yaradılması:www.ghaemiyeh.com.۵

.Sərgi məhsullarının və moizələrin istehsalı.۶

.Şər'i,əxlaqi və etiqadi suallara cavab.۷

.Mühasibat,mətbuat yaratmaq və sms... sistemlərinin layihəsi.۸

.Təlim kurslarının həyata keçirilməsi.۹

Tərbiyəçi şəxslər hazırlamaq üçün təlim kurslarının təşkili.۱۰

Kompüterdə,tabletdə və telefonlarda icrası mümkün olan minlərlə proqramların.۱۱ dünyada məşhur olan səkkiz formada istehsalı

JAVA.۱

ANDROID.۲

EPUB.۳

CHM.۴

PDF.۵

HTML.۶

CHM.۷

GHB.۸

.v.Qaimiyyə kitab bazarı adına dörd market

ANDROID.۱

IOS.۲

WINDOWS PHONE.۳

WINDOWS.۴

deyilənlər müəssisənin veb saytında Fars,Ərəb,İngilis və Azərbaycan dillərində pulsuz

.istifadəyə verilmişdir

:Sonunda

Mərcəi təqlid müctəhidlərin dəftərxanalarından (ofis),müəssisələrdən,nəşriyyatçılardan,müəlliflərdən və əməyi olan bütün şəxsiyyətlərdən bizlərə hədəfə çatmaqdan ötrü yardım etdikləri üçün səmimi qəlbdən .təşəkkür edirik


:Mərkəzin ünvanı

İsfahan-Əbdurrəzzaq küçəsi-Hacı Muhəmməd Cəfər adına bazar-Şəhid Muhəmməd Həsən Təvəkküli küçəsi-blok۱۲۹/۳۴-birinci mərtəbə

veb sayt:www.ghbook.ir

mail:Info@ghbook.ir

mərkəzin ofis telefonu: ۰۰۹۸۳۱۳۴۴۹۰۱۲۵

Tehran ofisi: ۰۰۹۸۲۱۸۸۳۱۸۷۲۲

Biznes və alqı satqı: ۰۰۹۸۹۱۳۲۰۰۰۱۰۹

Mərkəzdə çalışan insanlarla əlaqə yaratmaq üçün nəzərdə tutulan nömrə: ۰۰۹۸۹۱۳۲۰۰۰۱۰۹